# ?ƏLİ (Ə) KİMDİR

:Müəllif

Fəzlullah Kompani

:Çap nəşriyyat

Şəhriyar

:Digital nəşriyyat

İsfəhan Qaimiyyə adına komputer araşdırmalar mərkəzi

# Mündəricat

# ?ƏLİ (Ə) KİMDİR

## KİTAB HAQQINDA

RƏHMAN VƏ RƏHİM ALLAHIN ADI İLƏ

?Kitabın adı:Əli əleyihissalam kimdir

Müəllif:Fəzlullah Kompani

Tərcümə edən: Məhəmməd Turan

Naşir:Şəhriyar

Çap tarixi:۲۰۰۷

Səhifələrin sayı:۲۰۴

Çap növbəsi:Birinci

Tirajı:۳۰۰۰

səh:۱

## RƏhMAN VƏ RƏhIM ALLAhIN ADI ILƏ

,Ey müqəddəs, sə’yimi ram elə, düşsün yoluna

.Yol uzun, yolçu naşı, baxsana aşiq halına

## MÜQƏDDİMƏ

Həmd-səna yaranışın ölçülü vücuduna varlıq libası geyindirmiş və əbədi qüdrət .təcəllalarını təbiət əsərlərində nümayiş etdirmiş Allaha layiqdir

Uca pərvazlı xəyal quşu Onun sonsuz qüdrət fəzasında uçmaqda acizdir. İti ağıl və düşüncə köhləni Onun əbədiyyət biyabanında çapmaqda geri qalır. O, səmavi şərit bələdçilərini yaranmışların təkamülü üçün parlaq çıraq qərar verdi, insan .cəmiyyətlərinin nizamını onun hökm və qanunlarına itaətdə müəyyənləşdirdi

Bəşər aləminin tərbiyəçiləri, tövhid və həqiqət yolunun bələdçiləri olmuş peyğəmbərlik .və vilayət ailəsi saysız salama layiqdir

Bu kitabın əziz oxucuların qarşısında açılan səhifələrində elə bir şəxsiyyətin haqqında danışılır ki, heç şübhəsiz, bu vaxtadək bir belə fəzilətə sahib olan insan haqqında bir yerdə yazılmamışdır. Hələ ki yaradıcılıq və ixtira fırçası belə bir əlvan və cazibədar .təsvir nəqş etməmişdir

(İmamiyyə şiələrinin birinci imamı həzrət Əmirəl-mö’minin Əli ibn Əbitalib (ə

haqqında çoxsaylı kitablar yazılıb, yetərli araşdırmalar aparılmışsa da, əlinizdəki kitabda mövzular daha sadə şəkildə tərtib olunmuşdur. Kitab həzrəti tanıtdırmaq .məqsədi ilə yazılmış və mətnlərdə aşağıdakı məsələlər nəzərdən keçirilmişdir

Kitabda sadə, rəvan, eyni zamanda səlis ifadələrdən istifadə olunmuş, çətin anlaşılan .terminlərə yer verilməmişdir

Kitabdakı mövzulara təəssüb və qərəzsiz yanaşılmışdır. Müasir elmdə qəbul .olunmayan əsassız bəyanlar və zəif xəbərlərdən pəhriz olunmuşdur

Həzrət Əlinin (ə) xilafətinin sübutunda təəssüb göstərilməmiş, şiə kitablarına, demək olar ki, müraciət olunmamışdır. İstənilən bir bəhanənin qarşısını almaq üçün sünnə .əhlinin mö'təbər kitablarına istinad edilmişdir

Həzrət Əlinin (ə) imaməti ilə bağlı ayə və hədislərin zikrindən əlavə, digər kitablarda bir .o qədər də diqqət yetirilməyən əqli və üsuli iki dəlil göstərilmişdir

Şiə əqidəsinin sübutu üçün zəruri sayılan məsələlər ümumi mö'təbər kitablardan .götürülmüş, kitabın haşiyələrində mənbələr göstərilmişdir

Yuxarıdakı nöqtələri nəzərə almaqla, Allahın lütfünə ümid edib, müttəqilər mövlası :Əlinin (ə) ruhundan yardım diləməklə kitabdakı mövzuları belə tənzimləmişik

;Peyğəmbər zamanında həzrətin həyatı

;Həzrətin Peyğəmbərdən sonrakı həyatı

;Həzrət Əlinin (ə) xilafət dövrü

;Həzrət Əlinin (ə) şəxsiyyəti və əxlaqi fəzilətləri

;Həzrət Əlinin (ə) Peyğəmbərdən sonra dərhal xilafətə çatma haqqının sübutu

;Həzrət Əlinin (ə) səhabələri və övladları

.Həzrət Əlinin (ə) buyuruqları

Qeyd etməliyik ki, bu kitab ilk dəfə şəmsi ۱۳۳۷-ci ildə çap olunmuşdur. Günbəgün artan diqqət və oxucular tərəfindən maraqla qarşılanması səbəbindən bu kitab bu günədək doqquz dəfə nəşr olunmuşdur. Təkrar çap səbəbindən bə’zi hərflər və sözlər yaxşı oxunmadığından və hərflərin yenidən yığılmasına ehtiyac olduğundan müəllif aradakı vaxtı fürsət sayaraq kitabda bə’zi dəyişikliklər etmiş, mö’təbər mənbələrə müraciət edərək, bə’zi dəyərli

mə’lumatları artırmış və ifadələri daha da sadələşdirmişdir. Belə ki, kitab onuncu dəfə çapa gedərkən onda həm kəmiyyət, həm də keyfiyyət dəyişiklikləri edilmişdir. Nəticədə kitab bir qədər də cazibədar olmuş, vilayət şahının iftixarlı həyatı və ali şəxsiyyəti ilə tanışlıq daha da asanlaşmışdır. Beləcə, əsl mövzular qorunmaqla kitaba əl gəzdirilmiş və o hazırkı şəkildə zövq və bəsirət sahiblərinin ixtiyarına təqdim olunmuşdur. Olsun ki, yaranış aləminin əntiq əsərlərindən olan Həzrətlə tanışlıq istiqamətində irəliyə doğru qədəm götürülə. Əlbəttə ki, həzrət Əlini (ə) onu yaradandan başqa kimsə kamil şəkildə tanıya bilməz. Həzrət Peğyəmbər (s) həzrət Əliyə (ə) buyurur: «Səni Allahdan və məndən başqa kimsə yetərincə tanımadı». Ümid edirik ki, bu kitabın mütaliəsi oxucular üçün faydalı olacaq. Bu ali məqsədin öhdəsindən .kamil şəkildə gələ bilməsək də, ümid edirik ki, dəryadan bir damla götürmüş olaq

,Çəkə bilməsən də dənizin suyun

.Azca içsən yatar bil susuzluğun

Fəzlüllah Kompani

## BİRİNCİ hİSSƏ.PEYĞƏMBƏR (S) ZAMANINDA

### MÖVLUD VƏ ƏSİL–NƏSƏB

,Nəzər əhli üzü bu gün Kə’bəyə

.Pərdədən süzülür Allahın nuru

,Qiblədən sıyrılır qiblənümamız

. Arzular çin olur, könüllər duru

Tarixçilərin yazdıqlarına görə həzrət Əli (ə) otuzuncu Fil ilində, rəcəb ayının on üçü, cümə günü Kə’bənin daxilində görünməmiş bir şəkildə dünyaya göz açmışdır. :Təhqiqatçı alim höccətül-İslam Nəyyir deyir

,Ey Kə’bə evində göz açan insan

.Gövhərsən, cisminin sədəfi Məkkə

,Kə’bədə mövludun heyrət doğurdu

.Haqqın evi saldı üstünə kölgə

Həzrətin atası Əbu-Talib ibn Əbdül-Müttəllib ibn Haşim ibn Əbdül-Mənaf, anası Fatimə binti Əsəd ibn Haşim olmuşdur. Göründüyü kimi, həzrət Əli (ə) həm ata, həm də ana tərəfdən Haşimi soyundandır. Əbu-Talibin həzrət Əlidən (ə) başqa daha üç oğlu .olmuşdur: Talib, Əqil və Cə’fər

Amma həzrət Əlinin mövludu, dünyaya gəlişi o biri qardaşlarının dünyaya gəlişindən fərqli olmuşdur. Bu doğuş maraqlı və mə’nəvi dəyişikliklərlə müşayiət olunmuşdur. Həzrətin anası allahpərəst olmuş və İbrahimin Hənif dinində həyat sürmüşdür. Bu qadın daim Allah dərgahına münacat etmiş və qarşıdakı doğuşun asan keçməsi üçün Allaha yalvarmışdır. Fatimə bu uşağa hamilə olduğu vaxt özünü ilahi nura qərq olmuş vəziyyətdə hiss etmiş, sanki bu körpənin başqa övladlardan fərqləndiyi barədə .fələklərdən ilham almışdır

Şeyx Səduq və Qəttal Nişapuri nəql etmişlər ki, Yezid ibn Qə'nəb demişdir: «Mən Abbas ibn Əbdül-Müttəllib və Əbdül-Üzza tayfasından bir qrupla Allah evinin kənarında əyləşmişdim. Əmirəl-mö'mininin anası Fatimə binti Əsəd doqquz aylıq körpəyə hamilə vəziyyətdə doğuş ağrısı çəkə-çəkə deyirdi: «Pərvərdigara, mən sənə, peyğəmbərlərindən gələnə, Sənin tərəfindən nazil olmuş kitablara iman gətirmişəm. Cəddim İbrahim-Xəlilin sözlərini təsdiq edirəm. Bu qədim evin bünövrəsini qoyan o olmuşdur. Səni and verirəm bu evi tikənin və bətnimdə olanın haqqına, bu doğuşu mənim üçün asan et». Yezid ibn Qə'nəb deyir: «Biz öz gözümüzlə Kə'bə evinin arxadan yarıldığını və Fatimənin Kə'bəyə daxil olduğunu gördük. Fatimə gözdən itdikdən sonra divar yenidən birləşdi. Kə'bənin qapısını açmaq istəsək də mümkün olmadı. Başa düşdük ki, bu Allahın işidir. Dörd gün sonra Fatimə qucağında Əmirəl-mö'minin (ə) bayıra çıxdı və dedi: «Mən keçmişdəki bütün qadınlardan üstünəm. Çünki Asiya Allaha elə bir yerdə gizlin pərəstiş edirdi ki, həmin yerdə yalnız çarəsizlikdən pərəstiş edilməsi mümkün idi. İmran qızı Məryəmi beytül-müqəddəsdə doğuş sancısı tutduqda ona nida edilir ki, bayıra çıxsın, ibadətgahda doğuş olmaz. Mən isə Allahın evinə daxil oldum, behişt meyvələrindən yedim, bayıra çıxmaq istədikdə nida gəldi ki, ey Fatimə, onun adını «Əli» qoy. Nida gəldi ki, Əliyyul-ə'la Allah buyurur: «Mən ona öz adımdan götürdüyüm ad qoydum, onu öz ədəbimlə tərbiyə etdim, ona gizli elmlərimdən agahlıq verdim; odur mənim evimdə bütləri sındıran, odur evimin damında azan deyən, məni pak bilən; xoş o kəsin halına ki, onu dost tutar, ona itaət edər; vay o kəsin halına ki, onu düşmən tutar və ona müxalif olar».(١)

Həzrət Əlinin (ə) dünyaya Kə'bədə göz açmaqla qazandığı iftixar nə keçmişdə kimsəyə nəsib olub, nə də gələcəkdə nəsib olasıdır. Həzrətin dünyaya Kə'bədə göz açması sünnə əhlinin də e'tiraf etdiyi bir həqiqətdir. Necə ki, ibn Səbbağ Maliki, «Füsulul-Mühimmə» kitabında deyir: «Həzrət Əlidən (ə) qabaq kimsə Kə'bə evində dünyaya göz açmamışdı. Bu fəziləti Allah-təala yalnız Əliyə (ə) aid etmiş və bununla da xalqa onun uca məqamını göstərmişdir.»(٢)



---

١- [١] Шејх Сәдуг, «Әмали» ٢٧-чи мәчлис, ٩-чу һәдис.

Biharın» ۹-cu cildində Həzrətə ad qoyulması barədə yazılmışdır: «Əbu-Talib körpəni » anasından aldı, öz sinəsinə sıxdı. Fatimənin əlindən tutub Əbtəhə (Məkkə və Mina :arasındakı yer) gəldi. Allah dərgahına üz tutaraq belə münacat etdi

,Ey qaranlıq gecənin, parlaq ayın sahibi

.Öz hökmünü bəyan et, adlandır bu naibi

:Onlara cavab olaraq qeybdən nida gəldi

,«Pak övladınızı çağırın «Əli

.Allah adındandır onun təməli

Böyük sünni alimləri də öz kitablarında uyğun məsələyə toxunmuşlar. Məhəmməd ibn .Yusif Gənci Şafei «Kifayətut-Talib» kitabında azca dəyişikliklə nəql etmişdir

Bə'zi rəvayətlərdə nəql olunur ki, Fatimə binti Əsəd körpəsi dünyaya gəldikdən sonra onun adını Heydər qoydu. Körpəni bələyib ərinə verdiyi zaman bu ad barədə mə'lumat :verdi. Həzrət Əli (ə) Xeybər döyüşündə tanınmış yəhudi pəhləvanı Mərhəbə buyurdu

,Anam «Heydər» qoymuş mənim adımı

!?Bu şirin önündə duran oldumu

Həzrətin adı Əli qoyulduğundan Heydər adı onun sair ləqəbləri sırasına qatıldı. Heydər, Əsədullah, Mürtəza, Əmirəl-mö'minin həzrətin məşhur ləqəblərindəndir. Onun .künyəsi Əbül-Həsən və Əbu-Türab olmuşdur

Rəvayətlərdə Fatimə və Əbu-Talibin allahpərəstliyi və müsəlman olması da bildirilir. Onlar cahiliyyət dövründə də tək Allaha inanmışlar. Öz övladlarına ad vermək üçün Allah dərgahına üz tutmuş, onun əmrini gözləmişlər. Fatimə binti Əsəd həzrət Peyğəmbər üçün ana kimi olmuşdur. Fatimə həzrətə ilkin iman gətirənlərdən və Mədinəyə mühacirət edənlərdəndir. O, dünyasını dəyişdiyi vaxt həzrət Peyğəmbər (s) öz köynəyini Fatimə üçün kəfən etmiş, səh:۸

onun cənazəsinə namaz qılmış, qəbir sıxıntısından qurtarmaq üçün qəbrinə enmiş, ona (təlqin buyurmuş və dua etmişdir.(۱

Əbu-Talib də tək Allaha sitayiş etmiş, həzrət Peyğəmbərin be’sətindən sonra ona iman gətirmişdir. Qüreyşin şeyxi və rəisi olduğundan Əbu-Talib öz imanını məxfi saxlamışdır. Şeyx Səduq nəql edir ki, bir şəxs ibn-Abbasa dedi: «Ey Peyğəmbərin əmioğlusu, mənə de görüm, Əbu-Talib müsəlman oldumu?» İbn-Abbas dedi: «Müsəlman olmayan şəxs belə deyərdimi: «Məkkə müşrikləri bilirdilər ki, biz öz övladımız Məhəmmədi qəbul edirik və o, boş sözlərə e’tina etmir». Əbu-Talib Kəhf səhabələri kimidir. O öz imanını qəlbində gizli saxladı və zahirən müşrik kimi göründü. Allah onlara iki savab verdi. Həzrət Sadiq buyurmuşdur: «Əbu Talib Kəhf səhabələri kimidir. Qəlbində iman vardı, zahirən müşrik görünürdü. Allah ona iki mükafat verdi: (Birini imanına, o birini isə təqiyyəsinə görə».(۲

Biharul-ənvarda» Əbu-Talibin həzrət Peyğəmbəri mədh edən şe’rləri nəql » olunmuşdur. Bu şe’rlərin məzmunundan görünür ki, o İslamı qəbul etmişdir. Əbu-Talib :həzrət Peyğəmbərə (s) xitabən deyir

,Də’vətinlə mənə xeyir dilədin

.Dinlərin tacıdır gətirdiyin din

İmam Sadiqdən soruşdular ki, Əbu-Talibin kafir olduğu düzdürmü? Həzrət buyurdu: :«Yalan deyirlər. Kafir belə deyə bilərdimi

,Musa tək tanıdıq Məhəmmədi biz

.Kitablarda adı yazılmış səlis

Şeyx Süleyman Bəlxi «Yənabiul-məvəddət» kitabında Əbu-Talib haqqında yazır: «Qüreyşin rəisi və böyüyü olan Əbu-Talib Peyğəmbərin himayəçisi və yardımçısı idi. O, Peyğəmbəri çox sevirdi. O, həzrətin tərbiyəçisi olmuş və peyğəmbərliyini e’tiraf etmişdi. Əbu-Talib həzrət Peyğəmbər haqqında

۱- [۳] «Үсуле-кафи» ۲-чи чилд, тарих бабы.

۲- [۴] Шејх Сәдуг «Әмали», ۸۹-чу мәчлис ۱۲-۱۳-чү һәдис.

.xeyli şe’r qoşmuşdur

Həzrət Əlinin Kə’bədə dünyaya gəlməsi Bəni-Haşim üçün böyük iftixar oldu. Ərəb və əcəm şairləri bu barədə xeyli şe’r yazmışlar. Seyyid Həmirinin bu mövzuda yazılmış bir :neçə misrasını xatırlayaq

Anası müqəddəs Kə’bə evində

.Gətirdi dünyaya oğlu Əlini

,Libası pakizə, özü pakizə

.Mövlud üçün seçdi eşq məhəllini

## HƏZRƏTİN İLKİN TƏRBİYƏSİ

Həzrət Əlinin atası Əbu-Talib Qüreyş tayfası arasında böyük hörmətə malik idi. O övladlarının tərbiyəsinə ciddi yanaşır, onları təqva və fəzilətə sövq edirdi. Əbu-Talib öz övladlarına uşaqlıq dövründən başlayaraq ərəb adət-ən’ənələri əsasında at çapma, .güləş və oxatma tə’lim edirdi

Həzrət Peyğəmbər (c) uşaqlıq dövründə atasını itirdiyindən öz babası Əbdül-Müttəlibin himayəsində yaşayırdı. Əbdül-Müttəlib dünyasını dəyişdikdən sonra onun oğlu Əbu-.Talib öz qardaşı oğlunu himayəyə götürdü

Həzrət Əlinin (ə) anası Əbu-Talibin zövcəsi Fatimə binti Əsəd həzrət Peyğəmbərə (s) mehriban bir ana kimi can yandırırdı. Belə ki, Fatimə dünyasını dəyişərkən həzrət Peyğəmbər (s) də həzrət Əli (ə) kimi çox kədərləndi. Həzrət Fatimə üçün cənazə .namazı qıldı, onu öz köynəyinə bürüdü

Əziz Peyğəmbər (s) əmisi Əbu-Talibin evində boya-başa çatdığından təşəkkür əlaməti .olaraq onun zəhmətləri müqabilində hansısa bir kömək göstərmək istəyində idi

Təsadüfdən həzrət Əli (ə) altı yaşa daxil olan vaxt Məkkədə böyük bir qıtlıq yaranmışdı. Böyük ailə sahibi olan Əbu-Talib həmin qıtlıq zamanı bir sıra çətinliklərlə üzləşmişdi. Həzrət Peyğəmbər (s) ailə ehtiyaclarını ödəməyə çətinlik çəkən əmisinə yardım olaraq

altı yaşlı Əlini (ə) himayəyə götürdü və bu bəhanə ilə onun tərbiyəsi ilə məşğul olmağa başladı. Əbu-Talib və Fatimə binti Əsədin himayəsində boya-başa çatmış Peyğəmbər (s) öz zövcəsi Xədicə ilə birlikdə həzrət Əli (ə) üçün mehriban ata-ana oldu.

İbn Səbbağ «Füsulul-mühimmə», mərhum məclisi «Biharul-ənvar» kitablarında

səh:١٠

yazırlar: Bir vaxt Məkkədə qıtlıq oldu. Həzrət Peyğəmbər (s) var-dövlət sahibi olan əmisi Abbas ibn Əbdül-Müttəlibə təklif etdi ki, Əbu-Talibi düşdüyü maddi sıxıntıdan çıxarmaq məqsədi ilə hərəsi onun oğlanlarından birini himayəyə götürsünlər. Abbas Peyğəmbərin bu təklifini həvəslə qarşıladı. Onlar Əbu-Taliblə görüşdülər və öz təkliflərini ona bildirdilər. Əbu-Talib dedi: «Əqil mənimlə qalsın, başqa nə bilirsinizsə (edin». Abbas Cə'fəri, Həmzə Talibi, Peyğəmbər isə Əlini öz himayəsinə götürdü.(١)

Bir nöqtəni qeyd etmək zəruridir ki, Əbu-Talibin övladları arasında Əlini (ə) o birilərlə müqayisə etmək olmazdı. Həzrət Peyğəmbər Əlini (ə) evinə apardıqdan sonra onların arasında xüsusi bir məhəbbət yarandı. Sanki bir zərrə günəşə qatılmış və ya bir damla .dəryaya qovuşmuşdu

!Əlinin (ə) qədrini Peyğəmbər (s) bilər

.Necə zər qədrini bir zərgər bilər

Haqqında «onu çox qüvvəli olan öyrətdi»(٢) ayəsi nazil olmuş, özü də ilahi bir məktəbdə tərbiyə almış həzrət Peyğəmbər (s) kimi bir mürəbbi və müəllimə həzrət Əli (ə) kimi .şagird və tələbə lazımdır

Həzrət Əli (ə) uşaqlıq dövründə Məhəmməd səciyyələri ilə cilvələnmiş və həzrətə dərin .bağlarla bağlanmışdı. Bu bağlar heç vəchlə qırılası deyildi

Həzrət Əli (ə) Peyğəmbəri (s) sayəbə-sayə izləmiş, birbaşa onun tərbiyəsi altında ərsəyə çatmışdır. O, Peyğəmbərin əqidə və adətlərinin ardınca getmiş, belə ki, qısa bir .müddətdə onun bütün hərəkətlərini, xallarını, əxlaqını və adətlərini əxz etmişdir

İnsanın həyatı bir neçə mərhələyə bölünür. İnsan hər bir həyat mərhələsində öz yaş tələblərinə əməl edir. Uşaqlıq dövrünün də özünəməxsus hərəkətləri vardır. Amma Həzrət Əli (ə) bütün başqa uşaqlardan fərqli olaraq uşaq oyunları ardınca getməmiş, ,əyləncələrdən çəkinmiş, elə uşaq dövründən başlayaraq ali düşüncələrə qərq olmuş



---

.Фүсулул-муһиммә», сəh. ١٥» [٥] -١

əməl və rəftarlarında mə’nəvi bir təkamül, ilahi əzəmətin bir nümunəsi müşahidə edilmişdir.

Həzrət Əli (ə) səkkiz yaşınadək Peyğəmbərin (s) himayəsində olmuşdur. Sonra atasının yanına qayıtsa da, bu qayıdış onun Peyğəmbərlə ünsiyyətinə mane olmamışdır. Həzrət Əli (ə) vaxtının çoxunu həzrətin yanında keçirmişdir. Həzrət Peyğəmbər də qəlbində toplanmış Əbu-Talib məhəbbətini Əlinin (ə) qəlbində əks etdirmiş, Əlinin tərbiyəsini öz əxlaqi fəzilətləri üzərində qurmuşdur. Beləcə, həzrət Əlinin (ə) həyatının ilk on ili Peyğəmbərin pənahında və himayəsində ötüşmüşdür. Həmin ilkin tə’lim-tərbiyə nəticəsində həzrət Əli (ə) Peyğəmbərin (s) ilahi də’vətlərini hamıdan qabaq qəbul etmiş və ömrünün sonunadək haqq və həqiqət yolunda fədakarlığa hazır olmuşdur.

## BE’SƏT – HƏZRƏT MƏHƏMMƏDİN (S) PEYĞƏMBƏRLİYƏ ÇATDIĞI DÖVR

Bu fəsildəki söhbətlərə başlamazdan qabaq həzrət Peyğəmbərin be’sətinə nəzər salmaq lazım gəlir. Yalnız bundan sonra be’sət məsələsində mühüm payı olan həzrət Əlinin (ə) həyatını araşdırmaq olar.

Həzrət Peyğəmbər (s) gənclik dövründən başlayaraq, adətən, həmin dövrün çirkin cəmiyyətindən kənarlaşıb, təklikdə düşüncə və ibadətə məşğul olardı. Həzrət yaranış nizamı, təbiətin ümumi qanunları, varlıq aləminin sirlərini mütaliə edərdi. Qırx yaşına çatdıqda özünə ibadət yeri seçdiyi Həra dağında əbədiyyət şö’lələri onun daxilini işıqlandırdı və onun üçün varlıq aləminin sirlərinə pəncərə açıldı. Dili həqiqətlərin açıqlanması üçün hərəkətə gəldi və həzrət xalqın hidayəti üçün əmr aldı. Həzrət Məhəmməd (s) gördüyü hər şeydən həqiqət qoxusu duyur, harada olurdusa həqiqət axtarırdı. Qəlbində fəryad qopmuş bu insanın dili sükuta qərq olmuşdu. Amma onun ilahi siması belə bir həqiqətdən danışırdı.

Könlümün qatında bilməm olan nə,

Mən aram durmuşkən o ağlar yenə.

Həzrət arabir sirrini Xədicəyə açar, başqalarındansa gizləyərdi. Xədicədə öz növbəsində ona ürək-dirək verərdi. Bir müddət belə ötüşdü.

Nəhayət, bir gün həzrət Həra dağında bir avaz eşitdi: «Ey Məhəmməd oxu!» Həzrət: «Nə oxuyum», deyə soruşdu. Deyildi: «Yaradan Rəbbinin adı ilə oxu; o insanı laxtalanmış qandan yaratdı; oxu! Sənin Rəbbin ən böyük kərəm sahibidir; O Rəbbin ki, qələmlə öyrətdi; o Rəbbin ki, insana bilmədiklərini tə'lim etdi.»(١) İlahi nur qeyb aləmindən onun könül fəzasına süzüldüyü vaxt həzrətin vücudu lərzəyə gəldi və o, dağdan uzaqlaşdı. Hara baxırdısa həmin nurun cilvəsini görürdü. İztirablı və heyran vəziyyətdə evə gəldi. Bədəni yarpaq tək əsirdi. Xədicəyə «məni bürü», dedi. Xədicə onu bürüdü və həzrət yuxuya getdi. Yuxudan oyandıqda həzrətə belə bir ayə nazil oldu: «Ey libasına bürünmüş; qalx (qövmünü) qorxut; öz Rəbbini uca tut; libasını pak et; əzaba səbəb olacaq pis şeylərdən uzaqlaş; etdiyini çox bilib bir kəsə minnət qoyma; Rəbbinin (razılığını qazanmaq üçün səbr et.»(٢

Amma belə bir də'vəti aşkarlamaq asan iş deyildi. Çünki bu də'vət ərəb və sair millətlərin e'tiqadlarına zidd idi. Bu də'vət dünya xalqlarının, ən əsası isə ərəblərin ictimai, dini və ideoloji müqəddəsliklərini təhqir edirdi. Bu səbəbdən də yaxından-uzaqdan bu barədə eşidənlər, hətta yaxın qohum-əqrəba həzrətə qarşı müxalifət .bayrağı qaldırıb, ona tə'nə vurmağa, istehza etməyə başladılar

Bütün bu müddət ərzində həzrətin ilahi cazibəyə bürünmüş mübarək vücudu bu misilsiz və böyük əta müqabilində Allah dərgahına sitayiş edirdi. Əlinin (ə) iri və dolu gözləri Peyğəmbərin (s) halını heyranlıqla müşahidə edirdi. Həzrət Məhəmməd (s) Peyğəmbərliyə çatdığı ilk andan on yaşlı həzrət Əli (ə) İslamı qəbul etmiş, Peyğəmbərə (s) müt'i olmuşdu. Həzrət Əli (ə) Peyğəmbərin də'vətini qəbul etmiş ilk kişidir. Bütün sünni tarixçiləri və mühəddisləri bu həqiqəti təsdiq edirlər. Mühibbəddin Təbəri «Zəxairul-üqba» əsərində Ömərin dilindən yazır: «Əbu-Übeydə, Əbu-Bəkr və başqaları ilə birlikdə olduğum vaxt həzrət Peyğəmbər (s) əlini həzrət Əlinin (ə) çiynınə qoydu və buyurdu: «Ya Əli, mö'minlər arasından iman gətirmiş ilk şəxs sənsən. Müsəlmanlardan birincisisən ki, İslamı seçdin. Harun Musa üçün hansı məqamda



---

.Әләг» сурәси, ajә ١-٥» [٧] -١

.Мүддәссир» сурәси, ajә ١-٧» [٨] -٢

idisə, sən də mənim üçün həmin məqamdasan».(۱) Təbəri öz əsərində belə bir qeyd edir: «Həzrət Peyğəmbər (s) bazar ertəsi günü peyğəmbərliyə məb'us oldu və Əli bir gün sonra İslamı qəbul etdi. Süleyman Bəlxi «Yənabiul-məvəddət» əsərinin on ikinci fəslində Ənəs ibn Malikdən nəql edir ki, həzrət Peyğəmbər (s) belə buyurdu: «Mələklər yeddi il mənə və Əliyə (ə) salam göndərdilər. Çünki həmin yeddi ildə yalnız mənim və Əlinin (ə) dilindən Allahın birliyinə şəhadət kəlmələri səmaya ucalırdı».

Həzrət Əli (ə) Müaviyənin qürrələnməsinə cavab olaraq ona göndərdiyi şe'rdə İslama ilkin gəlişin ona məxsus olduğuna işarə edir.(۲)

Körpə olmağıma baxmayaraq mən

İslama üz tutdum hamıdan öndən.

Həzrət Peyğəmbər Allahın əmri ilə öz qohum-əqrəbasını bir yerə yığıb, onları İslama də'vət etdiyi vaxt on yaşlı həzrət Əlidən (ə) savay kimsə bu də'vətə müsbət cavab vermədi. Həzrət Peyğəmbər elə həmin məclisdə Əlinin (ə) imanını qəbul etdi və məclis əhlinin hüzurunda onun canişinliyini təsdiqlədi. Hadisə belə baş verdi:

«Ən yaxın qohumlarını qorxut»(۳) ayəsi nazil olduğu üçün həzrət Peyğəmbər (s) Əbdül-Müttəlibin övladlarını Əbu-Talibin evində bir yerə topladı. Məclisdə qırxa yaxın adam vardı. Həzrət öz də'vətinin həqiqət olduğunu sübuta yetirmək üçün onlara mö'cüzə göstərməli idi. Həzrət məclisdəkilər üçün bir qoyun budu, on sir (۱ sir=۷۵ qram) buğda və üç litr süddən qida hazırlanmasını göstəriş verdi. Hansı ki, məclisdəkilərdən bə'ziləri bütün bu deyilənləri bir dəfəyə yeyərdi.

Süfrə açıldığı vaxt məclisdəkilər gülüşüb, «Məhəmməd heç bir nəfərlik də yemək hazırlamayıb» dedilər. Həzrət buyurdu: «Yeyin Allahın adı ilə». Qonaqlar süfrədə olan təamlardan yeyib doydular. Əbu-Ləhəb dedi: «Məhəmməd bu yeməklərlə sizi sehrlədi».



---

۱- [۹] «Зәхаирул-үгба» сәh. ۵۸.

۲- [۱۰] «Фүсулул-мүhиммә» сәh. ۱۶.

Həmin vaxt Həzrət (s) ayağa qalxdı və sözünə giriş verib buyurdu: «Ey Əbdül-Müttəlib övladları, Allah-təala məni bütün xalqlar, xüsusi ilə də sizin üçün göndərmişdir. Mən sizi iki sözə də’vət edirəm. Bu sözləri demək asan, əməl etmək isə çətindir. Bu sözləri deməklə ərəb və əcəmə hakim olursunuz və bütün millətlər sizə tabe olur. Həmin iki söz vasitəsi ilə behiştə daxil olur, cəhənnəm odundan qurtulursunuz. Bu iki söz Allahın birliyinə və mənim Onun rəsulu olmağıma şəhadət verməyinizdir. Mənim bu də’vətimi qəbul edib peyğəmbərliyimə yardım göstərən və ayağa qalxan hər bir kəs mənim qardaşım, canişinim, vəzirim, varisimdir».

Məclisə toplanmış böyük ailədən kimsə həzrətin də’vətinə müsbət cavab vermədi. Yalnız həddi-büluğ olmamış on yaşlı həzrət Əli (ə) Peyğəmbərin də’vətini qəbul etdi.

Bəli, həzrət Peyğəmbər (s) həmin məclisdə danışdığı vaxt onun istəyinə bəsirət gözü ilə baxan, bu sözləri qəlbən dinləyən həzrət Əli (ə) ayağa qalxdı, şəhadət kəlmələrini izhar edərək dedi: «Də’vətini qəbul edirəm və çağırışına qəlbən cavab verirəm».

Həzrət Peyğəmbər (s) buyurdu: «Ya Əli (ə), əyləş». Peyğəmbər (s) öz sözlərini üç dəfə təkrarladı. Amma həzrət Əlidən (ə) başqa onun də’vətinə cavab verən olmadı. Həmin an həzrət camaata müraciətlə buyurdu: «Bu (Əli), sizin aranızda mənim qardaşım, canişinim və xəlifəmdir». Bə’zi mənbələrdə bildirilir ki, həzrət Peyğəmbər (s) Əlinin (ə) özünə belə buyurdu: «Sən mənim qardaşım, vəzirim və varisimsən. Məndən sonra xəlifəm də sənsən». Əbdül-Müttəlib övladları ayağa qalxdılar, həzrətin peyğəmbərlik məsələsini məsxərəyə qoyub gülüşlə qarşıladılar. Əbu-Ləhəb Əbu-Talibə dedi: «Bundan sonra sən qardaşın oğluna və öz oğluna tabe olmalısan». Peyğəmbərin öz qohum-əqrəbasını Allah əmri ilə İslama də’vət etdiyi gün «Yəvmul-inzar» adlandırılmışdır.(١)

Bə’zi sünnülər həzrət Əlinin (ə) yəvmul-inzar, eləcə də, həmin gündən qabaq iman gətirməsi məsələsini gözdən salmaq üçün deyirlər: «Həqiqətən də, Həzrət Əli (ə) hamıdan qabaq müsəlman oldu və iman gətirdi. Əbu-Bəkr və başqaları isə Əlidən sonra iman gətirdilər. Amma Əli iman gətirdiyi vaxt uşaq səh:١٥

---

١- [١٢] «Тарихе-Тәбәри» ٢-чи чилд, сәh. ٢١٧.

olduğundan, heç bir vəzifə daşımadığından, onun imanı ağıl və məntiq əsasında olmamışdır. Əli uşaqcasına təqlid edərək İslama üz tutmuşdur. Hansı ki, Əbu-Bəkr, Ömər və başqaları yaş və ağılca kamal həddində olmuş, həzrət Peyğəmbərə (s) düşüncə yolu ilə iman gətirmişlər. Şübhəsiz ki, ağıl və araşdırma yolu ilə iman .«gətirilməsi uşaqcasına təqlid yolu ilə iman gətirilməsindən üstündür

Iman məsələsində Əlini başqaları ilə müqayisə etmək məntiq alimlərinin tə ’birincə «Məəl-fa riq» müqayisədir. Bu sayaq iradların irəli sürülməsinin səbəbi

Mövləvi demişkən, insanın öz işini pakların işi ilə müqayisə etməsindən irəli gəlir. Əvvəla , yaş baxımından həddi-büluğ məsələsi əqli işlərə yox , şər’i

hökmlərə aiddir. Allaha iman, Onun yeganəliyinin və risalət məsələsinin təsdiqi ş ər’i təklif yox , əqli işlərdəndir. Ikincisi, ağıl qüvvəsinin yaşartdıqca

çoxalması ümumi qanun deyil. Az yaşlı bir insanın ağıl və məntiqi qırx -əlli yaşlı insanın ağıl və məntiqindən güclü də ola bilər. Xüsusi ilə müqəddəs ruha malik

olan və Allah tərəfindən yardım olan insanın ağıl və məntiqi başqaları ilə müqayisə edilə bilməz. Necə ki, həzrət Isa yeni doğulmuş körpə olduğu

halda buyurdu: «Mən Allahın bir quluyam ki, mənə səmavi kitab verib və məni :Peyğəmbər seçib». (١)Allah -təala Qur’anda həzrət Yəhya haqqında buyurur

(Biz uşaq ikən ona hikmət verdik».(٢)»

:Seyyid Həmiri həzrət Əlini (ə) mədh edərkən bu məsələyə toxunur

Körpəykən Yəhyaya hikmət gələn tək

.Əliyə (ə) vilayət endirdi fələk

Qur’ani-Kərimdə Yusifin dastanında buyurulur: «Bir şahid belə şəhadət verdi: «Əgər Yusifin köynəyi öndən cırılmışsa, qadın doğru deyir. O isə yalançılardandır».(٣) Təfsirçilərin qeyd etdiyinə görə Yusifin paklığına şəhadət verən şəxs azyaşlı bir uşaq .imiş

Üçüncüsü, həzrət Əlinin (ə) imanı başqalarının imanı kimi olmamışdır. Onun səh:۱۶

---

.Məryəm» surəsi, ayə ۳۰ »[۱۳] -۱

.Məryəm» surəsi, ayə ۱۲[۱۴] -۲

.Јусиф» сурəси, ајə ۲۶» [۱۵] -۳

imanı pak fitrətindən qidalanmışdır. Hansı ki, başqalarının imanı küfrdən keçmiş bir imandır. Həzrət Əli (ə) hələ Məhəmmədin (s) peyğəmbərliyindən qabaq fitrətən təkallahçı olmuşdur. Həzrət özü «Nəhcül-bəlağədə» buyurur: «Mən tövhid fitrəti ilə dünyaya gəldim. İmanla və Peyğəmbərlə hicrətlə başqalarından üstün oldum».

Həzrət Hüseyn (ə) aşura günü atasının məqamı ilə fəxr edərək Ömər ibn Sə’din qoşununa buyurur:

Fatimeyi-Zəhra anamdır mənim,

Atam döyüşlərdə düşmənə qənim.

Qüreyş Lat-Üzzaya tapındığı vaxt,

Atam üstün tutmuş Allahın dinin.

Məhəmməd ibn Yusif Gənci və digər alimlər həzrət Peyğəmbərin (s) belə buyurduğunu nəql edirlər: «Ümmətlər arasında üç şəxs iman baxımından başqalarından irəlidədir. Onlar bir göz qırpımında Allaha müşrik olmadılar. Bu üç nəfər Əli ibn Əbu Talib, Yasin sahibi və Ali-Fir’on mö’minidir. Onlar öz imanlarında doğruçudurlar».(١)

Dördüncüsü, həzrət Peyğəmbərin sözü və əməli bizim üçün, dəlil olmuşdur və heç bir nə üçün niyəyə yer qalmır. Çünki Allah-təala həzrət haqqında buyurmuşdur: «O, könlü, istəyəni danışmır; bu ancaq nazil olan bir vəhydir».(٢) Əgər həzrət Əli (ə) uşaqyana bir təqlidlə iman gətirmiş olsaydı, həzrət Peyğəmbər (s) hələ həddi-büluğa çatmadığını onun nəzərinə çatdırardı. Hansı ki, Peyğəmbər (s) Əlinin (ə) imanını nəinki qəbul etmiş, hətta onun varisliyini, canişinliyini və xəlifəliyini xalq arasında bəyan etmişdi. Əlinin (ə) ilkin iman gətirməsi məsələsini şübhə altına alanlar əslində nə Peyğəmbəri tanımışlar, nə də Əlini!

Eləcə də, Əlinin imanının dəyərini Allah daha yaxşı bilir. Qur’ani-Kərimdə onun imanı haqqında xoş sözlər buyurulmuşdur. Əgər tarixçilərin və təfsirçilərin bildirdiyinə görə, Abbas ibn Əbdül-Müttəlib, Şeybə ərəb adətlərinə əsasən səh:١٧

---

١- [١۶] «Кифаjәтут-Талиб» ٢۴-чү баб, сәh. ١٢٣.

fəxr etdiyi vaxt həzrət Əli (ə) onlardan nəyin fəxr sayılması haqqında soruşur. Abbas deyir: «Mən hacılara su vermiş, onların işlərini idarə etmişəm». Şeybə deyir: «Mən Allah evinin xadimiyəm, onun açarları məndədir». Bu məqamda həzrət Əli (ə) buyurur: «Fəxr mənə məxsusdur. Çünki mən sizlərdən çox-çox qabaq iman gətirmiş və qibləyə doğru namaz qılmışam». Bu üç şəxsin heç biri o birilərin sözünü qəbul etmədiyindən həzrət Peyğəmbərin (s) yanına gedirlər ki, kimin haqlı olduğu barədə hökm verilsin. Həmin məqamda Cəbrail ayə gətirir: «Məgər siz hacılara su verməyi və Məscidül-həramı tə’mir etməyi Allaha və qiyamət gününə iman gətirib, bu yolda cihad etməklə eynimi (tutursunuz?!».(١)

Əksər tarixçilər təsdiq edirlər ki, Peyğəmbərin (s) də’vətinə ilk müsbət cavab vermiş və Allaha iman gətirmiş şəxs həzrət Əli (ə) olmuşdur. Sünni və şiə tarixçilərinin bildirdiyinə görə, həzrət Peyğəmbər (s) buyurmuşdur: «Mənim də’vətimi ilkin qəbul edən kəs məndən sonra canişinim olacaq». Bu məsələni sünnə əhlinin nə üçün qəbul etmədiyini onların özündən soruşmaq lazımdır. Biz söhbətimizin beşinci hissəsində bu barədə .daha ətraflı danışacağıq

Ən əhəmiyyətli və maraqlı budur ki, Əlinin (ə) müsəlmanlığı və imanını başqalarının müsəlmanlığı ilə müqayisə etmək olmaz. Çünki həzrət yalnız zahirən və ya Peyğəmbərlə qohum olduğu üçün iman gətirməmişdi. Həzrət Əli (ə) lap uşaq çağlarından həqiqət aşiqi olmuşdu. O, haqla üzbəüz dayandığı vaxt hər şeyi unudardı. Bu səbəbdən də haqqın zühur yeri olan Peyğəmbər (s) qarşısında fani olmuş, onun .dinini yaymaq yolunda öz fədakarlığını son həddə çatdırmışdı

Çəkinmədən deyə bilərik ki, həzrət Peyğəmbərin Əlidən (ə) fədakar yaxını olmamışdı. Həzrət Əlinin (ə) İslam yolundakı fədakarlıqlarını kimsə inkar edə bilməz. O ən çətin məqamlarda canını Peyğəmbərə (s) sipər etmiş və belə bir fədakarlığı qəlbən qəbul .etmişdir

İslamın tülu etdiyi ilk gündən həzrət Peyğəmbər hər gün Qüreyş müxaliflərinin maneələri ilə üzbəüz olmuşdur. Qüreyş hər vasitə ilə Peyğəmbərə əzab-əziyyət verməyə çalışırdı. Be’sətdən sonra Məkkədə olduğu on üç ildə Əbu-Ləhəb kimi yaxın qohumları tərəfindən də olmazın əziyyətlərinə mə’ruz

qalan Peyğəmbəri həzrət Əli (ə) kölgə tək izləyərək qorumuş, onu müşriklərin, Məkkə bütpərəstlərinin fitnələrindən uzaqlaşdırmışdır. O, Peyğəmbərlə olduğu vaxtlarda isə .Allah rəsulunu incitməyə cür'ət etməzdilər

Gizli və aşkar də'vət dövrlərində həzrət Əli (ə) heç bir fədakarlıqdan çəkinməzdi. Həzrət Peyğəmbər (s) də öz də'vətini günbəgün itiləşdirir və xalqı açıq-aşkar Allaha doğru çağırır, bütpərəstlikdən çəkinməyə də'vət edirdi. Nəticədə Qüreyşin bə'zi qadın və kişiləri doğru yolu tutub, müsəlman oldular. Bir neçə Qüreyşinin İslamı qəbul etməsi .o birilərinə ağır gəldi və Peyğəmbəri incitməkdə daha çox sə'y göstərməyə başladılar

Əbu-Cəhl, Əhnəz ibn Şəriq, Əbu-Süfyan, Əmr As, Ömər ibn Xəttab, Əbu-Ləhəb həzrət Peyğəmbərin (s) ən böyük düşmənlərindən idilər. Onlar açıq-aşkar Əbu-Talibdən tələb edirdilər ki, Peyğəmbəri himayə etməsin və onu Qüreyşin ixtiyarına versin. Amma Əbu-Talib ömrünün son günlərinədək Peyğəmbəri himayə etdi və onun əqidəsinin .genişləndirilməsi yolunda əlindən gələni əsirgəmədi

Sərt tə'qiblər sayəsində həzrət Peyğəmbər (s) öz qohumları və yaxınlarından bir qrupu ilə üç il Şi'be Əbu-Talibdə(١) gizləndilər və özlərini aşkar etmək, açıq ibadət .imkanından məhrum oldular

Bütün bu çətin mərhələlərdə həzrət Əli (ə) həzrət Peyğəmbərlə birlikdə idi. Bu iki insan bir-birinə ruhən və əxlaqi baxımdan o qədər bağlanmışdılar ki, onları ayrılıqda .təsəvvür etmək mümkünsüz olmuşdu

İslamın zühuru Məkkədə bu sayaq maneələr və problemlərlə üzləşdiyindən ilk on üç ildə elə bir inkişaf əldə olunmadı. İslamın inkişafı üçün yol tapmaq, münasib mühit axtarmaq zəruri olmuşdu. Bütün bu axtarışlar nəhayətdə həzrət Peyğəmbərin (s) .hicrəti ilə nəticələndi. Həzrətin hicrəti haqqında növbəti fəsillərdə danışacağıq

## HİCRƏTDƏ ƏLİNİN (Ə) ROLU

Həzrət Peyğəmbərin (s) Məkkədən Mədinəyə hicrəti üçün şərait yaradan səbəblərdən biri həmin şəhərdə İslamın yayılması idi. Ərəb qəbilələri səh:١٩

---

(Бир дәрә ады) [١٩] -١

Mədinədən Məkkəyə ticarət üçün gəldikləri vaxt həzrət bu adamlarla görüşüb, onları İslama də’vət edirdi. Həzrətin təbliğatı müsbət nəticələr verirdi. Əbu-Talibin vəfatından sonra Mədinədən Məkkəyə gəlmiş Ovs qəbiləsindən bir dəstə adam həzrət Peyğəmbərlə görüşdü. Onlardan altısı İslam dinini qəbul etdi, Mədinəyə qayıtdıqdan .sonra şəhər əhlini İslama də’vət etməyə başladı

Bir müddət sonra Mədinənin yetmişdən çox qadın və kişisi Məkkəyə gəlib, müsəlmanlığı qəbul etdilər. Beləcə, Mədinədə İslam dini sür’ətlə yayılmağa başladı. Mədinə mühitində Qüreyşin müxalifliyi, əzab-əziyyəti kimi maneələr olmadığından bu şəhər İslamın yayılması üçün daha münasib görünürdü. Həzrət Peyğəmbər ardıcıllarından bir qrupuna göstəriş verdi ki, Məkkə müşriklərinin şərindən qurtarmaq üçün Mədinəyə mühacirət etsinlər. Onlar da aşkar və gizli şəkildə Mədinəyə üz .tutdular və həmin şəhər əhli tərəfindən mehribanlıqla qarşılandılar

Digər bir tərəfdən həzrət Peyğəmbər (s) özü də Mədinəyə köçməyə meyl göstərirdi. Amma o məs’uliyyət daşıdığı bir yeri Allahın icazəsi olmadan tərk edə bilməzdi. Elə bu məqamda baş vermiş hadisə həzrət Peyğəmbərin (s) Mədinəyə hicrəti üçün şərait .yaratdı. Bu səbəbi Mədinəyə mühacirətin əsas səbəbi saymaq olar

Mədinədə İslam dininin yayılmasından, eləcə də, bir qrup müsəlmanın həmin şəhərə hicrət etməsindən xəbər tutan Qüreyş qorxurdu ki, İslam dini həmin şəhərdə qüvvətlənib, sonradan onlar üçün təhlükə mənbəyinə çevrilə. Ona görə də bütün ehtimal olunan təhlükələri aradan qaldırmaq üçün həzrət Peyğəmbərin (s) işini .bitirmək və ondan birdəfəlik yaxa qurtarmaq qərarına gəldilər

Amma bu məqsədi həyata keçirmək bir o qədər də asan deyildi. Çünki həzrət Peyğəmbər Əbdül-Müttəlib ailəsindən idi və onun həyatına qəsd edilsəydi, haşimi ?cavanları qılınca sarılıb intiqam alası idilər. Bəs nə etmək olardı

Qüreyş başçıları xəlvəti görüşüb uzun-uzadı müzakirələrdən sonra belə bir nəticəyə gəldilər ki, hər qəbilədən yaxşı bir döyüşçü seçilsin və bu dəstə gecə yarı həzrət Peyğəmbərin (s) evinə hücum edib onu yatağındaca qətlə yetirsin. Əgər belə olsaydı, bəni-Haşim bütün ərəb qəbilələri ilə savaşa

.qalxa bilməzdi. Beləcə, həzrət Peyğəmbərin qanı yerdə qalardı

Bu şeytani plan Peyğəmbərin məxfi şəkildə aradan götürülməsi üçün cızılmış qəti bir qərar idi. Amma Həra dağında öz camal nurundan həzrət Məhəmmədin (s) vücuduna pay vermiş, onu heyrət işığında qərq etmiş Allah-təala həzrətin işıqlı həqiqət axtarışında olan qəlbini Qüreyşin bu qərarından xəbərdar etdi. Allahın izni ilə həzrət (gecə Məkkədən Mədinəyə üz tutdu.(١

Amma Qüreyş kafirlərinin bu hicrətdən qəflətdə qalması üçün bir tədbir görmək lazım idi. Bundan ötrü Həzrətin yatağında kimsə yatmalı, onun yerini boş qoymamalı idi. Peyğəmbərin yatağına uzanıb, özünü Qüreyş təcavüzkarlarının şəmşiri qarşısında kim ?qoya bilərdi

Məhz bu məqamda uyğun hadisənin qəhrəmanı özünü göstərməyə başlayır. Bu şir ürəkli qəhrəman yalnız həzrət Əli (ə) ola bilər. Tarix onun oxşarını görməmiş və .gələcəkdə də görməyəsidir

Həzrət Peyğəmbər Əlini (ə) tanıyırdı və onun imanından, ixlasından xəbərdar idi. Həzrət üzünü ona tutub buyurdu: «Ya həzrət Əli (ə), Allahın əmri budur ki, Məkkəni tərk edək və Mədinəyə üz tutaq. Amma bu hicrət adi bir səfər deyil. O məhrəmanə və gizli olmalıdır ki, Qüreyş kafirləri bundan xəbər tutmasınlar. Onlar qərara gəliblər ki, bu gecə məni yatağımda qanıma qəltan etsinlər. Onları qəflətdə qoymaq üçün mənim yatağım boş olmamalıdır. Yatağımı boş görüb məni tə'qib edə bilərlər. Allahın əmri .«budur ki, mənim yatağımda yatasan və mən gizli şəkildə mühacirət edim

Həzrət Peyğəmbər (s) sözünü bitirməmiş həzrət Əli (ə) onun də'vətini can-dildən qəbul .«etdi və dedi: «İtaət edirəm, ya Rəsuləllah. Bu işə görə çox şadam və şükr edirəm

Həzrət buyurdu: «Sənə olduqca təhlükəli bir iş tapşırılıb. Çünki Qüreyş kişiləri gecə mənim evimə tökülüşəcək və yatağımı yalın qılınclarına tutacaqlar. Sən isə həmin «!yataqda yatmaq istəyirsən

Həzrət Peyğəmbər mövcud təhlükə barədə nə qədər xəbərdarlıq edib bu təhlükənin ciddiliyini Əlinin (ə) nəzərində canlandırmaq istəsə də, Əmirəl-mö'mininin (ə) şadlığı

məgər ölüm və öldürülməkdən savay bir şey varmı? Bundan böyük səadət ola bilərmi «?ki, mən Allahın əmri ilə öz canımı sənin dininin yayılması yolunda fəda edim

Əlinin (ə) haqq və həqiqət yolundakı canfəşanlığını görən Peyğəmbərin mübarək gözləri yaşardı. Elə bu halda da Əlini (ə) qucaqlayıb öpdü, onunla vidalaşıb ayrıldı. Həzrət Peyğəmbər Məkkədən mühacirət etdi. Bu hicrət be’sətin on üçüncü ili, rəbiül-.əvvəl ayına təsadüf etmişdir

Həzrət getdikdən sonra iyirmi üç yaşlı Əli Peyğəmbərin yataq paltarını geyib onun .yerində uzandı və təhlükəli hadisənin baş verəcəyi anı gözlədi

Füsulul-muhimmə», «Kifayətut-Talib» və digər kitablarda yazılır ki, həzrət Əli (ə) həzrət » Peyğəmbərin (s) yatağına uzandığı vaxt Allah-təala Cəbrail və Mikail mələklərinə buyurdu: «Mən sizi bir-birinizə qardaş etdim. Birinizin ömrünü o birinin ömründən uzun qərar verdim. Hansınız hazırsınız ki, ömrünüzün artıq hissəsini o birinizə bağışlayasınız?» Ərz etdilər: «Pərvərdigara, bu işdə azadıq, yoxsa məcbur?!» Allah buyurdu: «Azadsınız». Mələklərdən heç biri ömrünün artıq hissəsini o birinə bağışlamaq istəmədi. Allah-təala buyurdu: «Mən öz imamın həzrət Əli (ə) və Peyğəmbərim Məhəmməd (s) arasında qardaşlıq qərar verdim. O, Peyğəmbərin (s) yatağında uzanmışdır. Baxın görün, o öz canını qardaşı yolunda necə fəda edir! Peyğəmbərin (s) həyatını öz həyatından üstün tutur. Yerə nazil olun və onu düşmənin şərindən hifz «!edin

Həmin iki mələk Əlinin (ə) yanına gəldilər. Cəbrail onun başı üzərində, Mikail isə ayaqları tərəfdə dayandı. Cəbrail dedi: «Bəh-bəh, ey Əbu-Talib oğlu, səndən başqa «!?Allahı öz mələkləri qarşısında iftixara gətirəcək birisi varmı

Qüreyş cəngavərləri həzrət Peyğəmbəri aradan götürmək üçün əvvəlcə Darun-Nədvə adlanan yerdə toplaşdılar, gecə oranı tərk edib yalın qılınclarla həzrətin evini .mühasirəyə aldılar

Sübh səhər Məkkəyə sakitlik hakim olan an həzrət Peyğəmbərin evinə soxuldular. Həzrət Əli (ə) başını balıncdan qaldırıb fəryad çəkərək «Kimsiniz və nə istəyirsiniz», deyə sordu. Peyğəmbərin yatağında Əlini (ə) görən Qüreyşlər yerlərində quruyub

qaldılar. Nəhayət, sükutu pozub Peyğəmbərin harada olduğunu soruşdular. Həzrət Əli (ə) soyuqqanlılıqla buyurdu: «Mən onun keşikçisi deyildim, siz də onu mənə tapşırmamışdınız ki, indi məndən səh:۲۲

soruşasınız». Hücum edənlərdən biri dedi: «Əli Məhəmmədin arxasıdır. Yaxşı olar ki, «!onun əvəzində Əlini (ə) qanına qəltan edək

Həzrət Əli (ə) buyurdu: «Əfsus ki, Peyğəmbər mənə hücum etmək icazəsi verməyib. Yoxsa həzrətin evinə soxulduğunuz üçün sizi qılıncdan keçirərdim». Bir sözlə, həzrət onları qovaraq buyurdu: «Uzaqlaşın, siz yolunu azmış bir qövmsünüz. Səadət və .«qurtuluşdan da məhrum olacaqsınız

Peyğəmbərin hicrətindən xəbər tutan Qüreyş onu tə'qib etməyə başladı və Peyğəmbərin Əbu-Bəkrlə birlikdə gizləndiyi «Sur» mağarasının ağzınadək gəldi. Amma .Allah-təala həzrəti öz pənahında hifz edib Qüreyşin arzusunu gözündə qoydu

Hicrət hadisəsində Əlinin (ə) fədakarlığı vəsfəgəlməzdir. İyirmi üç yaşlı bu cavan böyük şücaət və ürəklə İslam dininin yayılması üçün özünü qaçılmaz ölümün ağuşuna atdı və :Peyğəmbərə sipər oldu. Həzrət bu barədə buyurur

Bütün yer üzünün ən üstün kəsin

.Canımla qorudum özün, kölgəsin

Qüreyş Allahın rəsulunu qətlə yetirmək üçün hiylə qurduğu vaxt fəzl və kəramət sahibi .olan Allah onların məkrini puça çıxardı

Həzrət Əlinin (ə) bu fədakarlığı müqabilində həzrət Peyğəmbərə belə bir ayə nazil oldu: «İnsanların eləsi vardır ki, Allahın razılığını qazanmaq üçün öz canını fəda edir».(١) Əksər (təfsirçi və tarixçilərin rə'yinə əsasən, ayədə həzrət Əli (ə) nəzərdə tutulmuşdur.(٢

Hicrət əhvalatında həzrət Əlinin (ə) fədakarlığı təkcə Peyğəmbərin yatağında yatması deyildi. Peyğəmbərin Məkkədə olmadığı vaxtlarda həzrət Əli (ə) müsəlmanların işləri ilə məşğul olur, onların həzrət Peyğəmbərin yanında qoyduğu əmanətləri yerbəyer .edirdi

Həzrət Peyğəmbər Mədinəyə daxil olduqdan bir neçə gün sonra (bə'ziləri bildirirlər ki, həzrət Peyğəmbər Qobada dayanıb, həzrət Əlinin (ə) gözlədi və yalnız o gəlib çatdıqdan sonra Mədinəyə daxil oldu) həzrət Əli də öz anası, səh:٢٣

.Бәгәрә» сурәси, ajә ۲۰۷» [۲۱] -۱

Шәваһидут-тәнзил», ۱-чи чилд, сәh. ۹۶» [۲۲] -۲

Peyğəmbərin qızı, iki başqa qadın və zəif düşmüş müsəlmanları götürüb Mədinəyə üz tutdu. Həzrət Peyğəmbər çətin yolda ayaqları yaralanmış Əlini (ə) qucaqlayaraq sevincindən ağladı.

Mədinədə də həzrət Əli (ə) daim həzrət Peyğəmbərlə olar, onu düşmənlərdən qoruyardı. Hicri tarixi ilə birinci ildə səhabələr, mühacirlər və ənsar arasında qardaşlıq peymanı bağlandığı vaxt həzrət Peyğəmbər Əlini (ə) özünə qardaş seçdi.(۱)

Hicri ikinci ildə həzrət Peyğəmbər (s) öz qızı Fatiməni (s) Əliyə ərə verdi. Həmin vaxt Peyğəmbər (s) buyurdu: «Ya Əli, Allah-təala mənə göstəriş vermişdir ki, Fatiməni (s) sənə ərə verim. Mən onu sənə dörd yüz misqal gümüş mehriyyə müqabilində verirəm». Həzrət Əli (ə) ərz etdi: «Bəyəndim, ya rəsuləllah. Bu işdə Allahın və onun girami Peyğəmbərinin lütfünə görə razıyam». Sonra həzrət Əli (ə) Allah dərgahına şükr olaraq səcdəyə düşdü.

Həmin il Allah tərəfindən müşriklərlə döyüş əmri verildi. Həzrət Peyğəmbər düşmənlər, müxaliflərlə savaşa məşğul oldu. Bu döyüşlərdə qələbənin əsas səbəblərindən biri həzrət Əlinin vücudu idi. Həmin vaxtdan Həzrətin həyatında yeni bir dövr başladı. Bu dövrü onun hərbi xidməti dövrü adlandırmaq olar. Söhbətlərimizin davamında həzrətin bə'zi hərbi xidmətlərini nəzərdən keçirəcəyik.

### ƏLİNİN HƏRBİ XİDMƏTLƏRİ

Həzrət Peyğəmbərin on dörd illik də'vəti dövründə onun məntiqi və əsaslı moizələri azğın və bütpərəst ərəb qəbilələrinə tə'sir etmədiyindən Allah-təala tərəfindən cihad hökmü gəldi. Həzrət Peyğəmbərin hicrətin ikinci ilindən doqquzuncu ilinədək olan həyatı dövründə kafirlər, müşriklər, Ərəbistan yəhudiləri ilə səksəndən çox döyüş və qital oldu. Bu döyüşlərdən bə'zilərində həzrət özü şəxsən iştirak edirdi. Həzrətin iştirak etdiyi döyüşlər «ğəzavat» adlanırdı.

Bu döyüşlərdə həzrət Əlinin (ə) fədakarlığı və canından keçməsi kimsəyə sirr deyil. Döyüşlərdə göstərdiyi misilsiz rəşadətlər və şücaətlərə görə

həzrətə «Zəyğəmul-ğəzavat» (savaşlar şiri) deyərdilər. Həzrət Əli (ə) yalnız Təbuk döyüşü zamanı Peyğəmbərin göstərişi ilə Mədinədə qalmışdı. Qalan bütün döyüşlərdə .qələbə bayrağı daim onun əlində olardı

Həzrət Peyğəmbərin müşriklər və İslam düşmənləri ilə apardığı savaşlarda həzrət Əli (ə) bir çox ərəb qəhrəmanlarını öz qılıncı ilə diz üstə çökürdü. Bu savaşlara misal olaraq Bədr, Ühüd, Bəni-Nəzir, Əhzab (Xəndək), Xeybər, Məkkənin fəthi, Hunəyn və Taif .döyüşlərini göstərmək olar

Kitabın bu fəslində məqsədimiz həzrət Əlinin (ə) fədakarlıqları və hərbi xidmətləri haqqında danışmaq olduğundan müharibələr haqqında ətraflı danışmayacaq, yalnız həzrətin döyüş səhnələrindəki mübarizələrini nəzərdən keçirəcəyik. Çünki həzrətin döyüş meydanlarındakı qəhrəmanlıqlarını xatırlamadan onun həyatı haqqında danışmaq yetərsiz olardı. Həzrətin mübarizə əzmi ilə yaxından tanış olmaq üçün bə’zi .döyüşləri nəzərdən keçirmək zəruridir

## BƏDR DÖYÜŞÜ

Bədr döyüşündən qabaq müsəlmanlarla müxaliflər arasında kiçik qarşıdurmalar baş versə də, yalnız Bədr döyüşünü birinci mühüm savaş saymaq olar. Bu döyüşdə müşriklərdən çəkinən, onlarla qarşılaşmaq istəməyən müsəlmanlar sınağa çəkildilər. Bu barədə Allah-təala Qur’anda buyurur: «Mö’minlərdən bir dəstəsinin xoşuna gəlmədiyi halda, Rəbbin səni müşriklərlə döyüş üçün evindən bayıra çıxardı».(١) Bu döyüşdə müşriklərin minə yaxın döyüşçüsü yaxşı silahlanmış və təchiz olunmuş halda Əbu-Süfyanın başçılığı altında hərb meydanına girmişdilər. Hansı ki, müsəlmanlar yalnız üç yüz on üç nəfər idi. Onların çoxu silahsız idi. Düşmən yeyin atlara süvar olduğu halda müsəlmanların cəmi yetmiş dəvəsi və bir neçə atı vardı. Bir sözlə, hicri ikinci ildə, ramazan ayının on yeddisində bu iki qrup Məkkə və Mədinə arasında yerləşən «Bədr» adlı quyunun kənarında üz-üzə gəldilər. Allah-təala mö’minlərə öz mələkləri ilə yardım göstərdi. Qur’anda oxuyuruq: «Həqiqətən, siz Bədrdə az və zəif olduğunuz halda, Allah sizə yardım etdi».(٢) Əvvəlcə

۱- [۲۴] «Әнфал» сурәси, ајә ۵.

۲- [۲۵] «Али-Имран» сурәси, ајә ۱۲۳.

müşriklərdən üç nəfər Ütbə, Şeybə və Vəlid ibn Ütbə meydana çıxıb qarşı tərəfdən mübariz istədi. Həzrət Peyğəmbərin göstərişi ilə müsəlmanlar tərəfdən Əli, Peyğəmbərin əmisi Həmzə və Übeydə ibn Haris ibn Əbdül-Müttəlib düşmənlə savaş üçün meydana daxil oldu. Həzrət Əli (ə) Vəlidlə üzbəüz gəlib onu qətlə yetirdikdən sonra yoldaşlarının da köməyinə çatdı. Düşmənin hər üç cəngavərinin həyatına son qoyuldu. Öz qəhrəmanlarının qətlə yetirildiyini görən müşriklər qorxuya düşdülər. Sonradan düşmən tərəfindən kim meydana çıxdısa, həzrət Əlinin (ə) qılıncını ağuşuna almalı oldu. Həzrət Əlinin (ə) qəhrəmanlıqları sayəsində Bədr döyüşü müsəlmanların qələbəsi ilə başa çatdı. Düşmənin yetmişdən çox döyüşçüsü qətlə yetirildi, yetmişdən çoxu isə əsir alındı. Abbas ibn Əbdül-Müttəlib və Əqil ibn Əbu-Talib də əsirlər arasında idi. Onlar fidyə verməklə azad oldular və İslamı qəbul etdilər. Tarixçilərin yazdığına görə düşmənlərin yarıdan çoxu həzrət Əlinin (ə) qılıncı ilə dünyasını dəyişmişdi. Həzrətin qətlə yetirdiyi düşmənlər arasında As ibn Səid, Hənzələ ibn Əbu Süfyan, (Uməyr ibn Osman kimi Qüreyş başçıları vardı.(١

Nəhayət, müharibə müsəlmanların xeyirinə və müşriklərin məğlubiyyəti ilə başa çatdı. Müsəlmanlar Mədinəyə qələbə ilə döndülər. Əlinin (ə) adı misilsiz bir şücaətə malik şəxs kimi dildən dilə gəzdi. Onunla düşmənçilik etmək hətta düşüncələrdən də .ötüşmürdü

**ÜHÜD SAVAŞI**

Ühüd Mədinənin təqribən ۶ kilometrliyində yerləşən böyük və məşhur dağın adıdır. Ühüd savaşı hicri ۳-cü ildə, şəvval ayında Ühüd dağının ətəyində baş verdi. Qüreyşin hörmət-izzətinin aradan getməsi ilə nəticələnmiş Bədr məğlubiyyəti yeni bir döyüş üçün şərait yaratmışdı. Çünki Bədrdə qətlə yetirilənlərin ailələri, Əkrəmə ibn Əbu-Cəhl, Səfvan ibn Üməyyə kimiləri hələ də Məkkədə əzadarlıq içində idilər. İntiqam hissi ilə alışıb yanan bu adamlar Məkkə camaatını müsəlmanlarla döyüşə təhrik edirdilər. Qüreyş kafirlərinə başçılıq edən Əbu-Süfyan ibn Hərb xalqı ətrafına toplayıb onları müharibəyə səsləyirdi. O hətta öz var-dövlətini bu müharibəyə sərf etmək üçün

(hazrılığını bildirirdi.(1)

Ütbənin qızı və Əbu Süfyanın arvadı Hind bir qrup başqa qadınlarla yanaşı xalqı Bədrdə öldürənlərin qanını almağa çağırırdı. Bu yolla Əbu-Süfyan beş min süvari toplayıb .onları silahlandırdı və Mədinəyə üz tutdu

Bu məsələdən xəbər tutan Peyğəmbər dərhal səhabələrini toplayıb əhvalatı onlara danışdı. Həzrət bildirdi ki, şəhərdə qalıb müdafiə olunmaq lazımdır. Amma bə'ziləri düşmənlə şəhərdən kənarda savaşmaq, hətta onlara hücum etmək əzmində idilər. Nəhayət, müsəlmanlar döyüşə hazır oldular. Həzrət Peyğəmbər (s) şəxsən özü döyüş libası geydi və yeddi yüzə yaxın döyüşçü ilə birlikdə savaşa hazır oldu. Həzrət Peyğəmbər (s) Əlini (ə) bayraqdar tə'yin etdi. Həzrət Ühüdə çatdıqda qəfil və arxadan hücumların qarşısını almaq üçün əlliyə yaxın döyüşçünü Əbdüllah ibn Cubəyrin başçılığı altında münasib bir mövqedə gizlədi. Bunu öncədən görməsi çox düzgün bir qərar idi. Çünki Əbu-Süfyan da Xalid ibn Vəlidi Əbdüllahın dəstəsindən dörd qat artıq qüvvə ilə pusquda qoymuşdu. Pusquda duran dəstə qoşunlar vuruşa başladığı vaxt arxadan .müsəlmanlara hücum etməli idi

Döyüş başladı və Qüreyş döyüşçülərinin çoxu həzrət Əlinin (ə) qılıncı ilə dünyasını dəyişdi. Əbu-Süfyanın bayraqdarı Təlhə ibn Əbu Təlhə olduqca güclü bir adam idi və ona Nəbşul-Kəsibə (döyüşçülərin qoçu) deyirdilər. Bu şəxs həzrət Əli (ə) ilə qarşı-qarşıya çıxdı. Həzrət Əli (ə) onun başından elə bir zərbə vurdu ki, gözləri hədəqəsindən çıxdı. Təlhə nərə çəkib həlak oldu. Sonra müşriklərin bayrağını Təlhənin qardaşı götürdü. O da öldürüldü. Həzrət Peyğəmbərin əmisi Həmzə də öz növbəsində böyük rəşadətlə vuruşur, sıraları pərən-pərən salırdı. Qüreyş döyüşçülərinin ardıcıl qətlə yetirilməsi düşmən qoşununda çaxnaşma saldı. Müsəlmanlar düşməndən çox-çox az olmalarına baxmayaraq onlara qalib gəldilər. Müşriklər qaçmağa üz tutdular. Müsəlmanlardan bir qrupu düşməni izləyir, digər bir qrupu isə meydandan qənimət .toplayırdı

Bu vaxt həzrət Peyğəmbərin (s) pusquda qoyduğu dəstə onun göstərişinə zidd olaraq Əbdüllahın əmrindən çıxdı və döyüşün başa çatdığını güman edib öz mövqelərini boş .qoydu

Belə bir fürsət gözləyən Xalid ibn Vəlid öz süvariləri ilə müsəlmanların pusqusuna hücum edib orada qalan bir neçə nəfəri qətlə yetirdi. Daha sonra düşmənin bu dəstəsi müsəlmanlara arxadan hücum etdi. Qaçmaqda olan Qüreyşilər Xalidin sədasını eşidib yenidən döyüş meydanına döndülər. Müsəlmanlar iki tərəfdən hücuma mə’ruz qaldı. Onlar sayca az olduqlarından və araya təfriqə düşdüyündən əldə olunmuş qələbəni qoruyub saxlaya bilmədilər. Bir sözlə, müsəlmanlar qaçmağa üz tutdu. Döyüşdə Peyğəmbərin (s) əmisi Həmzə şəhadətə çatdı. Əbu-Süfyanın arvadı, Müaviyənin anası Hindin göstərişi ilə Həmzənin ciyərini bayıra çıxardılar. Həmin məl’un qadın Həmzəyə olan nifrəti səbəbindən onun ciyərlərini dişlərinə salıb gəmirməyə başladı. Həmin gündən Hində «ciyəryeyən» adı verildi. Bu döyüşdə həzrət Peyğəmbər özü başından yaralandı, dişi sındı. Həmin döyüşdə həzrət Əli (ə) və başqa iki nəfərdən savay həzrəti .qoruyan yox idi

Həzrət Əli (ə) müşriklərin Peyğəmbərə (s) hücumlarının qarşısını şir tək alır, onları pərən-pərən salırdı. Pərvanə şəm’in başında dolandığı tək həzrət Əli (ə) də .Peyğəmbərin (s) ətrafında dövrə vururdu

Əlinin (ə) Ühüd döyüşündəki fədakarlığı onun həyat tarixçəsində parlaq bir səhifədir. Bu səhifənin qızılı sətirlərindən Cəbrailin Əli haqqındakı nidaları ucalır: «Zülfüqardan (başqa qılınc, Əlidən başqa kişi yoxdur».(١

Şeyx Müfid Əkrimədən, o da öz növbəsində Əlidən (ə) belə nəql edir ki, həzrət buyurmuşdur: «Ühüd savaşında həzrət Peyğəmbərin (s) ətrafındakı adamlar qaçdılar. Özümdə həmin vaxtadək hiss etmədiyim bir hal gördüm. Onun qarşısında dayanıb qılınc çalırdım. Bir dəfə geri çevriləndə onu görmədim. Öz-özümə dedim ki, Peyğəmbər (s) qaçmaz. Onu öldürülənlər arasında da tapmadım. Mənə elə gəldi ki, o bizim aramızdan səmaya qalxıb. Qılıncımın qının sındırıb özümə dedim ki, Peyğəmbərin müdafiəsi üçün bu qılıncla öldürülənədək vuruşacam. Düşmənə hücum etdim, onlar mənim qılıncımın qarşısından qaçdılar. Qarşımda açılan yolda həzrət Peyğəmbərin huşsuz halda yerə yıxıldığını gördüm. Başının üstündə dayandım. Mübarək gözlərini açdı, mənə tərəf baxıb buyurdu: «Ey Əli, camaat nə etdi?» Ərz etdim ki, ya rəsuləllah, onlar kafir oldular və düşmənə arxa çevirib səni tənha buraxdılar. Həzrət Peyğəmbər ,baxıb

düşmən qoşunundan bir dəstəsinin ona doğru gəldiyini gördü. Mənə buyurdu: «Ya Əli (ə), onları məndən uzaqlaşdır». Mən həmin dəstəyə hücum edib sağa-sola qılınc çaldım. Onlar qaçmağa üz tutdular. Həzrət buyurdu: «Ya Əli (ə), səmadan öz tə'rifini eşidirsənmi? Rizvan adlı mələk nida edir: «La səyfə illa Zulfuqar və la fəta illa Əli». Sevincimdən gözlərim yaşardı və bu ne'mətə görə Allaha şükr etdim.(١)

Əlinin (ə) və bir neçə nəfər başqasının sabitqədəmliyi və dözümü səbəbindən müşriklər gözlərini Mədinədən çəkib Məkkəyə döndülər. Həzrət Əli (ə) özü ağır yaralanmışdı. Bununla belə Peyğəmbəri gözdən qoymurdu. Həzrətin əlini və üzünü yumaq üçün sipərində su hazırladı. Peyğəmbər (s) əl-üzünü yuduqdan sonra buyurdu: «Öz Peyğəmbərinin üzünü qana bulaşdıran qövm Allahın qəzəbinə gəlsin».(٢)

Nəhayət, müharibə qovğası yatdı. Müsəlmanlardan yetmiş nəfər həlak oldu, qalanları qaçdı. Bu döyüşdə öz misilsiz fədakarlıqlarına görə yalnız həzrət Əli (ə) qəhrəman sayıla bilərdi. Həzrətin bədənindəki sarsıdıcı zərbələrin hər biri bir qəhrəmanın qəddini sındıra bilərdi. Həzrətin bədənindəki çoxsaylı yaralar hamını heyrətə salmışdı. Qılıncların doğradığı iyirmi altı yaşlı bu gənc hələ də sağ idi. Əlbəttə ki, həzrəti diri saxlayan onun böyük ruhu və xalis imanı idi. Həzrət bu döyüşün bütün çətinliklərinə razılıqla səbr edirdi.

Həzrət Peyğəmbər (s) Mədinəyə qayıtdı. Həzrət Zəhra əlində bir qab su atasını qarşıladı. Həzrət Əli (ə) isə qolları dirsəyədək qana batmış halda gəlib çatdı. Zülfüqarı Fatiməyə verdi və buyurdu: «Bu gün məni təsdiq etmiş bu qılıncı al».

Götür bu qılıncı saxla Fatimə

Onun günahı yox, mənimsə qorxum.

Çalışdım Peyğəmbər, Allah yolunda,

Əbdud-Dar qanıdır qılıncda baxın.

Həzrət Peyğəmbər (s) Fatiməyə buyurdu: «Ey Fatimə, götür qılıncı, ərin öz borcunu

۱- [۲۹] Шејх Мүфид «Иршад», ۱-чи чилд, ۲-чи баб, ۲۲-чи фәсил, ۶-чы һәдис

۲- [۳۰] «Тарихе-Јәгуби».

əda etdi. Allah-təala onun qılıncı vasitəsi ilə Qüreyş böyüklərini məğlubiyyətə uğratdı».(۱) Bu döyüşdə müsəlmanların məğlubiyyətinin səbəbi kiçik bir intizamsızlıq, həzrət Peyğəmbərin (s) göstərişinə diqqətsizlik oldu. Amma böyük və acı bir təcrübə əldə olunmuşdu. Gələcək üçün bu təcrübə böyük bir ibrət idi. Qur'anda da bu məsələyə işarə olunur: «Siz onları Allahın izni ilə qırdığınız zaman Allah sizə verdiyi və'dinə sadiq çıxdı. Lakin o sevdiyiniz şeyi sizə göstərdiyi vaxt zəiflik büruzə verdiniz və əmr haqqında bir-birinizlə mübahisə edərək Peyğəmbərə qarşı çıxdınız. İçərinizdən bə'ziləri dünyanı, bə'ziləri isə axirəti istəyirdi. Sonra Allah sizi sınamaq üçün geri döndərdi. Əlbəttə, o sizi əfv etdi. Çünki Allah mö'minlərə qarşı mərhəmətlidir».(۲)

Ühüd döyüşü başa çatdıqdan sonra Mədinə əhlinin bəni-Nəzir və bəni-Qurəyzə kimi bə'zi qrupları bu hadisədən xoşhal oldular. Bə'ziləri isə həzrət Peyğəmbərlə dostluq peymanı bağladıqları halda bu peymanları pozdular.

Deməк, Qüreyşlə döyüşdən qabaq Mədinədə əmin-amanlığı və nüfuzu bərpa etmək lazım idi. Yalnız bundan sonra Qüreyşlə mübarizəyə başlamaq olardı. Bu səbəbdən də hicri dördüncü ildə bəni-Nəzirlə döyüşə hazır müsəlmanlar rəbiül-əvvəl ayında Mədinədən bayıra çıxdılar.

E'zam olunmuş qoşunun komandanı həzrət Əli (ə) idi. Həzrət öz rəşadət və şücaəti ilə onları təslim olmağa vadar etdi. Belə bir peyman bağlandı ki, həzrət Peyğəmbər (s) onların qanından keçir, onlar isə Mədinədən çıxaraq Şama gedirlər.(۳)

Həzrət Peyğəmbər bu şərti qəbul edib göstəriş verdi ki, hər üç nəfər bir dəvə və bu bir dəvənin götürəcəyi qədər yük apara bilər. Bəni-Nəzir Mədinədən çıxdıqdan sonra onların qalan yükləri müsəlmanlara nəsib oldu.

Ühüd döyüşündən sonra baş vermiş bu hadisə müsəlmanların mövqelərinin möhkəmlənməsi üçün çox münasib oldu. Həzrət Peyğəmbər (s) itirilmiş nüfuzu böyük məharətlə geri qaytara bildi. Müsəlmanlar daha da qüdrətləndi, din düşmənləri isə zəlalətə düçar oldu.



---

۱- [۳۱] «Кәшфул-Ғәммә» cәh. ۵۴.

۲- [۳۲] «Али-Имран» сурәси, ајә ۱۵۲.

۳- [۳۳] «Тарихе-Тәбәри».

Bəni-Nəzir və bəni-Qurəyzə kimi yəhudi qəbilələrinin Mədinə ətrafından çıxarılması onların müsəlmanlara, xüsusi ilə də həzrət Peyğəmbərə olan kinini daha da artırdı. Həmin qəbilələrin başçılarından neçə nəfəri Məkkəyə gedib Qüreyşlə görüşdü və Peyğəmbərə qarşı hazırlıqlarını bildirdilər. Qüreyş başçıları bu fürsətdən istifadə edib, onların təkliflərini həvəslə qarşıladılar. Beləcə, bütün bütpərəst Məkkə qəbilələri yəhudilərlə əl-ələ verərək hicri ۵-ci ildə ümumi səfərbərlik keçirdilər və on min nəfərə yaxın döyüşçünü Əbu-Süfyanın başçılığı altında Mədinə üzərinə göndərdilər. Bu xəbər həzrət Peyğəmbərə çatan kimi o müsəlmanları bir yerə topladı və müdafiə olunmaq haqqında müzakirələr başladı. Salman Farsi təklif etdi ki, Mədinə ətrafında xəndək qazılsın. Bu təklifə əsasən düşmən qarşısında onların hərəkətinin qarşısını alası sün'i maneələr düzəldilməli idi. Həzrət Peyğəmbər Salmanın təklifini qəbul etdi. Göstəriş verildi ki, dərhal xəndək qazılmasına başlanılsın. Müsəlmanlar xəndək qazmağa başladılar. Həzrət özü də digər müsəlmanlarla çiyin-çiyinə bu işlə məşğul idi. Düşmən qoşunu çatmamışdan qabaq xəndək qazılıb hazırlandı. Müşriklər xəndəyə yaxınlaşdıqları vaxt təəccübdən yerlərində donub qaldılar. Çünki ərəbistanda həmin vaxtadək bu sayaq müdafiə sistemi görünməmişdi. Qüreyş başçıları qarşılarında açılmış səhnəni müşahidə edib dedilər: «And olsun Allaha, bu ərəb hiyləsi deyil».(۱)

Sayı üç minə çatan müsəlmanlar xəndək ətrafında mövqe tutmuşdular. Qoşunlar bir neçə gün xəndək ətrafında üzbəüz dayandılar. Bə'zən bir-birlərinə daş və ox atırdılar. Nəhayət, Qüreyş cəngavərlərindən olan Əmr ibn Əbdüvəd və bir neçə başqa döyüşçü xəndəyin dar hissəsindən adlayıb keçə bildilər.

Əmr xəndəyi keçən kimi döyüşmək üçün mübariz istədi. Əmrin qorxunc nərəsi fəzada yayılan kimi ürəklərə titrətmə düşdü, rənglər bəyazıdı. Nə üçün?

Çünki Əmri hamı tanıyırdı. Bu şəxs ərəbin adlı-sanlı qəhrəmanlarından idi. Bütün Ərəbistanda onun qarşısına çıxan yoxdu. Əmr təklikdə min döyüşçüyə bərabər sayılırdı.

Əmrin mübariz çağırışı ikinci dəfə müsəlmanların qulağında uğuldadı. Bu məqamda Mədinə qoşununa qorxu dolu bir sükut hakim olmuşdu. Kimsə səsini çıxarmağa cür’ət etmirdi. Əmr deyirdi: «Deyirsiniz ki, sizlərdən kim öldürülsə behiştə gedəcək. Məgər «?aranızda behiştə getmək istəyən yoxdurmu

Nəhayət, həzrət Peyğəmbər (s) sükutu pozdu və buyurdu: «Bu bütpərəstin şərini İslam ümmətinin üzərindən kim götürə bilər?» Hamı nəfəsini içinə çəkib durmuşdu. Kimsədən səs çıxmırdı. Bu vaxt həzrət Əli (ə) ayağa qalxdı və ərz etdi: «Mən, ya rəsuləllah!» Peyğəmbər (s) buyurdu: «Səbr et, olsun ki, başqa bir könüllü də tapıla. Amma kimsə bu ərəb qəhrəmanı ilə üzbəüz gəlmək istəmirdi. Həzrət Peyğəmbər (s) öz sualını bir daha təkrar etdi. Yenə də onun çağırışına yalnız həzrət Əli (ə) cavab verdi. Peyğəmbər (s) buyurdu: «Ya Əli, bu şəxs Əmr ibn Əbdüvəddir». Həzrət Əli (ə) ərz etdi: «Mən də Əli ibn Əbu-Talibəm». Həzrət Peyğəmbər (s) Əlinin (ə) başına əmmamə qoydu, kəmərinə qılınc bağladı və buyurdu: «Get Allah səni qorusun». Sonra başını qaldırıb riqqətlə dedi: .««Pərvərdigara, bu döyüş meydanında əmim oğlunu tənha qoyma

Əmr rəcəz oxuyaraq müsəlmanları döyüşə çağırırdı. Bu vaxt həzrət Əli (ə) pusqudan ovunun üstünə sıçrayan qəzəbli şir tək sür’ətlə Əmrə doğru hərəkət etdi. Həzrət .düşmənin rəcəzinə ədəblə cavab verdi

Özünü adlı-sanlı ərəb qəhrəmanı sayan Əmr həzrət Əliyə (ə) həqarətlə baxdı və dedi: «Məgər səndən başqa behişt istəyən yoxdur? Mən sənin atan Əbu-Taliblə dost idim. Səni əlimdə qanadları qırılmış quş tək çırpınan görmək istəmirəm. Məgər bilmirsənmi «!?ki, mən Əmr ibn Əbdüvəd, böyük ərəb qəhrəmanıyam

Həzrət Əli (ə) buyurdu: «Mən səni əvvəlcə tövhid və İslama də’vət edirəm. Əgər bunu .«qəbul etmirsənsə, gəldiyin yolla da qayıt, Peyğəmbərlə döyüşdən çəkin

Əmr dedi: «Mən öz ata-babamın yolundan (bütpərəstlikdən) əl götürmərəm. Əgər döyüşsüz geri qayıtsam, Qüreyş qadınları mənə istehza edər». Həzrət Əli (ə) buyurdu: .««Onda atdan düş, vuruşaq. Mən səni Allah yolunda öldürmək istəyindəyəm

Əmr qəzəbləndi və atdan düşdü. Əli ilə üzbəüz dayananda həzrət Peyğəmbər .«buyurdu: «İman və küfr tam halda mübarizəyə qalxmışdır

Doğrudan da, belə idi. Həzrət Əli (ə) imanın özü, bəlkə bütünlüklə iman idi. Əgər həmin gün həzrət Əli (ə) olmasaydı, İslamdan ad qalmazdı. Əmr də şirk və küfrün .nümayəndəsi, Qüreyşin gözünün işığı sayılırdı

Nəhayət, bu iki mübariz bir-birinə elə hücum etdi ki, toz-duman havaya qalxdı. Ətrafdakılar onları aydın görə bilmirdi. Əmrin zərbəsi həzrət Əlinin (ə) sipərini ikiyə böldü. Həzrətin başı da yaralanmışdı. Amma Əlinin (ə) cavab zərbəsi Əmrin həyatına son qoydu. Həzrətin təkbir səsi göyə ucaldı. Əlinin təkbir sədasından mə'lum oldu ki, Əmr öldürülmüşdür. Əmrin ölümü isə Qüreyşin qəti məğlubiyyəti demək idi. Əmr ibn :Əbdüvədin bacısı bu döyüş haqqında belə bir şe'r oxumuşdur

,İki şir döyüşdü, hər biri taysız

.Sanki buludlardan zərbə yağırdı

,Ey Əli, beləsin yendirməmişdin

.Əlbət ki, bu uğur başqa uğurdu

Qüreyş öz qəhrəmanının məğlubiyyətindən sonra xar oldu. Bu məğlubiyyət onları rüsvay etdi. Həzrət Əli (ə) Əmrin başını Peyğəmbərin hüzuruna gətirdiyi vaxt Peyğəmbər (s) buyurdu: «Xəndək günü Əlinin (ə) zərbəsi səqələynin ibadətindən əfzəldir». Bə'ziləri isə Peyğəmbərin belə buyurduğunu nəql edirlər: «Xəndək günü Əlinin .«Əmrə vurduğu qılıncın mükafatı cin və insin ibadət mükafatından üstündür

Bəli, düşmənin ən e'tibarlı sütununu Əlinin (ə) qılıncı qırdı. Beləcə, növrəstə İslam müşriklərin şərindən xilas oldu. Həmin gün həzrət Əli (ə) olmasaydı, bütün müsəlmanları pərən-pərən salmaq üçün təkcə Əmr kifayət edərdi. O özü deyirdi ki, İslamı tarixin səhifəsindən çıxarasıdır. Bəli, qiyamət gününədək İslamın mövcudluğu xəndəyi adlamış Əmr və onun yoldaşlarını dizə çökürən zərbənin girovundadır. Əmrin və onun yoldaşlarının qətlə yetirilməsi ilə müşriklərin döyüş ruhiyyəsi qırıldı və aralarında qorxu hakim oldu. Bundan əlavə, Allahın əmri ilə güclü bir tufan qopdu və dəhşətə düşmüş Qüreyş Əbu-Süfyanın əmri ilə yubanmadan Mədinəni tərk edib .Məkkəyə üz tutdu

Xəndək döyüşündən sonra həzrət Peyğəmbər əhdi sındırıb müşriklərlə həmkarlıq etmiş bəni-Qürəyzə tayfasını tənbeh etmək qərarına gəldi. Bu

tayfa zahirdə müsəlmanlarla peyman bağlayır, əslində isə Qüreyşlə həmkarlıq edirdi. Həzrət Peyğəmbər (s) onlarla döyüşə Əlini (ə) göndərdi. İyirmi beş günlük mühasirə və vuruşdan sonra bəni-Qürəyzə tayfasının fitnəkarlığına son qoyuldu. Müsəlmanlar .Mədinə ətrafındakı yəhudilərin şərindən xilas oldular

## XEYBƏR DÖYÜŞÜ

Xeybər kəlməsi qala, möhkəm hasar deməkdir. Mədinədən ۱۲۰ kilometr şimalda yəhudilərin sakin olduğu bir məntəqə vardı. Buranın sakinləri bir neçə möhkəm qalada yaşayırdılar. Ona görə də bu yer Xeybər adlandırılırdı. Onların əkin sahələri, xurma bağları, çeşmələri və yeddi möhkəm qalaları vardı. Bu qalaların hər birinin öz adı vardı. .Bu yeddi qüllədən ən məşhuru «Naim» və «Qəmus» idi

Tarixçilərin bildirdiyinə görə Xeybər əhalisinin sayı dörd minlə iyirmi min arasında olmuşdur. Bir şey qətidir ki, yəhudilər müsəlmanlardan bir neçə dəfə artıq olmuşlar. .Çünki həmin dövrdə müsəlmanların sayı min altı yüzü keçmirdi

Hicri yeddinci ildə həzrət Peyğəmbərin (s) göstərişi ilə müsəlmanlar Xeybərə doğru hərəkət etdilər. İki-üç gün yol getdikdən sonra Xeybər ərazisinə çatdılar. Qala kənarında düşərgə qurub, düşmənlə danışığa başladılar. Səhəri gün yuxudan oyanan qala sakinləri müsəlmanları Xeybər ətrafında gördülər. Onlar müsəlman qoşunun qorxusundan qalaların qapılarını bağladılar. Həzrət Peyğəmbər iyirmi beş gün müddətində qalanı mühasirədə saxladı. Həzrət qalanın qapısının açılması üçün birinci dəfə bayrağı Əbu-Bəkrə, ikinci dəfə isə Ömərə verdi. Amma onlar yəhudilərlə döyüşə (tab gətirməyib geri çəkildilər».(۱

:İbn Əbil-Hədid Əbu-Bəkr və Ömərin meydandan qaçması haqqında belə deyir

,Hər nəyi unutsam, unutmaram mən

.Qaçmaq günah ikən qaçdız səhnədən



---

.Иршад» ۱-чи чилд, ۲-чи баб, ۱۶-чы фәсил» [۳۵] -۱

Xeybər qalasının fəthi üçün başqa cəngavərlər də göndərildi. Amma yəhudi döyüşçüləri ilə kimsə bacara bilmədi. Belə uğursuzluqlar nəticəsində müsəlmanların ruhdan düşdüyünü görən Peyğəmbər buyurdu: «Sabah bayrağı bir şəxsə verəcəyəm ki, Allah və Peyğəmbəri (s) onu dost tutur, o da Allah və Onun Peyğəmbərini dost bilir. O bir kəsdir ki, həmişə hücum etmişdir və Allah onun əli ilə açılış etməyincə döyüş meydanından qaçmamışdır». Həzrət Peyğəmbərin bu sözləri hamını təəccübləndirdi. ?Görən sabah qələbə çalacaq kəs kim idi

Əlinin (ə) misilsiz qəhrəmanlığı hamıya mə’lum olduğu halda, əfsus ki, çoxları özü haqqında danışıldığını güman edirdi. Amma bir nöqtəni də qeyd etmək lazım gəlir ki, həmin vaxt həzrət Əlinin (ə) gözləri ağır xəstəliyə yoluxduğundan onun bu döyüşdə meydana çıxacağı ehtimal olunmurdu. Bu baxımdan Peyğəmbərin həzrət Əli (ə) .haqqında danışdığını anlamayanları üzürlü hesab etmək olar

Nəhayət, və’d olunmuş gün gəlib çatdı. Həzrət Peyğəmbər (s) buyurdu: «Əli haradadır?» Ərz etdilər ki, Əlinin (ə) gözləri ağrıyır. Həzrət buyurdu: «Onu buraya gətirin». .Müsəlmanlar Əlinin (ə) çadırına gedib, Peyğəmbərin əmrini ona çatdırdılar

Həzrət Əli (ə) dərhal yerindən qalxdı və həzrətin xidmətinə tələsdi. Həzrət Peyğəmbər (s) Əlidən (ə) halını soruşdu. Əli (ə) bildirdi ki, başım və gözlərim ağrıyır. Həzrət Peyğəmbər onu qucaqladı və ağzının mübarək suyundan Əlinin (ə) gözlərinə çəkdi. Həzrət Əli (ə) özündə dərhal bir yüngüllük hiss etdi və ömrünün sonunadək başağrısı və gözağrısı görmədi. Həzrət Peyğəmbər (s) buyurdu: «Ya Əli, bizim komandanların əlindən bir iş gəlmədi. Hələ də Xeybər qalası fəth olunmamışdır. Bu iş yalnız sənin əlinlə həyata keçəsidir». Həzrət Əli (ə) yəhudilərlə nə vaxtadək döyüşmək lazım gəldiyi barədə soruşdu. Peyğəmbər (s) buyurdu: «Allahın birliyini və mənim peyğəmbərliyimi .«təsdiq edənədək vuruş

Həzrət Əli (ə) ovuna qarşı arxayınlıqla hərəkət edən şir tək Xeybər qalasının divarlarına yaxınlaşdı. Bayrağı yerə sancdı. Öz adamlarını divarların fəthi üçün hazırladı. Bu vaxt Xeybərin şücaətli döyüşçülərindən bir qrupu çıxıb həzrət Əli (ə) və onun dəstəsinin üzərinə hücum etdi. Şiddətli döyüş

başladı. Həzrət bir neçə hücumla yəhudiləri qaçmağa məcbur etdi. Düşmən döyüşçüləri özlərini qalaya çatdırıb qapıları bağladılar. Şücaəti ilə tanınan qala rəisi Haris Əlinin (ə) qalaya daxil olmasının qarşısını almaq istədi. Amma həzrət bir zərbə ilə onun həyatına son qoydu. Bu vaxt Harisin qardaşı, qalanın ən adlı-sanlı döyüşçüsü .Mərhəb Xeybəri qardaşının qanını almaq üçün meydana atıldı

Mərhəb qəribə bir pəhləvan idi. O iki zireh geyinər və bir neçə əmmamənin üzərindən polad dəbilqə qoyardı. Dəbilqədə dəyirman daşına oxşar daşı yerləşdirdiyindən qılınc .zərbələri onun başına tə’sir etməzdi

Bu şəxs ilə Əli arasındakı döyüşdə İslam qəhrəmanının onun başına enən zərbəsi bütün zirehləri yarıb başını ikiyə böldü. Mərhəb yerə yıxılıb qanına qəltan oldu. Müsəlmanların təkbir sədası göyə ucaldı. Yəhudilər qəti məğlubiyyətə uğrayıb qəm dəryasında batdılar. Mərhəb qətlə yetirildikdən sonra qaladan başqa bir döyüşçü çıxdı. Bu şəxs əvvəl öldürülənlərin üçüncü qardaşı Yasər idi. O da şücaətdə qardaşlarından geri qalmazdı. Yasər yubanmadan Əliyə hücum etdi. Amma həzrətin bir zərbəsi ilə yerə yıxılıb canını tapşırdı. Yəhudilər bu dəfə qalanın qapılarını bağlamağa məcbur .oldular

Həzrət Əli (ə) öz fövqəl’adə qüvvəsi ilə qalanın qapılarını tərpədib kənara atdı. Beləliklə, Xeybərin ən möhkəm iki qalası fəth edildi. Şeyx Müfid Əbdüllah Cədəlidən belə nəql edir. Əmirəl-mö’minin (ə) deyirdi: «Xeybərin qapısını çıxardıqdan sonra onu özümə sipər edib yəhudilərlə döyüşdüm. Onları məğlub etdikdən sonra qapını qala ətrafında qazılmış xəndəyin üzərinə qoyub onun üzərindən keçdim. Müsəlmanlar da xəndəyi adladılar. Geri qayıdan zaman həmin qapını yetmiş müsəlman güclə qaldırdı. :Şair bu barədə yazır

Yəhudla amansız savaş zamanı

.Qaldırdı Xeybərin ağır qapısın

Qapını qaytaran yetmiş kişinin

.Hamı aşkar gördü işdə cəfasın

Xeybər döyüşündə həzrətin savaşı, qalaların fəthi, adlı-sanlı yəhudi döyüşçülərinin məğlub edilməsi, xüsusi ilə qala darvazasının həzrət tərəfindən

səh:۳۶

çıxarılıb atılması bir daha sübut edir ki, kimsədə belə bir hünər görünməmişdir. Uyğun :hadisə haqqında bir çox qəsidələr qoşulmuşdur. İbn Əbil-Hədid bir qəsidədə deyir

Qırx dörd əlin aça bilmədiyini

.Ey qoparıb atan qəhrəman Əli

Xeybər döyüşü başa çatdıqdan sonra həzrət Peyğəmbər yəhudilərin istəyi ilə onlarla sülh bağladı. Fədək müsəlmanlara verildi və orada sakin olan yəhudilər öz var-dövlətlərinin yarısını Peyğəmbərə göndərdilər. Fədək yalnız sülh bağlandığı vaxt heç bir tələb olmadan yəhudilərin razılığı ilə həzrət Peyğəmbərə bağışlandı. Ona görə də Fədək Peyğəmbərin özünə, qalan bütün qənimətlər isə müsəlmanlara çatdı. Xeybərdən geri dönərkən itaətsizlik göstərən bə'zi yəhudi qəbilələri də tənbeh olundu. Onlar da müsəlmanlara boyun əyməyə məcbur oldular. Beləcə, müsəlmanlar .yəhudilərin fitnələrindən xilas oldular və Mədinə şəhərində əmin-amanlıq bərpa edildi

## MƏKKƏNİN FƏTHİ

İslam ordusu müxtəlif kiçik və böyük döyüşlərdə sınaqdan keçdikdən, say baxımından böyüdükdən sonra hicri səkkizinci ildə həzrət Peyğəmbər Məkkəyə doğru hərəkət edib, anadan olduğu və Qüreyşin işgəncələri ilə hicrətə məcbur edildiyi şəhəri tabe .etmək qərarına gəldi

Həzrət Peyğəmbər (s) Məkkədə olduğu on üç il ərzində Qüreyş müşriklərini tövhid və allahpərəstliyə də'vət etdi. Nəinki bu də'vətlərdən müsbət nəticə hasil olmadı, hətta doğru yola də'vət edilənlər həzrət Peyğəmbərə (s) olmazın əziyyətlərini verdilər. Həzrət Peyğəmbərin hicrətdə olduğu bütün dövr ərzində Məkkə müşrikləri müsəlmanlarla qarşıdurma vəziyyətində oldular. Bir vaxt Məkkədən qorxu içində çıxmış mühacir müsəlmanlar indi qüdrət və əzəmətlə Məkkəyə doğru hərəkət edirdilər. Artıq həzrət Peyğəmbərin arxasınca qalib vəziyyətdə Məkkəyə daxil olmaq .vaxtı çatmışdı

Bə'zi müsəlmanlar dərin fikrə gedib işin sonundan qorxsalar da, həzrət Peyğəmbər (s) onları qələbə ilə müjdələyirdi. Çünki Allah-təala

Peyğəmbərinə göndərdiyi ayədə qələbə və'd etmişdi: «And olsun ki, Allah-təala öz Peyğəmbərinin rö'yasının çin olduğunu təsdiq etdi. Siz, inşaallah, əmin-amanlıq içində, başınızı qırxdırmış, saçınızı qısaltmış halda və qorxmadan Məscidül-hərama daxil olacaqsınız. Allah sizin bimədiklərinizi bilir. O bundan əlavə, tezliklə bir qələbə də bəxş edəcəkdir».(١) Məkkənin fəthindən qabaq nazil olmuş «Nəsr» surəsində də Məkkənin fəthi və həmin şəhər əhlinin müsəlman olması haqqında mə'lumat verilir.

Həzrət Peyğəmbərin (s) əsil məqsədi bu idi ki, Məkkənin fəthi Allah evinə hörmət əlaməti olaraq döyüşsüz və qansız həyata keçsin. Ona görə də Həzrət (s) hərəkət vaxtını hamıdan gizli saxlayırdı. O bu işdə yalnız həzrət Əli (ə) ilə məsləhətləşmişdi. Çünki Qüreyş bu işdən xəbər tutsaydı, işin gedişi başqa cür ola bilərdi. Bir qədər sonra səhabələrdən də bir neçəsi məsələdən xəbər tutdu. Hatəb adlı mühacir Məkkədə qohum-əqrəbası olduğundan Peyğəmbərin məqsədi haqqında Qüreyş müşriklərinə məktubla mə'lumat verməк istədi. O bu məktubu bir qadın vasitəsi ilə Məkkəyə göndərdi.

Allah-təala öz Peyğəmbərini bu məsələdən xəbərdar etdi. Həzrət Peyğəmbər (s) həzrət Əli (ə) və Zübeyri qadının arxasınca göndərdi. Onlar qadına çatıb məktubu ondan aldılar.(٢)

Həzrət Peyğəmbər hicri səkkizinci il, ramazan ayının əvvəllərində mühacir və ənsardan təşkil olunmuş on iki min nəfərlik ordusu ilə Mədinədən çıxdı. Peyğəmbər öz qoşunu ilə Məkkə yaxınlığına çatdığı vaxt Abbas ibn Əbdül-Müttəlib Qüreyşləri İslam ordusunun çoxluğu və təchizatı ilə qorxutmaq üçün Məkkəyə tələsdi. Məkkə əhalisi Peyğəmbərin gəlişindən qismən də olsa xəbərdar idi. Bu səbəbdən də Əbu-Süfyan daha çox mə'lumat toplamaq üçün Məkkədən çıxdı və yolda Abbasla rastlaşdı.

Abbas ibn Əbdül-Müttəlib müsəlmanların çoxluğunu və yüksək döyüş əzmini Əbu-Süfyana nəql etdi. Abbas bu işin acı nəticəsini Əbu-Süfyanın nəzərinə çatdırıb onu təslim olmağa razı saldı.

Əbu-Süfyan çarəsizlik ucbatından bu təkliflə razılaşdı və Abbasın himayəsində əzəmətli İslam qoşununun arasından keçib Peyğəmbərin səh:٣٨

.xidmətinə getdi. Bir qədər söhbətdən sonra Əbu-Süfyan İslamı qəbul etdi

Əbu-Süfyan iyirmi bir il müddətində Qüreyş kafirlərini Peyğəmbərə qarşı təhrik etmişdi. İndi isə İslamın əzəməti qarşısında təslim olurdu. O nizamlı və qüdrətli İslam .ordusunu heyranlıqla seyr edirdi. O öz keçmişinə görə bağışlanacağı intizarında idi

Qur'ni-Kərimin bildirdiyi kimi həzrət Peyğəmbər (s) böyük mərhəmət sahibi idi. Həzrət (s) Əbu-Süfyanı Məkkəyə göndərdi və bildirdi ki, İslamı qəbul edənlər amanda .qalacaq

Peyğəmbər (s) əvvəlcə bayrağı Sə'd ibn İbadəyə vermişdi. Amma sonradan Sə'din Məkkə əhli ilə sərt davranacağını nəzərə alaraq bayrağı ondan alıb Əliyə (ə) verdi. Müsəlman qoşunu böyük əzəmət içində Məkkəyə daxil oldu. Həzrət Peyğəmbər (s) Məkkənin qapısı qarşısında dayandı və dedi: «La ilahə İlləllah, Vəhdəhu Vəhdəh, Sədəqə və'dəhu və Nəsərə Əbdəhu». Bu tövhid, allahpərəstlik şüarlarının Məkkədə aşkar səsləndiyi ilk gün idi. Həmin gün Bilalın azan nidası Kə'bənin üstündən Məkkə fəzasını bürüdü. Müsəlmanlar həzrət Peyğəmbərə iqtida edib namaz qıldılar. Sonra həzrət cəza və intiqam gözləyən Məkkə əhlinə üz tutaraq buyurdu: «Özünüz haqqında nə deyirsiniz və nə güman edirsiniz?» Dedilər: «Sözümüz yaxşılığadır, yaxşılıq ümidindəyik. Kərimin qardaşı və Kərimin qardaşı oğlusan. Bizim üzərimizdə qüdrətə çatmısan». Həzrət Peyğəmbər onların bu sözlərindən riqqətə gələrək buyurdu: «Mən (qardaşım Yusifin dediyini deyirəm». Sonra əlavə etdi: «Gedin, hamınız azadsınız».(١)

Bu ümumi əfv Məkkə əhlinin ruhiyyəsində yaxşı tə'sir qoydu. Qəlblərdə ixtiyarsız olaraq həzrətə məhəbbət yarandı. Sonra Peyğəmbər bütün bütlərin qırılması haqqında göstəriş verdi. Əli ilə birlikdə Kə'bəyə daxil oldu. Bütün bütlər və bütpərəstlik .əlamətləri məhv edildi. Qırılmış bütlər Kə'bədən bayıra töküldü

Həzrət Əlinin (ə) sifətlərindən biri də bütsındıran olmasıdır. O, xalq arasında bütpərəstlik əlamətlərini müşahidə etməyə dözümsüz idi. Həzrət Peyğəmbərin (s) göstərişi ilə həzrət Əli (ə) Hobəl kimi böyük bütləri aşırıb, müqəddəs Kə'bə məkanını .bütpərəstlik çirkabından təmizlədi

Məkkənin fəthindən sonra şəhər əhli dəstə-dəstə İslamı qəbul edirdi. İslamı yenicə qəbul edənlər Peyğəmbərə bey’ət edirdilər. Həzrət bir müddət Məkkədə qalıb şəhərin işlərini nizama saldı. Şəhərdə əmin-amanlıq bərqərar olduqdan sonra öz qalib ordusu ilə Mədinəyə döndü. Məkkənin İslamı yeni qəbul etmiş əhalisindən iki min nəfəri də İslam ordusuna qatıldı. Beləcə, İslam ordusu daha da əzəmətləndi. Bu qüdrəti müşahidə edən Əbu-Bəkr dedi: «Biz bu qədər döyüşçü ilə heç vaxt məğlub olmayacağıq». Amma onlar bilmirdilər ki, döyüşçülərin çoxluğu bir o qədər də mühüm deyil. Ən əsası Allaha təvəkkül və Allahdan yardım istənilməsidir. Axı Ühüd döyüşündə müsəlmanlar çoxsaylı olmalarına baxmayaraq, meydandan qaçdılar. Əbu-Bəkrdə qaçanların arasında idi. Bəni-Haşimdən yalnız doqquz nəfər və başqa qəbilədən bir nəfər Peyğəmbərin ətrafında qalmışdı. Yalnız Allahın kiçik dəstəyə yardımından sonra qaçanlar geri dönüb düşmənə yenidən həmlə etdilər və qalib gəldilər. Bu barədə Allah-təala Qur’ani-Kərimdə buyurur: «Allah sizə bir çox yerlərdə, eləcə də, Hüneyn günündə kömək etdi. O gün çox olmağınız sizi valeh etsə də, bir faydası olmadı. Gen dünya sizə (dar oldu, sonra dönüb qaçdınız».(١

Һadisə belə baş verdi: həzrət Peyğəmbər Məkkədən Mədinəyə dönmək qərarına gəldiyi vaxt müsəlmanlığı qəbul etməmiş Һəvazən və Səqif qəbilələri əl-ələ verib .müsəlmanlara qarşı çıxmaq fikrinə düşdülər

Bu iki qəbilənin döyüşçüləri Malik ibn Əvfin komandanlığı altında Məkkədən Mədinəyə qayıdası Peyğəmbər qoşununa hücum etmək üçün Hüneyn məntəqəsində pusquda .dayandılar. Onların sayı müsəlmanların sayından çox idi

İslam qoşununun Xalid ibn Vəlidin başçılığı altında öndə gedən hissəsi pusquya düşdü. Gecə yarıdan keçdiyindən və hava tam qaranlıq olduğundan düşmənin qəfil hücumu onları çaşdırdı və geri çəkilərkən aralarında təfriqə yarandı. Əbu-Süfyan və onun əlaltıları kimi İslamı yeni qəbul edənlər qorxuya düşüb qaçmağa başladılar. Bəni-Haşimdən yalnız doqquz nəfər Peyğəmbərin ətrafında qaldı. Həzrət Əli (ə) Peyğəmbərin qarşısında dayanıb düşmənlə vuruşaraq onları həzrətə yaxınlaşmağa ,qoymurdu. Şeyx Müfid yazır ki

bəni-Haşimdən olan digər adamlar Əliyə (ə) arxayın olaraq Peyğəmbərin (ə) ətrafında qalmışdılar. Əlinin (ə) əzmlə döyüşməsi sayəsində qaçanlar da geriyə dönmək (qərarına gəldilər.(1)

Həzrət Peyğəmbər (s) uca səsə malik olan əmisi Abbas ibn Əbdül-Müttəlibə buyurdu: «Mühacir və ənsarı bir yerə toplanmağa də’vət et, təfriqə və pərakəndəliyin qarşısını al». Abbas uca səslə müsəlmanları sakitliyə və bir yerə toplanmağa çağırdı və əlavə etdi ki, həzrət Peyğəmbər (s) sağdır. Onun bu çağırışından sonra qaçanlar yavaş-yavaş geri dönməyə başladılar. Hava getdikcə işıqlanırdı. Bir yerə toplanmış müsəlmanlar düşmənin üzərinə qəti hücuma keçdilər. Həzrət Əli (ə) düşmənlərin qəbilə rəisi və bayraqdarını qılıncdan keçirdi. Bundan sonra düşmən sıralarına pərakəndəlik düşdü. Qaçanları müsəlmanlar tə’qib edirdilər. Bir sözlə, düşmənin bir .hissəsi öldürüldü, digər hissəsi əsir alındı

Hüneyn döyüşü başa çatdıqdan sonra müsəlmanlar Taifə üz tutdular. Çünki Səqif qəbiləsi Taifdə məskunlaşmışdı və Peyğəmbərin (s) həmin məntəqəyə göndərdiyi Əbu-Süfyan ibn Haris orada müvəffəq ola bilməmişdi. Ona görə də həzrət özü Taifə .getdi və oranı mühasirəyə aldı. Taifin mühasirəsi iyirmi gündən çox çəkdi

Həzrət Peyğəmbər Taif ətrafındakı bütlərin sındırılmasını Əliyə (ə) tapşırdı. Həzrət Əli (ə) həzrət Peyğəmbərin bu əmrini yerinə yetirərkən Xəs’əm qəbiləsinin cəngavərlərindən olan Şəhabı öz qılıncı ilə ikiyə böldü. Beləcə, bütün bütlər məhv edildi. Həmin tayfanın başqa bir qəhrəmanı Nafe ibn Qilan həzrətin (s) qılıncına tuş gəldi. Bir dəstə qılınc qorxusundan İslamı qəbul etdi, digər bir dəstə isə qaçıb gizləndi. Həzrət Əli (ə) qələbə bayrağı ilə Peyğəmbərin hüzuruna qayıtdı. Bu döyüş də .müsəlmanların qələbəsi ilə başa çatdı

Taif döyüşü müsəlmanların ərəblərlə son daxili döyüşü sayılır. Çünki bu döyüşdən sonra Ərəbistan daxilində Peyğəmbərə qarşı çıxmağa kimsədə cür’ət qalmadı. Bütün Ərəbistan yarımadası həzrət Peyğəmbərin (s) hakimiyyəti altına keçdi. Qarşıda digər ölkələrdə İslamın yayılması vəzifəsi dururdu. Belə bir qərarın müqəddiməsi həzrət Peyğəmbərin (s) iştirak etdiyi son, Təbuk döyüşü oldu. Həzrət Peyğəmbərin (s) göstərişi ilə həzrət Əli (ə) bu

.döyüşdə iştirak etmədi

Həzrət Əlinin (ə) Peyğəmbər dövründəki hərbi xidmətlərindən danışdıq. Həzrətin xidmətləri sayəsində İslam bayrağı göyə ucaldı və müsəlmanlar əksər döyüşlərdən qalib çıxdılar. Həzrət Peyğəmbər buyurmuşdur: «Əgər Əlinin (ə) qılıncı olmasaydı, İslam .«möhkəmlənməzdi

## ƏLİNİN (Ə) İMAMƏTİ HAQQINDA E'TİBARLI SÖZ

Hicrətin onuncu ilində həzrət Peyğəmbər həcc əməllərini yerinə yetirmək üçün Məkkəyə üz tutdu. Həzrət Peyğəmbəri müşayiət edən adamların sayı haqqında müxtəlif rəqəmlər göstərilmişdir. Amma qəti şəkildə demək olar ki, bu səfərdə həzrəti bir neçə mindən çox müsəlman müşayiət edirdi. «Həccətul-vida» adı ilə məşhur olan bu həcc mərasimində Peyğəmbərlə gəlmiş xeyli müsəlman iştirak edirdi. Həzrət Peyğəmbər həcc əməllərini başa vurub Mədinəyə qayıdarkən zil-həccənin on səkkizinci günü Qədir-Xum adlanan məntəqədə dayandı. Çünki ona çox mühüm bir vəhy nazil olmuşdu. Bu vəhy bütün xalqa e'lan edilməli idi. Həzrət Peyğəmbər Allah-təalanın əmri ilə Əlinin (ə) vilayət və xilafətini xalqa bildirməli idi. Ayədə buyururdu: «Ya Peyğəmbər, Rəbbin tərəfindən sənə nazil olanı xalqa çatdır. Əgər bunu etməsən, Allahın risalətini yerinə yetirməmiş olarsan. Allah səni insanların şərindən (qoruyacaq».(۱

Həzrət Peyğəmbər (s) göstəriş verdi ki, bütün hacılar bir yerə toplansınlar. Qabaqda ?gedənlər dayandı və arxada gedənlərin gəlib çatmasını gözlədi. Axı nə baş vermişdi

Hamı bir-birindən nə baş verdiyi barədə soruşurdu. Görən həzrət Peyğəmbər (s) hacıları bu üzücü istinin altında nə üçün saxlamışdı? Yer o qədər isti və yandırıcı idi ki, bə'ziləri ayaqlarını, ətəklərinə bükmüş, dəvələrin kölgəsində oturmuşdular. Nəhayət, intizar başa çatdı. Hacılar bir yerə toplandıqdan sonra həzrət Peyğəmbər göstəriş verdi ki, minbər düzəldilsin. Həzrət hamının onu görə biləcəyi və səsini eşidə biləcəyi minbərə çıxdı. Əlini

ə) isə öz sağ tərəfində dayandırmışdı. Həzrət xütbə oxuyub Qur’an və itrəti haqqında) tövsiyə verdikdən sonra buyurdu: «Məgər mö’minlərin işində mən onların özlərindən daha irəli deyiləmmi?» Ərz etdilər: «Bəli». Həzrət buyurdu: «Mən hər kəsin mövlasıyamsa, Əli (ə) də onun mövlasıdır. Pərvərdigara, onun dostunu dost tut, düşmənini düşmən. Ona yardım göstərənə yardım et, onu tənha buraxanı alçalt». Sonra həzrət göstəriş verdi ki, müsəlmanlar dəstə-dəstə Peyğəmbərin xeyməsi ilə üzbəüz xeyməyə daxil olub, Əlini (ə) canişinlik məqamına görə təbrik etsinlər. Onu birinci təbrik edən Ömər ibn Xəttab oldu. Ömər ərz etdi: «Bəh-bəh, ey Əli, sən bu gün artıq mənim və hər bir kişi və qadının əmirisən.(١) Beləcə, həzrət Peyğəmbər (s) Əlini (ə) öz canişini tə’yin etdi və göstəriş verdi ki, bunu eşidənlər eşitməyənlərə .çatdırsınlar

Həssan ibn Sabit həzrət Peyğəmbərdən icazə istədi ki, Əlinin (ə) imamət və vilayəti, Qədire-Xumda Peyğəmbərə canişin tə’yin olunması haqqında bir qəsidə oxusun. .Həzrət ona icazə verdi

İslam Peyğəmbəri Qədire-Xumda

:Üz tutub ümmətə verdi bir sual

?Sizlərin rəhbəri mən deyiləmmi

.Hamı təsdiq etdi, yox başqa xəyal

:(Belə davam etdi sözünə həzrət (s

Məni mövla bilən bilsin bu gündən

Mənim canişinim, öz ağası tək

.Əlini (ə) tanımaq gərəkdir hökmən

Həzrət Peyğəmbər (s) Həssanın şe’rini dinləyib buyurdu: «Ey Həssan, nə qədər ki, .«dilinlə bizə yardımçısan, daim ruhul-qüds tərəfindən təsdiqlənmişsən

Bu xəbərin sübutu firqələr üçün o qədər aydındır ki, kimsə üçün inkar və şübhə yeri

qalmamışdır. Çünki sünni tarixçiləri və təfsirçiləri öz kitablarında azca fərqlə bu barədə mə'lumat vermişlər. Onlar da təbliğ ayəsinin zil-hiccənin on səkkizinci günü Qədire-Xumda Əli haqqında nazil olmasını təsdiqləyirlər. Həzrətin (s) «mən kimin mövlasıyamsa, Əli də onun mövlasıdır» buyuruğu sünni



---

.Иршад» ۱-чи чилд, ۲-чи баб, ۵۰-чи фəсил» [۴۲] -۱

mənbələrində nəql olunmuşdur. Amma «Mövla» kəlməsi müxtəlif mə’nalara malik olduğundan bə’zi sünni alimləri hədisdə mövla kəlməsinin dost mə’nasında işləndiyini bildirmişlər. Onlar uyğun hədisi «mən kimin dostuyamsa Əli (ə) də onun dostudur» mə’nasında qəbul edirlər. Bu mə’nanı ibn Səbbağ Maliki də öz «füsulul-muhimmə» kitabında bəyan etmişdir. Təəssüb səbəbindən həqiqəti görə bilməyənlərə cavab olaraq «mövla» kəlməsinin müxtəlif mə’nalarını nəzərdən keçirəcəyik. «Mövla» sözünün aşağıdakı mə’naları vardır: İxtiyar sahibi, bəndə, azad olmuş, azad edən, qonşu, həmpeyman, həmand, şərik, yeznə, qonşu, ne’mətyetirən, dost, yardımçı. Bu mə’nalardan bə’ziləri Qur’ani-Kərimdə də işlədilmişdir. «Duxan» surəsində «mövla» sözü «qohum» mə’nasını bildirir: «Məhəmməd» surəsində isə «mövla» «dost» mə’nasında işlədilmişdir. Bu söz «Nisa» surəsində «həmpeyman», «Əhzab» surəsində «azad etmiş» .mə’nalarını bildirir

Amma bu mə’nalardan bə’zilərini həzrət Peyğəmbərə (s) aid etmək olmaz. Çünki həzrət kimsənin qulu və həmandı olmamışdır. Əhəmiyyətli olmayan bir mövzuya görə həzrət Peyğəmbərin (s) insanları qaynar səhrada bir yerə toplayıb saxlaması inandırıcı deyil. İnanmaq olmur ki, həzrət Peyğəmbər (s) hacılara həzrət Əli (ə) ilə dostluq haqqında mə’lumat vermək üçün onları səhrada saxlamışdır. Peyğəmbərə (s) buyurulur: «Əgər bunu etməsən, Allahın risalətini yerinə yetirməmiş olarsan». Məgər sadəcə dostluğu bəyan etməmək bu qədər ciddi dəyərləndirilə bilərmi?! Əslində Peyğəmbərin (s) bu bəyanatı daha dərin mahiyyətə malikdir. Allah-təala ayənin davamında buyurur: «Allah səni insanların şərindən qoruyacaq». Məgər dostluq nəticəsində hansı nəticələr yarana bilərdi ki, Allah uyğun və’dlə belə bir təhlükəni .aradan qaldıracağını bəyan edə

Digər bir tərəfdən mövla kəlməsinin dostluq mə’nasında tə’bir olunması dəlil tələb edir. Əks təqdirdə, belə bir mə’nalandırma üsul elminə zidd olar. Bu baxımdan yalnız :«ixtiyar sahibi» mə’nasının dəlilləri vardır. Həmin dəlilləri nəzərdən keçirək

Əvvəla, Allah-təalanın Peyğəmbərin bu işi görməsini onun risaləti üçün şərt bilməsi məsələsinin ciddiliyindən danışır. «Mövla» kəlməsinin yalnız «ixtiyar

sahibi» mə’nası ciddi mahiyyət daşıyır. Əgər uyğun kəlməni ixtiyar sahibi kimi tə’bir etsək, söhbətin Peyğəmbərdən sonra kimin onun canişini olacağından getməsi aydınlaşar. Ayə Cöhfə yaxınlığındakı Qədire-Xumda nazil olmuşdur. Hacılar, adətən, Cöhfəyə çatdıqda bir-birlərindən ayrılaraq öz vətənlərinə yola düşürlər. Artıq onların bir yerə toplanması mümkünsüz olur. Əlbəttə ki, bu göstəriş Peyğəmbərə bir neçə gün əvvəl nazil olmuşdu. Amma onun dəqiq vaxtını tə’yin etmək çətindir. Həzrət Peyğəmbər (s) yaxşı bilirdi ki, həzrət Əli (ə) döyüşlərdə bir çox düşmənlərin həyatına son qoyduğu üçün həmin qətlə yetirilənlərin qohum-əqrəbası Əliyə qarşı kinlidir. «Allah səni insanların şərindən qoruyacaq» və’di də Əliyə (ə) qarşı kinin mövcudluğundan .danışır

İkincisi, həzrət Peyğəmbər mövla mövzusunda danışmazdan qabaq «mən sizin ixtiyar sahibiniz deyiləmmi», deyə soruşur. Hamı həzrətin belə bir məqama malik olduğunu təsdiqləyir. «Mövla» kəlməsinin ixtiyar sahibi mə’nasında olması həmin bu cümlədən .aydın görünür

Üçüncüsü, həzrət Peyğəmbər (s) Əlinin (ə) mövlalıq məsələsinə toxunduqdan sonra göstəriş verir ki, Əliyə (ə) əmir ünvanında salam verilsin. Əgər məqsəd dost olsaydı, həzrət Peyğəmbər (s) buyurardı ki, ona bir dost olaraq salam verin. Ömərin «mənim .mövlam hər bir kişi və qadının mövlasıdır» deməsi də həzrət Əlinin vilayətini təsdiqləyir

Dördüncüsü, ən məşhur sünni kitablarında da yazılmışdır ki, ilahi fərmanın bəyanından sonra bu ayə nazil olmuşdur: «Bu gün dininizi kamil etdim və sizə olan ne’mətimi (tamamladım. Bir din olaraq sizin üçün İslamı bəyənib seçdim».(١

Həzrət Peyğəmbər (s) buyurur: «Dininin kamilləşməsi, ne’mətlərin tamamlanması, «!mənim risalətimə və məndən sonra Əlinin (ə) vilayətinə Allahın razılığına təkbir

Beşincisi, haqqında danışılan ayədən qabaq Allah-təala buyurur: «Kafirlər dininizdən (əllərini üzdülər. Onlardan qorxmayın, Məndən qorxun».(٢

Kafirlər və müşriklər elə düşünürdülər ki, Peyğəmbərin oğlan övladı olmadığından o dünyasını dəyişdikdən sonra din də aradan gedəcək. Amma

Allah əmri ilə Əlinin Peyğəmbərə (s) canişinliyi bəyan olunduqdan sonra onların bütün ümidləri puça çıxdı. Düşmən anladı ki, bu din həmişəlikdir. Deyilənlərdən belə bir nəticə çıxarmaq olar ki, həzrətin buyuruğundakı «mövla» kəlməsi vilayət və canişinlik (məʼnasında işlədilmişdir.(١

Bəli, mövla sözünün uyğun buyuruqdakı yeganə həqiqi məʼnası «ixtiyar sahibi»dir. Başqa məʼnalar məcazidir və onların təsdiqi üçün dəlillərə ehtiyac var. Üsul elminə əsasən həqiqət məcazidən irəlidir. Bir sözlə, «mövla» kəlməsi hədisdə, «ixtiyar sahibi» .məʼnasını daşıyır

Deyilənlərdən əlavə, bu mərasimdən sonra Həssan ibn Sabitin oxuduğu qəsidə mövla sözünün həqiqi məʼnasını aydın göstərir. Həssan öz qəsidəsində həzrət Peyğəmbərin .dili ilə Əlinin (ə) canişinliyi haqqında, onun ümmətə imaməti barədə məʼlumat verir

Əgər «mövla» sözü «dost» məʼnasında olsaydı, həzrət Peyğəmbər (s) Həssanın qəsidəsinə eʼtiraz edərdi. Hansı ki, Peyğəmbər (s) Əlinin (ə) imam və canişin .adlandırılmasına eʼtiraz etmir, hətta Həssan haqqında xoş sözlər söyləyir

Çıxış yolu görməyən bəʼzi sünni alimləri bu məʼnanı eʼtiraf etməyə məcbur olmuşlar. Onlar bildirirlər ki, həzrət Peyğəmbər (s) Qədire-Xum günü Əlinin vilayət və (canişinliyini eʼlan etmişdir.(٢



---

.Тəфсирул-мизан, ۵-чи чилд [۴۶] -۱

.Тəзкиреjе-ибн Чəвзи» cəh. ۲۰» [۴۷] -۲

## (PEYĞƏMBƏRİN REHLƏTİ (DÜNYASINI DƏYİŞMƏSİ

Həzrət Peyğəmbər həccətul-vida (son həcc) səfərindən qayıtdıqdan sonra Üsamə ibn Zeydin komandanlığı altında qoşun hazırlayıb Şama, din düşmənləri üzərinə göndərdi. Həzrət öz həyatının son günlərini yaşadığını bildiyindən həzrət Əlinin (ə) Qədire-Xumda e’lan olunmuş canişinliyinə müxalifəti zərərsizləşdirmək üçün mühacir və ənsarları, eləcə də, Əbu-Bəkr, Ömər və Əbu-Übeydəyə Üsamənin qoşunu ilə getmək əmri verdi. Həzrət istəyirdi ki, bu adamlar onun vəfatı zamanı Mədinədə olmasınlar. Amma tarixçilərin yazdığına görə, adı çəkilən şəxslər həzrətin göstərişindən çıxıb, .Üsaməyə qoşulmadılar

Həmin günlərdə həzrət xəstələndi, əvvəlcə Ümmü-Sələmənin, sonra isə Aişənin evində yataq xəstəsi oldu. Müsəlmanlar həzrətin görüşünə gəlir və o da görüşə .gələnlərə nəsihət verirdi. Həzrət xüsusi ilə öz itrəti, ailəsini müsəlmanlara tapşırırdı

Həmin günlərdən birində həzrət xəstə halda məscidə namaza getdiyi vaxt Əbu-Bəkr və Öməri gördü və onların Üsamə ilə getməməlirinin səbəbini soruşdu. Əbu-Bəkr dedi: «Mən Üsamənin qoşununda idim. Qayıtdım ki, sizin halınızdan xəbər tutum». Ömər isə belə dedi: «Mən sizin halınızı başqalarından soruşmayıb, özüm xəbər tutmaq üçün .«qoşunla getmədim

Həzrət Peyğəmbər (s), onlara Üsamənin qoşununa çatmağı tapşırdı və bu göstərişini üç dəfə təkrarladı. Bununla belə həmin iki şəxs həzrətin göstərişini yerinə (yetirmədilər.(١

Həzrətin xəstəliyi günbəgün ağırlaşırdı. Müsəlmanlar öz Peyğəmbərlərinin vəziyyətinə görə narahat idilər. Həmin günlərdən birində səhabələr Peyğəmbərin xidmətində olarkən həzrət buyurdu: «Mürəkkəb və kağız gətirin, məndən sonra yolunuzu azmamağınız üçün bir şey yazım». Ömər dedi: «O



---

.Иршад» ١-чи чилд, ٢-чи баб, ۵٢-чи фәсил» [۴۸] -١

sayaqlayır, özündə deyil. Allahın kitabı bizim üçün bəsdir». Bu vaxt məclisdəkilər səs-küy qaldırdılar. Həzrət Peyğəmbər buyurdu: «Qalxın və bayıra çıxın. Mənim hüzurumda (mübahisə etməyiniz yaxşı deyil».(١)

Şübhəsiz ki, Ömər Peyğəmbərin Əlinin canişinliyi haqqında göstəriş verəcəyini bilirdi. Buna görə də mürəkkəb və kağız gətirilməsinə mane oldu. İbn-Abbasın nəql etdiyi hədisə əsasən Ömər e’tiraf etmişdir ki, Peyğəmbərin Əlinin (ə) canişinliyi haqqında .(yazacağını hiss edibmiş. («Şərhe-nəhcül-bəlağə» İbn Əbül Hədid ١-ci cild, səh. ١٣۴

Həmin vaxt Ömərdən soruşan olmadı ki, mə’sum bir şəxsin sayaqlamasını dilinə necə gətirir?! Yalnız Allahın dediklərini insanlara çatdıran Peyğəmbər haqqında belə sözlər demək olardımı? Axı Allah-təala Qur’ani-Kərimdə buyurur ki, o öz könül istəyi ilə danışmır. İkincisi, Ömər xalqın xeyrini Peyğəmbərdən yaxşımı bilirdi?! Onun bütün bu hərəkətlərindən mə’lum olur ki, həzrətin məqamını düzgün tanımamışdır. Böyük sünni alimi Qütbəddin Şafii Şirazi «Kəşful-ğüyub» kitabında yazır ki, həmin gün Ömərin Peyğəmbərlə bağlı dediyi sözlər təəccüb doğurur; onun Qur’an olan yerdə rəhbərə ehtiyac olmadığını iddia etməsi tibbi kitab olan yerdə həkimə ehtiyac olmaması kimi bir .şeydir. Əlbəttə ki, belə bir məntiqi qəbul etmək olmaz

Qur’ani-Kərimə hər kəs öz düşüncə tərzi ilə yanaşa bilməz. Bu işdə mütəxəssislərin rə’yi əsas götürülməlidir.(٢) Həqiqi kitab elm əhlinin köksüdür. Bu məsələ «Ənkəbut» surəsinin qırx səkkizinci ayəsində də təsdiqlənilir. Bu səbəbdən də Əli buyurur: «Mən (Allahın natiq kitabıyam».(٣)

Həzrət Peyğəmbərin xəstəliyi gücləndi və o hicri on birinci il səfər ayının axırlarında (bə’zi mənbələrin bildirdiyinə görə rəbiül-əvvəl on ikisində) bir ömür mücahidələrdən sonra altmış üç yaşında dünyasını dəyişdi. Həzrət Əli (ə) Abbas və başqa bir neçə haşimi ilə həzrətin cənazəsinə qüsl verib, onu kəfənlədilər. Həzrət Peyğəmbər .dünyasını dəyişdiyi yerdə dəfn olundu



---

١- [۴٩] «Əл-бəгаjə вəн-нəhаjə», ۵-чи чилд, сəh. ٢٢٧.

٢- [۵٠] «Бəгəрə» сурəси, аjə ٨٣.

Həzrət Əli (ə) və bir neçə başqa Haşimi həzrətin dəfni ilə məşğul olduqları vaxt ənsar və mühacirlərdən ibarət bir qrup müsəlman Mədinənin Sayiban məhəllində toplaşdılar. .Bu məhəl həmin gündən İslam tarixindəki dönüş məhəlli oldu

Ənsar xətiblərindən olan Sabit ibn Qeys Sə'd ibn İbadə, eləcə də, Ovs və Xəzrəc qəbilələrindən bir neçə başçını götürüb bəni-Saidənin səqifəsinə (mənzilinə) üz tutdular. Həmin yerdə iki tayfa arasında xəlifə seçimi ilə bağlı ixtilaf düşdü və bu ixtilaf .mühacirlərin xeyirinə tamamlandı

Digər bir tərəfdən mühacirlərdən biri ənsarın toplantısı haqqında Ömərə xəbər verdi. .Ömər özünü dərhal Əbu-Bəkrə çatdırdı və ona həmin məsələ barədə mə'lumat verdi

Əbu-Bəkr də öz növbəsində Əbu-Übeydəni xəbərdar etdi. Bir sözlə, bu üç şəxs ətrafdakı adamlarla birlikdə səqifəyə doğru tələsdilər. Ənsardan olanlar Sə'd ibn .İbadə haqqında danışdıqları vaxt onlar məclisə daxil oldular

Sünni alimlərinin əlində bəhanəyə çevrilmiş səqifə toplantısı haqqında ətraflı danışsaq .məsələ daha aydın olar

Həmin məclisdəki məşhur adamların adlarını sadalayaq: Əbu-Bəkr, Ömər, Əbu-Übeydə, Əbdür-Rəhman ibn Ovf, Sə'd ibn İbadə, Sabit ibn Qeys, Osman Əfvan, Haris ibn Haşim, Həssan ibn Sabit, Bişr ibn Sə'd, Hübab ibn Mənzər, Müğeyrə ibn Şö'bə, Üseyl ibn Xuzəyr. Bu adamlar bir yerə toplandıqdan sonra Sabit ibn Qeys ayağa qalxdı və mühacirlərə müraciətlə dedi: «Artıq Peyğəmbərlərin üstünü və Allahın rəhməti olan peyğəmbərimiz aramızdan getmişdir. Əlbəttə ki, özümüz üçün xəlifəni biz seçməliyik. Bu xəlifə həm də ənsardan olmalıdır. Çünki ənsar həzrət Peyğəmbərə xidmətdə mühacirlərdən irəli olmuşlar. Həzrət əvvəlcə Məkkədə olmuşdu. Siz mühacirlər onun mö'cüzə və kəramətlərini gördüyünüz halda onu incitmişdiniz. Beləcə, o hicrət etməyə məcbur olmuşdu. Peyğəmbər Mədinəyə daxil olan kimi biz ənsar onu himayə etdik, əziz tutduq. Şəhərimizi və evlərimizi siz mühacirlərin ixtiyarına verdik. Əgər bu dəlillər qarşısında bir dəliliniz varsa deyin. Ya da bizim fəzilət və fədakarlıqlarımıza baş əyib, .«vəhdətimizin qırılmasına səbəbkar olmayın

Bu sözlərdən çox narahat olan Ömər qalxdı və cavab vermək istədi. Amma Əbu-Bəkr Ömərə mane olub ənsarın cavabını özü verdi: «Ey Qeys oğlu, Allah sənə rəhmət etsin, dediklərin həqiqətdir. Sənin dediklərini qəbul edirik. Amma bir qədər də mühacirlərin fəzilətlərinə qulaq asın. Həzrət Peyğəmbərin (s) bizim haqqımızda dediklərini yada salın. Əgər siz bizə sığınacaq vermisinizsə, unutmayın ki, biz də Peyğəmbər və Allah dininə xatir evlərimizi, güzaranımızı qoyub gəlmişik. Allah öz kitabında bizim başımızı ucaldıb və buyurub ki, mühacirlər Allahın razılığını əldə etmək xatirinə hicrət etmişlər. Gəlin siz də bizə tabe olun. Keçmişdə də ərəblər yalnız Qüreyşə tabe olmuşlar. Həzrət Peyğəmbər (s) özü də Qüreyşə itaəti əmr etmişdir. Sizi Qüreyşə itaətə də'vət etməkdə heç bir qərəzim yoxdur. Xilafəti özüm üçün yox, bütün müsəlmanların faydası üçün .«istəyirəm. İndi Ömər və Əbu-Übeydə buradadırlar. Onlardan birinə bey'ət edin

Sabit ibn Qeys bu sözləri dinlədikdən sonra mühacirlərə ikinci dəfə müraciət edib dedi: «Əbu-Bəkrin bu iki nəfərə bey'ət haqqındakı fikri ilə razısınız, yoxsa onun özünü xilafətə seçirsiniz?» Mühacirlər dedilər: «Əbu-Bəkr Siddiq hər nə deyirsə, biz qəbul .«edirik

Sabit ibn Qeys onların bu sözündən istifadə edib dedi: «Siz deyirsiniz ki, Peyğəmbər (s) Əbu-Bəkri müsəlmanlara xəlifə tə'yin edib, özü xəstələndiyi vaxt onu namaza göndərib. Əgər belədirsə, onda Əbu-Bəkr Peyğəmbərin (s) göstərişindən boyun qaçırır və xilafət kürsüsünü Ömər və ya Əbu-Übeydəyə tapşırır. Yox əgər Peyğəmbər belə bir göstəriş verməyibsə, nə üçün onun adından yalan danışırsınız?» Sabit ibn Qeys bu bir neçə iti sözlə Əbu-Bəkrin cavabını verdi. O, mühacirin sözlərinə uymadı. Ənsar da Sabit ibn Qeysin sözlərindən ruhlanıb, öz əqidələrində daha da möhkəm dayandı. Bu vaxt Hübab ibn Mənzər ayağa qalxıb dedi: «Ənsarın xidmətləri hamıya aydındır və heç bir izahata ehtiyac yoxdur. Əgər mühacirlər bizi qəbul etmirlərsə, biz də onlara tabe olmuruq. Bu halda sizin öz, bizimsə öz əmirimiz olar». Sə'd ibn İbadə haray çəkdi ki, bir dində və bir hökumətdə iki əmirin olması əqli və məntiqi iş deyil». Bu məqamda ənsarın iki qəbiləsi arasında (Ovs-Xəzrəc) ixtilaf yarandı. Ovs qəbiləsi, xüsusi ilə Bişr ibn Sə'd, Sə'd ibn İbadənin xəlifə olmaması üçün mühacirlərlə razılığa gəldi. Amma Xəzrəc tayfası da asanlıqla təslim olmadı. Nəticədə səs-küy ətrafı bürüdü, əllər qılınclara uzandı. Az qala böyük bir

.fitnə qopacaqdı. Ovs tayfasının başçısı da Xəzrəclə əlaqəsini kəsdi

Ömər ənsar arasındakı bu ixtilafdan istifadə etdi. O dedi: «Bişr ibn Sə'd və Üseyd ibn Xuzəyr razılığa gəldikləri üçün xəlifə yalnız Qüreyşdən ola bilər. Müxtəlif ərəb qəbilələrinin birləşməsi üçün Hübab ibn Mənzərin dediyi kimi, iki xəlifə ola bilməz. Bunun nəticəsi yalnız fitnə-fəsad olar. Deməк, siz hamınız mühacirlərə itaət etsəniz, .«yaxşı olar. Belə olsa, fitnə-fəsad yaranmaz, müsəlmanlar da vəhdət yolunu tutarlar

Ömərin danışığı və Ovsla Xəzrəc arasındakı ixtilaf ənsarın ruhiyyəsini sarsıtsa da, ənsardan bir qrupu ayağa qalxıb o birilərini Ömərin tə'siri altına düşməməyə .çağırdılar

Ömər yenidən mühacirlərin fəzilətləri haqqında danışdı. Ənsarı qorxu ilə ümid arasında qoydu. Sonra Əbu-Bəkrin əlindən tutub dedi: «Ey camaat, budur Peyğəmbərin mağara yoldaşı və sirlərinin sahibi. Bu şəxsə bey'ət üçün tələsin. Allahın və onun rəsulunun razılığını qazanın». Qədire-Xum əhvalatında qeyd olunduğu kimi, Peyğəmbər Allahın razılığını Əlinin canişinliyində görürdü. Qədire-Xum günü ilə səqifə !günü arasında cəmi yetmiş günlük bir fasilə vardı. Səqifədəkilər necə də unutqandılar

Ənsardan bir qrupu Ömərlə razılaşdı və öz qohumlarına dedi: «Ömər insafla danışdı. Ona qarşı çıxmaq yaxşı deyil». Ənsar artıq anladı ki, bəxt quşu mühacirlərin başı .üzərinə kölgə salır. Çünki çoxları mühacirlərin xəlifəliyi ilə razılaşmışdı

## İŞİN SONU

Bir sözlə, Ömər yubanmağı məsləhət bilmədi. Ayağa qalxdı və Əbu-Bəkrin əlini tutub dedi: «Bir halda ki, müsəlmanlar sənin xəlifəliyinə razıdırlar, əlini ver sənə bey'ət edim». Əbu-Bəkr isə xəlifəliyi Ömərə təklif etdi. Amma Ömər qabağa düşüb, Əbu-Bəkrə bey'ət etdi. Ovs qəbiləsi də Xəzrəc qəbiləsinin əksinə olaraq Ömərlə həmkarlıq edib, (Əbu-Bəkrə bey'ət etdi. Beləcə, işin sonu Əbu-Bəkrin xeyirinə tamamlandı.(١

Bəli, sünnilərin istinad etdiyi icma və onların Əbu-Bəkrin xəlifəliyini şuranın nəticəsi bilmələrini əsil mahiyyəti bu idi. Yə'ni şura adlandırılan toplantının

qərarında Xəzrəc qəbiləsinin, bəni-Haşimin, Səlman, Əbuzər, Miqdad, Əmmar, Xəzimə ibn Sabit, Səhl ibn Hənif, Osman ibn Hənif, Əbu Əyyub Salmani kimi səhabələrin, eləcə .də, Məkkə, Yəmən Nəzran müsəlmanlarının heç bir rolu olmamışdır

Ömər bir an olsun belə sakitləşmirdi. Xalqı Əbu-Bəkrə bey'ətə də'vət edirdi. Səqifədən çıxdıqdan sonra da küçə və bazarda müsəlmanları məscidə göndərirdi ki, Əbu-Bəkrə bey'ət etsinlər. İşin mahiyyətindən xəbərsiz xalq da dəstə-dəstə Əbu-Bəkrlə görüşə .gedib ona bey'ət edirdilər

Əbu-Bəkr məsciddə minbərə çıxıb dedi: «Ey camaat, mənim xəlifəliyim sizdən fəzilətli olmağım demək deyil. Mən sizin behtəriniz yox, mehtərinizəm. Bütün işlərdə sizdən məsləhət və kömək istəyərəm. Peyğəmbərin sünnəsi əsasında rəftar edərəm. Əgər mənim insafdan kənara çıxdığımı görsəniz məndən üz döndərib başqasına bey'ət edin. .«Yox əgər ədalətlə rəftar etmiş olsam, mənə arxa durun

Səbəbiyyət qanununa əsasən hər bir səbəbdən nəticə yaranır. Səbəb və nəticə arasındakı oxşarlıq labüddür. Yanlış müqəddimədən doğru nəticə almaq .mümkünsüzdür

Me'mar əyri qoysa birinci daşı

.Ulduzadək əyri ucalar başı

Bu baxımdan səqifə əhvalatı İslama böyük bir zərbə oldu. Sonradan baş verən bütün acı hadisələr, həzrət Əlinin (ə) şəhadətə çatması, Kərbəla hadisəsi, Əhli-beytin əsarəti :səqifə zərbəsinin acı nəticələri idi. Höccətül İslam Nəyyir deyir

Şura bey'ətinə plan cızan kəs

.Aşura qətlinə vermiş oldu səs

,Zeynəb əsir düşdü həmin zaman ki

.Şura qəsb elədi ilahi mülkü

həzrət Əli (ə) Peyğəmbərin qüsl və kəfənlənməsini başa çatdırmamış bir şəxs gəlib dedi: «Ya Əli (ə), tələs, müsəlmanlar bəni-Saidənin səqifəsində toplanıb, xəlifə seçirlər». həzrət Əli (ə) buyurdu: «Sübhanəllah! Bunlar necə müsəlmandır ki, Peyğəmbərin cənazəsi dəfn olunmamış rəyasət haqqında düşünürlər?!» həzrət Əli (ə) sözünü başa çatdırmamış başqa bir şəxs daxil olub dedi: «Rəyasət məsələsi başa çatdı. Əvvəlcə mühacirlər və ənsar arasında mübahisə düşdü. Nəhayət, xəlifəlik Əbu-Bəkrə çatdı. Xəzrəc tayfasından bir qrup istisna olmaqla, hamı Əbu-Bəkrə bey'ət etdi». həzrət Əli (ə) buyurdu: «Ənsar haqlı olduğunu necə sübut edirdi?» Ərz etdilər: «Onlar deyirdilər ki, əgər Peyğəmbərlik Qüreyşə məxsus olubsa, onlar da Peyğəmbəri (s) himayə edib əziyyət çəkdiklərindən imamət və xəlifəlik onların olmalıdır». həzrət Əli (ə) buyurdu: «Mühacirlər ənsara qənaətbəxş cavab verdilərmi?» Ərz etdilər: «Ənsarı hansı cavab qane edə bilərdi?!» həzrət Əli (ə) buyurdu: «Məgər ənsar unudubmu ki, Peyğəmbər dəfələrlə mühacirlərə ənsarla mehriban olub onlarla müdara etməyi tapşırıb?! Peyğəmbərin (s) bu buyuruğu ənsarın mühacirlərə tapşırılması dəlildir. Əgər onlar xəlifəliyə layiq olsaydılar bir başqasına tapşırılmazdılar».

Sonra həzrət buyurdu: «Bəs mühacirlər öz haqlarını necə sübuta yetirdilər?» Ərz edildi: «Çox söz danışdılar. Sözlərinin canı bu oldu ki, onlar Peyğəmbər (s) sülaləsindəndirlər və xəlifəliyə ənsardan daha yaxındırlar». Həzrət Əli (ə) buyurdu: «Nə üçün mühacirlər öz sözlərinin üstündə dayanmırlar? Əgər onlar Peyğəmbər nəslindəndirlərsə, mən o nəslin meyvəsiyəm. Əgər xəlifəlik Peyğəmbərə (s) yaxınlıqla ölçülürsə, mən Peyğəmbərə (s) bütün cəhətlərdən daha yaxınam».

Əlinin (ə) xilafəti haqqında Qur'an ayələri və Peyğəmbər hədislərindən əlavə onun özünün uyğun buyuruğu da Səqifədə toplananlara cavab üçün kafi görünür.

Bəli, həzrət Peyğəmbərin cənazəsi torpağa tapşırılmamış Əbu-Bəkr xəlifə oldu. Əbu-Bəkrin xəlifəliyi əslində sübuta yetirilməmişdi. Ənsarın bir qrupu və başqaları, xüsusi ilə də haşimilər ona bey'ət etməmişdilər. Ömər Əbu-Bəkrə dedi ki, Peyğəmbərin əmisi və haşimilərin başçısı Abbas ibn Əbdül-Müttəliblə görüşüb onu bey'ət etməyə şirnikdirsin. Əbu-Bəkr dərhal Abbasla görüşdü və öz məqsədini ona açıqladı. Amma Abbas ona qəti

dedi: «Əgər sən özünü Peyğəmbərə aid etməklə xəlifəliyi haqqın sayırsansa, onda bizim haqqımızı puça çıxarırsan. Çünki Peyğəmbər (s) bizdəndir və biz ona hamıdan yaxınıq. Yox əgər müsəlmanların rə'yi əsasında xəlifə olduğunu düşünürsənsə, biz daha öncül müsəlmanıq və sənə belə bir icazə verməmişik. Mənə və'd etdiyin var-dövlət bizə məxsusdursa, onu sən nə üçün sərf etməlisən?! Yox əgər öz malından və'd edirsənsə, bizim ona ehtiyacımız yoxdur. Mö'minlərin malından verməyi nəzərdə tutursansa, sənin belə bir haqqın yoxdur».

Həzrət Əli (ə) baş verənləri son incəliyinədək anlayırdı. O başa düşürdü ki, səqifədə toplananlar sadəlövh xalqı aldatmışlar. Həzrət həqiqəti bəni-Haşim və öz səhabələrinə anlatmaq istəsə də, onun də'vətini yalnız kiçik bir hissə qəbul etdi.[1]

Əksər tarixçilər yazırlar ki, Əli üç gecə ardıcıl şəkildə müsəlmanların mənzillərində oldu. O öz haqqını bəyan edərək bu adamları bey'ət etməyə çağırdı. Həzrət müraciət etdiyi adamlardan cavab almadığı üçün öz evinin bir küncünə çəkildi.

Digər bir tərəfdən Ömər daim Əbu-Bəkrə deyirdi: «Nə qədər ki, Əlidən bey'ət almamısan, xilafətinin sütunları zəif olacaq. Yaxşı olar ki, onu bey'ətə məcbur edəsən. Belə etsən o biri haşimilər də sənə bey'ət edərlər».

Əbu-Bəkrin göstərişi ilə Xalid ibn Vəlid bir neçə nəfərlə, eləcə də, Əbdür-Rəhman ibn Ovf və Ömərlə Əlinin (ə) evinə gedib onun qapısını döydülər. Bildirdilər ki, onun Əbu-Bəkrə bey'ət etməsi məqsədi ilə gəliblər. Həzrət Əli (ə) onları qəbul etmədi və evə daxil olmalarına icazə vermədi.

Xalid ibn Vəlid yanındakılara göstəriş verdi ki, məcburi şəkildə evə daxil olsunlar. Onlar qapının bir hissəsini sındırıb evə daxil oldular.

Bu vaxt Əlinin (ə) yanında olan Zübeyr ibn Əvvam qılıncını çəkib onlara müqavimət göstərmək istədi. Amma iki nəfər Zübeyrin arxasını kəsdi və o birilər Əlini əhatəyə aldılar. Onu qolları bağlı halda Əbu-Bəkrin yanına gətirdilər. Həzrət Əli Əbu-Bəkrə müraciətlə buyurdu: «Ey Əbu-Quhafə oğlu, bu nə göstərişdi vermisən ki, bizi bu şəkildə yanına gətirsinlər və Peyğəmbər ailəsi ilə belə rəftar etsinlər?! Yoxsa Peyğəmbərin göstərişlərini yaddan

çıxarmısan?» Əbu-Bəkrdən qabaq Ömər cavab verdi və dedi: «Səni bura gətirmişik ki, Peyğəmbərin xəlifəsinə bey’ət edəsən». Əli buyurdu: «Məntiq və dəlillə danışsaq daha yaxşı olar. Əvvəlcə mənə deyin ki, səqifədə ənsara qalib gəlməyinizin səbəbi nə oldu və hansı dəlillərlə onları qane etdiniz?» Ömər dedi: «Qüreyşin başqa qəbilələrdən və mühacirin ənsardan üstün olması dəlilləri ilə. Ən əsası isə mühacirlər həzrət .«Peyğəmbərə (s) daha yaxındırlar

Həzrət Əli (ə) buyurdu: «Mən də elə sizin öz məntiqiniz əsasında rəftar edirəm. Başqa dəlillərim olsa da sizin öz dilinizlə danışıram. Əgər siz özünüzü Peyğəmbərə yaxın olduğunuz üçün haqlı sayırsınızsa, əgər xilafətin me’yarı Peyğəmbərlə yaxınlıqdırsa, hamı bilir ki, mən Peyğəmbərə bütün ərəbdən daha yaxınam. Mən onun əmioğlusu, yeznəsi və iki nəvəsinin atasıyam». Ömər məntiqi cavab verməkdə aciz olduğundan .«dedi: «Əgər bey’ət etməsən səndən əl çəkməyəcəyik

Həzrət Əli (ə) buyurdu: «Bir-birinizin işinizə yaxşı yarıyırsınız. Bu gün ona yardım edirsən ki, sabah xəlifəliyi sənə ötürsün. And olsun Allaha, mən ona bey’ət etmərəm. Çünki o mənə bey’ət etməlidir». Sonra həzrət üzünü ətrafdakılara tutub buyurdu: «Ey mühacirlər, Allahdan qorxun, Peyğəmbərin hakimiyyət və qüdrətini onun ailəsindən almayın. And olsun Allaha, biz Əhli-beyt uyğun məqama hamınızdan daha layiqik. Nəfsinizə itaət etməklə haqdan uzaq düşürsünüz». Beləcə, həzrət Əli (ə) bey’ət etmədən evinə qayıtdı və Fatimə (ə) dünyasını dəyişənədək evdə oldu. Yalnız .Fatimənin vəfatından sonra bey’ət etməyə məcbur qaldı

## BƏ’Zİ SƏHABƏLƏRİN ƏBU–BƏKRƏ E’TİRAZI

Əbu-Bəkrin xəlifəliyi müəyyənləşdikdən sonra, Peyğəmbərin vəfatından beş gün ötmüş bə’zi səhabələr məsciddə toplandılar. Onlar Əbu-Bəkri nəsihət etməyə başladılar. Əvvəlcə Əbuzər Qəffari Əbu-Bəkrə xitabla dedi: «Ey Əbu-Bəkr, xilafət mənsəbini Əlidən almaq Allaha və onun rəsuluna itaətsizlikdir. Ağıllı və dərin düşüncəli insan əbədi axirət dünyasını ötəri dünyaya satmaz. Sizin bu hərəkətiniz özünüzün və müsəlmanların zərərinə olacaq. Ey Əbu-Bəkr, mən İslamın mənafelərinə əsasən bu .«sözləri deyirəm. Dediklərimi qəbul edib-etməməkdə azadsan

Əbuzərdən sonra Salman və Xalid ibn Sə'd həzrət Əlinin (ə) fəzilətlərindən və onun xilafət məqamına daha layiq olduğundan danışdılar. Onlar Əbu-Bəkri bu məqamı qəsb etdiyi üçün qorxutdular. Sonra mühacir və ənsara üz tutaraq dedilər: «Müsəlmanların birliyini qarşıdurmaya çevirməyin, öz nəfs istəklərinizə xatir din və məzhəblə oyun oynamayın».

Sonra Xalid ibn Sə'd Əbu-Bəkrə dedi: «Ənsar sənə Ömərin təhriki və Ovsla Xəzrəc arasındakı ixtilaflara görə bey'ət etdi. Belə bir bey'ətin heç bir dəyəri yoxdur».

Əbu-Əyyub Ənsari, Osman ibn Hənif və Əmmar Yasər ayağa qalxaraq hər biri Əlinin fəziləti və üstünlüyü haqqında danışdılar. Əlinin (ə) qəzəvatlardakı fədakarlıqlarını yada saldılar. Əbu-Bəkri səhabələrin dedikləri pərişan etdi. Məsciddən çıxdı və öz evinə getdi. Müsəlmanlara belə bir xəbər göndərdi: «Sizin mənə rəğbətiniz yoxdur, bir başqasını xəlifə seçin».

Əbu-Bəkrin tərəddüdə düşdüyünü görən Ömər onun evinə gedib məcburi şəkildə məscidə gətirdi. Ömərin göstərişi ilə silahlı adamlar Əbu-Bəkri mühasirəyə aldı və kimsənin onunla danışmasına imkan vermədi. Ömərin bu işindən sonra kimsə Əbu-Bəkrlə danışa bilmədi.

### HƏZRƏT ƏLİNİN (Ə) ƏBU–BƏKRƏ QARŞI DƏLİLLƏRİ

Mərhum Təbərsi «Ehticac» kitabında həzrət Əlinin (ə) Əbu-Bəkrə qarşı irəli sürdüyü dəlilləri nəql edir. Biz həmin söhbətə xülasə şəkildə nəzər salacağıq.

Əbu-Bəkrin xəlifəliyi müəyyənləşdikdən və ona bey'ət edildikdən sonra Əbu-Bəkr özünə bəraət qazandırmaq üçün xəlvətdə həzrət Əli (ə) ilə görüşdü və dedi: «Ya Əbəl-Həsən, and olsun Allaha, mənim bu işə meylim və tamahım yox idi. Nə də özümü başqalarından üstün bilirdim». Həzrət Əli (ə) buyurdu: «Bəs onda səni bu işə nə vadar etdi?» Əbu-Bəkr dedi: «Həzrət Peyğəmbər (s) buyurmuşdu ki, mənim ümmətimi Allah azğınlıqla bir yerə toplamaz. Mən də xalqın bir yerə toplandığını görüb Peyğəmbərin (s) buyuruğuna əməl etdim. Əgər bilsəydim ki, kimsə buna müxalifdir, qəbul etməzdim». Həzrət Əli (ə) buyurdu: «Mən də bu ümmətdənəm, yoxsa yox?» Əbu Bəkr dedi: «Bəli». Həzrət buyurdu: «Sənin xəlifəliyinə qarşı çıxan Salman, Əmmar, Əbuzər, Miqdad, Sə'd

yox?» Əbu-Bəkr ərz etdi ki, bəli. Əli buyurdu: «Bütün bu şəxslər sənin xəlifəliyinə müxalif olduğu halda Peyğəmbər (s) hədisini hansı əsasla dəlil göstərirsən?» Əbu-Bəkr dedi: «Mən onların müxalifliyini bilmədim. Yalnız iş başa çatdıqdan sonra bundan xəbər tutdum. Qorxdum ki, özümü kənara çəksəm, xalq dindən uzaqlaşar». Həzrət Əli (ə) buyurdu: «Mənə de görüm, xəlifəliyi öhdəsinə götürən şəxsdə hansı xüsusiyyətlər olmalıdır?» Əbu-Bəkr dedi: «Xeyirxahlıq, vəfa, hiylədən uzaqlıq, ədalətin izharı, kitab və sünnədən xəbərdarlıq, dünyada zahidlik və dünyaya rəğbətsizlik, məzlumun haqqını zalımdan almaq, dində öncüllük, Peyğəmbərə yaxınlıq». Həzrət Əli (ə) buyurdu: «Səni Allaha and verirəm, bu sifətlər səndə var, yoxsa məndə?» Əbu-Bəkr dedi: «Bu xüsusiyyətlər sənin vücudunda var, ya Əbəl-Həsən». Həzrət Əli (ə) buyurdu: «Peyğəmbərin də'vətini hansımız daha tez qəbul etdik?» Əbu-Bəkr ərz etdi ki, sən». Həzrət buyurdu: «Bəraət surəsini müşriklərə sən oxudun, yoxsa mən?» Əbu-Bəkr bildirdi ki, sən. Həzrət buyurdu: «Peyğəmbər hicrət etdiyi vaxt ona canını sipər edən sən oldun, yoxsa mən?» Əbu-Bəkr ərz etdi ki, sən. Həzrət buyurdu: «Qədire-Xumda həzrətin buyuruğuna əsasən sənin və bütün müsəlmanların mövlası mənəm, yoxsa sən?» Əbu-Bəkr ərz etdi ki, sən. Əli buyurdu: «Qur'anda Allah və onun rəsulu ilə gələn vilayət sənin üçündür, yoxsa mənim üçün?» Əbu-Bəkr bildirdi ki, sənin üçün. Həzrət buyurdu: «Peyğəmbərdən nəql olunmuş mənzələt hədisi və Harunun Musaya nisbəti haqqında çəkilmiş məsəl mənim haqqımdadır, yoxsa sənin haqqında?» Əbu-Bəkr dedi: «Əlbəttə ki, sənin haqqında». Həzrət Əli (ə) buyurdu: «Mübahilə günü müşriklərlə mübahilə üçün Peyğəmbər məni və övladlarımı özü ilə apardı, yoxsa səni və övladlarını?» Əbu-Bəkr ərz etdi: «Sizi». Həzrət buyurdu: «Təthir ayəsi mən və mənim Əhli-beytim haqqındadır, yoxsa sən və sənin əhli-beytin?» Əbu-Bəkr ərz etdi: «Əlbəttə ki, sən və sənin əhli-beytin haqqında».

Həzrət Əli (ə) buyurdu: «Kəsa günü həzrət Peyğəmbər (s) mən və mənim əhli-beytim haqqında dua etdi, yoxsa sənin haqqında?» Əbu-Bəkr ərz etdi: «Sən və sənin Əhli-beytin haqqında». Həzrət buyurdu: «Həl əta» surəsində mənim haqqımda danışılır, yoxsa sənin haqqında?» Əbu-Bəkr bildirdi ki, sənin haqqında.

Əbu-Bəkr həzrət Əlinin aşağıda qeyd olunmuş bütün suallarına Əlinin (ə) dediklərini təsdiqləməklə cavab verdi. Həzrət Əli (ə) Əbu-Bəkrə buyurdu:

Xeybər günü Peyğəmbər bayrağı sənin əlinə verdi, yoxsa mənim əlimə? Əmr ibn» Əbdəvədi öldürməklə onun bəlasını Peyğəmbər və müsəlmanlardan uzaqlaşdıran sən oldun, yoxsa mən? Həzrət Peyğəmbər Allahın əmri ilə Fatiməni sənə ərə verdi, yoxsa mənə? Həsən və Hüseynin, Peyğəmbərin tə'birincə, «behişt ağalarının» atası sənsən, yoxsa mən? Behiştdə iki qanadı ilə mələklərə qoşulub pərvaz edən sənin qardaşındır, yoxsa mənim? Peyğəmbər mö'minlərin əmiri olaraq mənə salam verməyi tapşırıb, yoxsa sənə? Peyğəmbərə mən daha yaxınam, yoxsa sən? Peyğəmbər (s) Kə'bədə bütləri sındırmaq üçün səni çiyninə qaldırdı, yoxsa məni? Peyğəmbər dünya və «?axirətdə səni öz bayraqdarı bildirib, yoxsa məni

Bəli, həzrət Əli ardıcıl olaraq Allahın ona əta etdiyi fəzilət və məqamları sadaladı, Əbu-Bəkr də onun dediklərini təsdiq etdi. Sonra həzrət soruşdu: «Bəs səni nə aldadıb ki, bu məqamı qəsb etmisən?» Əbu-Bəkr ağladı və dedi: «Ya Əbəl-Həsən, düz buyurursan. Bu günü mənə möhlət ver ki, bu barədə düşünüm». Həmin gecə Əbu-Bəkr yuxuda həzrət Peyğəmbəri gördü. O, Peyğəmbərə salam versə də, həzrət üzünü yana döndərdi. Əbu-Bəkr Peyğəmbərdən soruşdu ki, hansı göstərişinə əməl etməmişəm? Həzrət buyurdu: «Allahın və rəsulunun dost tutduğu kəslə düşmənçilik etmisən. Haqqı öz sahibinə qaytar». Əbu-Bəkr kimin haqq sahibi olduğunu soruşur. Həzrət buyurur ki, səni məzəmmət edən kəs! Əbu-Bəkr Peyğəmbərə bildirir ki, haqqı sahibinə qaytardım ...

Əbu-Bəkr sübh tezdən həzrət Əlinin (ə) yanına gəlir və ərz edir ki, ya Əbəl-Həsən əlini aç, sənə bey'ət edim. O, yuxuda gördüklərini Əliyə danışır. Əbu-Bəkr əlini onun əli üstünə qoyub bey'ət edir. Bildirir ki, indi məscidə gedib yuxuda gördüklərimi .danışacağam və tutduğum məqamı sənə təhvil verəcəyəm

Əbu-Bəkr Həzrət Əlinin (ə) evindən çıxdıqdan sonra onun ardınca gəzən Ömərlə rastlaşır. Ömər soruşur ki, sənə nə olub, ey Peyğəmbər (s) xəlifəsi? Əbu-Bəkr əhvalatı danışır. Ömər deyir: «Səni Allaha and verirəm, ey Peyğəmbər xəlifəsi, bəni-haşimin sehrinə uyma. Bu onların birinci sehri deyil. Ömər o qədər danışır ki, Əbu-Bəkri öz (qərarından döndərir. Əbu-Bəkr yenidən xəlifəlik fikrinə qayıdır.(١

Əbu-Bəkrin çirkin işlərindən biri həzrət Peyğəmbərin qızı Fatimədən fədəkin alınması .oldu. Əvvəlcə fədək haqqında qısaca mə’lumat verək

Fədək Xeybərlə Mədinə arasında bir kənd idi. Mədinədən Fədəkədək iki mənzillik (dayanacaq) yol vardı. Torpaqları bərəkətli idi, məhsuldar xurma bağları vardı. Orada yəhudilər sakin idilər. Hicri yeddinci ildə İslam qüvvələri gücləndiyindən, Allah-təala Xeybər qələbəsindən sonra yəhudilərin qəlbinə qorxu saldığından onlar Fədəkin düz yarısını Peyğəmbərə verib, yarısını özlərinə saxladılar. Bu torpaqlar şəxsən Peyğəmbərə verildiyindən onun xüsusi mülkiyyəti sayılırdı. Belə ki, torpaqlar heç bir döyüşsüz təhvil verilmişdi. Fədəkin şəxsən Peyğəmbərə məxsus olması Qur’an ayəsi ilə də təsdiqlənir: «Allahın onların malından öz Peyğəmbərinə verdiyi qənimət üçün siz onların üstünə nə at, nə də dəvə sürdünüz. Allah öz Peyğəmbərini istədiyi kimsələr üzərində belə hakim edir. Allah hər şeyə qadirdir».(١) Bəli, Fədək torpaqları hücum yolu ilə ələ keçirilmiş qənimətlərdən fərqlənirdi. Əgər başqa qənimətlərdən döyüşçülərə pay düşürdüsə, Fədəkdə onların heç bir payı yoxdu. Qur’ani-Kərimdə oxuyuruq: «Ələ keçirdiyiniz hər hansı qənimətin beşdə biri Allahın, Peyğəmbərin, onun qohum-əqrəbasının, yetimlərin, yoxsulların və yolçularındır».(٢) Amma döyüşsüz ələ keçirilən hər bir şey yalnız Allah və onun rəsuluna məxsusdur və «Ənfal» adlanır: «De ki, (qənimətlər Allahın və Peyğəmbərinindir».(٣

İmam Sadiq (ə) buyurur: «Ənfal odur ki, onun əldə olunması yolunda at və dəvə sürülməmiş olsun. Xalqın könüllü olaraq verdiyi mal da ənfaldır. Qeyri-abad torpaqlar, çayların təki Peyğəmbərə məxsusdur. Peyğəmbərdən sonra isə



---

.Һәшр» сурәси, ٦» [٥٥] -١

.Әнфал» сурәси, ајә ٤١» [٥٦] -٢

.Әнфал» сурәси, ајә ١» [٥٧] -٣

(bu malın üzərində imam ixtiyar sahibidir».(١)

Beləcə, Fədək də ənfal sayılmalıdır. Çünki Fədəkin əldə olunmasında heç bir müsəlman iştirak etməmişdi. İmam Sadiqin (ə) buyurduğu kimi yəhudilər özləri bu torpağı .Peyğəmbərə vermişdir. Demək, Fədəkin sahibi həzrət Peyğəmbərin özüdür

Məcməül-bəyan» və «Üsule-kafi» kitablarında «İsra» surəsinin ٢۶-cı ayəsinin təfsiri ilə» bağlı yazılır: «Bu ayə nazil olduqdan sonra həzrət Peyğəmbər (s) qızı Fatiməni (s) çağırdı və buyurdu: «Allah-təala mənə göstəriş verdi ki, Fədəki sənə verdim». Fatimə dedi: «Ey Allahın rəsulu, mən bunu Allahdan və sizdən qəbul etdim». Bu əhvalat sünni kitablarında da nəql olunmuşdur. «Təfsire-Sə’ləbi», «Şəvahidut-tənzil», «Yənabiul-Məvəddət» kitablarını misal göstərmək olar. Uyğun mənbələrdə qeyd olunur ki, «Qohum-əqrəbaya da, miskinə də, müsafirlərə də haqqını ver» ayəsi nazil olduqdan sonra Peyğəmbər Fədəki qızı Fatiməyə (s) verdi. Həzrət Peyğəmbərin həyatı dövründə Fədək Fatimənin (s) ixtiyarında idi. Buranın məhsulu toplanır, bəni-haşim fəqirləri və başqalarına verilirdi. Amma Peyğəmbərin vəfatından sonra Əbu-Bəkr həzrət Fatimənin (s) vəkilini Fədəkdən çıxardı. Onun göstərişi ilə Fədək həzrət Zəhradan .alındı

Əbu-Bəkrin bu hərəkəti haqq və ədalətin tapdalanması idi. Əvvəla, Fədək başqa qənimətlərdən fərqlənirdi və Ənfal sayılırdı. O, həzrət Peyğəmbərin şəxsi mülki idi. İkincisi, həzrət Peyğəmbər özü Fədəki qızına bağışlamışdı. Üçüncüsü, atasının dövründə həmin torpaqlara həzrət Zəhra nəzarət edirdi. Mühacir və ənsarın iştirakı ilə Peyğəmbər məscidində Əbu-Bəkr bu məsələyə görə xanım tərəfindən ittiham .olunmuşdu

Əbu-Bəkr uydurma bir hədisə əsaslanır və bu hədisi Peyğəmbərdən eşitdiyini deyirdi. Guya Peyğəmbər demişdi ki, peyğəmbərlərdən irs aparılmır və onlardan nə qalarsa sədəqədir. Həzrət Zəhra Əbu-Bəkrə buyurdu: «Ey Əbu-Quhafənin oğlu, Allahın kitabında yazılmışdırmı ki, sən atandan irs aparırsan, mən isə yox? Əgər peyğəmbərlərdən irs qalmırsa, nə üçün Qur’anda peyğəmbərlərin irsi haqqında ayələr nazil olmuşdur? Nə üçün mənim atama böhtan atırsan? Məgər Qur’anda buyurulmurmu ki, Süleyman atası

Davuddan irs aldı? Bəs hansı dəlillə məni atamın irsindən məhrum edirsən? Yoxsa siz »?Qur’anı mənim atamdan və əmioğlumdan yaxşı bilirsiniz

Həzrət Fatimə (s) Əbu-Bəkr və onun ətrafındakıları rüsvay etsə də, onun məntiqi .qarşısında heç bir cavab verilməsə də, xanım haqqını almadan evinə döndü

Bəli, səqifə firqəsinin bu əməli olduqca çirkindir. Həzrət Peyğəmbərin vəfatından sonra onun ailəsinə təsəlli vermək əvəzinə onu irsdən məhrum etdilər. Hansı ki, Peyğəmbər .bütün əzab-əziyyətləri müqabilində yalnız öz Əhli-beytinə ehtiram istəmişdi

Amma nankor firqə Peyğəmbərin qızının evini yandırdı, həzrətin yeganə yadigarını atasının qəbrinə sığınmaq məcburiyyətində qoydu. Tarixçilərin bildirdiyinə görə bütün bu təzyiqlər həzrət Fatimənin ruhuna sarsıdıcı tə’sir göstərdi və o, yatağa düşüb, bir .müddət sonra dünyasını dəyişdi

## ÖMƏRİN ALTI NƏFƏRLİK ŞURASI

Əbu-Bəkr iki ildən bir qədər artıq çəkmiş xəlifəlikdən sonra xəstələndi. Onun xəlifəliyə çatması yolunda Ömərin çəkdiyi əziyyətlərə cavab olaraq, Əbu-Bəkr özündən sonra Ömərin xəlifə olması üçün şərait hazırlayırdı. Müxalifləri razı salan Əbu-Bəkr səhabələrdən bir qrupunu yanına çağırıb onların hüzurunda Öməri canişinliyə tə’yin etdi. Əbu-Bəkr vəfat etdiyi gün (hicri ١٣-cü il) Ömər xilafət kürsüsünə oturdu. Əbu-Bəkri dəfn etdikdən sonra Ömər məscidə gedib, xalqa öz xəlifəliyi haqqında mə’lumat verdi və onlardan bey’ət aldı. Həzrət Əlidən (ə) savay əksər müsəlmanlar Ömərə .bey’ət etdilər

Ömərin xəlifəliyi on il altı ay çəkdi. Ömər bütün bu müddət ərzində İran və Rumla müharibə vəziyyətində oldu. Ömər öz həyatının son anlarında növbəti xəlifəni seçmək üçün altı nəfərdən ibarət şura topladı: Əli, Təlhə, Zübeyr, Əbdür-Rəhman Ovf, Osman, Sə’d Vəqqas. Əbu-Təlhə Ənsari ənsardan beş nəfəri şuranın toplantısı keçirilən evin ətrafında qoyub, tapşırdı ki, beş nəfər birinə səs verdiyi vaxt bir nəfər onlara qarşı çıxsa, həmin bir nəfərin, dörd nəfər bir nəfərə səs verdiyi vaxt iki nəfər bu dörd nəfərə qarşı çıxsa, həmin iki nəfərin boynunu vursunlar. Əgər üç nəfər birinə, üç nəfər isə başqasına səs verərsə, Əbdür-Rəhman ibn Ovfun olmadığı üç nəfər qətlə yetirilsin.

nəfər heç bir qərara gələ bilməsələr, altısının da boynu vurulsun xəlifə seçimi xalqa .tapşırılsın

Ömər adı çəkilən altı nəfərin şuraya üzv seçilməsini belə izah edirdi: «Həzrət Peyğəmbər (s) dünyasını dəyişdiyi vaxt bu altı şəxsdən razı olduğu üçün mən xilafət məsələsini onlara tapşırıram». Şura üzvləri bir yerə toplandıqdan sonra Ömər öz düşüncəsinə əsaslanaraq həmin adamların zəif tərəflərini sadalamağa başladı və dedi: «Ey Zübeyr, sən acıxasiyyət və işkorlayansan. Əgər razı qalsan, imanın qalacaq, narazı qalsan kafirsən. Buna görə də gah insan, gah da şeytan. Ey Təlhə, sən Peyğəmbəri (s) incitdin. Həzrət dünyadan köçərkən səndən incik getdi. Bunun səbəbi hicab ayəsi nazil olanda dediyin sözlər oldu. Ey Osman, bil ki, peyin səndən yaxşıdır. Sən isə ey Sə'd, təkəbbürlü və təəssübkeşsən. Xilafət sənin işin deyil. Ey Əbdür-Rəhman, sən zəif adamsan». Sonra üzünü Əliyə (ə) tutub dedi: «Əgər sən zarafatcıl olmasaydın, xilafətə yarayardın. Vallah sənin imanın bütün yer əhlinin imanından (üstündür».(١)

Şura əhvalatını şərh etməzdən qabaq Ömərin nöqsan dolu vəsiyyəti haqqında qısaca söhbət edək. Qeyd etməliyik ki, Əbu-Bəkr, Ömər və Əbu-Übeydə arasındakı məhrəmanə razılaşmaya əsasən bu üç şəxs növbə ilə xəlifə olmalı idi. Ona görə də .Peyğəmbər dünyasını dəyişən zaman hər üç şəxs tələsik səqifəyə getdi

Əbu-Bəkr və Ömər öz məqsədlərinə nail olsalar da, növbə Əbu-Übeydəyə çatanda artıq o həyatda yoxdu. Xəlifə seçimini altı şəxsə tapşıran Ömər bildirdi ki, əgər Əbu-Übeydə və ya Salim (Huzəyfənin Qulamı) diri olsaydılar, xilafət üçün həmin iki şəxs .şuradakı altı nəfərdən daha layiqli olardı

Həzrət Əli (ə) Əbu-Bəkrə bey'ət məqsədi ilə məcburi şəkildə məscidə gətirildiyi vaxt Əbu-Übeydə həzrətə dedi: «Əgər biz bilsəydik ki, sənin xəlifəliyə könlün var, Əbu-Bəkrə yox, sənə bey'ət edərdik. İndi isə iş işdən keçib və xalq Əbu-Bəkrə bey'ət edib». Belə ki, Əbu-Bəkrə bey'ət edən Əbu-Übeydənin özü Əlini (ə) xəlifəlik üçün daha layiqli sayırdı. Belə bir vəziyyətdə Ömərin Əbu-Übeydəni xəlifəliyə Əlidən daha layiqli bilməsi -gülünc görünür. Əbu

Übeydə və Salim hər ikiləri münafiq idilər və Peyğəmbərin (s) dəvəsi ilə bağlı ləyaləye-əqəbə hadisəsində iştirak etmişdilər. Onların ikisi də Üsamənin qoşununa .qoşulmaqdan boyun qaçırmışdılar

Ömərin insafsızlığı bir həddə çatmışdı ki, hətta ikiüzlü bir qulamı da xəlifəliyə Əlidən layiqli bilir, onun ölümünə təəssüflənirdi. Digər bir tərəfdən, səqifədə ənsarla mübahisələr zamanı həzrət Peyğəmbərin Qüreyş haqqında buyurduğu sözləri Əbu-Bəkr özlərinə aid etdi və bildirdi ki, imamlar yalnız Qüreyşdən ola bilər. İndi isə Ömər .ənsardan olan Salimi, yə'ni Qüreyşdən olmayan bir şəxsin xəlifəliyi haqqında danışırdı

Üçüncüsü Ömər şuradakı altı nəfərin hər birinin eyblərini saydı və bildirdi ki, heç biri xilafətə yaramır. Maraqlıdır ki, bu altı nəfərdən heç birini xəlifəliyə layiq bilməyən ?Ömər onları nə üçün şuraya toplamışdı

Dördüncüsü, Ömər bu altı nəfəri seçməyinin səbəbi kimi həzrət Peyğəmbərin (s) onlardan razılığını göstərmişdi. Hansı ki, bir qədər sonra Təlhəyə müraciətlə dedi ki, o .Peyğəmbəri incitmişdi

Beşincisi, bu altı nəfər arasında Əbdür-Rəhmanın hansı fəziləti vardı ki, səslər bərabər bölündükdə onun düşdüyü üçlüyə üstünlük verilirdi? Hansı ki, bir az əvvəl Ömər onun zəif iradəyə malik olduğunu bildirmişdi. Ömər şuraya Əliyə (ə) zidd adamları .toplamaqla əslində Əlinin qətlinə fərman vermişdi

Bu altı nəfər arasında yalnız həzrət Əli (ə) və Osmanın xəlifə seçilməsi mümkün idi. Əbdür-Rəhman Osmanın əqd qardaşı, həm də yeznəsi idi. Əbdür-Rəhmanın səsinə .imtiyaz verməklə Osmanın seçilməsi üçün şərait yaradırdı

Şuranın üzvlərindən biri də Bəni-haşimlə adətən müvafiq olmayan Təlhə idi. Təlhə Əbdür-Rəhmanla səmimi dost idi. Bu halda onun da Osmanı himayə edəcəyi şübhə doğurmurdu. Sə'd Vəqqas isə həm Əbdür-Rəhmanın göstərişlərinə tabe olur, həm də Təlhə ilə eyni cür düşünürdü. Bu altı nəfər arasında həzrət Əli (ə) ilə yeganə razılaşacaq kəs Zübeyr idi. Səsvermə nəticəsində azlıqda qalan həzrət Əli (ə) və Zübeyrin qətli labüd olmuşdu. Ömər bütün işləri bu sayaq planlaşdırsa da, hadisələr :növbəti şəkildə cərəyan etdi

Ömərin qətlindən üç gün sonra şuranın altı üzvü Ayişənin mənzilində toplaşdı. Öncə Əbdür-Rəhman sözə başlayıb dedi: «Müsəlmanlar arasında təfriqə düşməməsi üçün biz altı nəfər yekdil olub, eyni bir qərara gəlməliyik. Hər kəs öz

.«səsini başqasına verərsə, ixtilaf da aradan götürülər

Öz səs hüququnu Təlhə Osmana, Zübeyr Əliyə, Sə'd Vəqqas isə Əbdür-Rəhmana verdi. Bu yolla şuradakı altı səs üç səsə qədər azaldı. Həzrət Əliyə (ə) aydın idi ki, bu iş Osmanın xeyirinə tamamlanacaq. Çünki Əbdür-Rəhman xəlifəlik fikrində deyildi. Onun .belə bir tamahı olsa da, aşkarda Osmanı müdafiə edəcəkdi

Əbdür-Rəhman yenidən söhbətə başlayıb onları müxalifətçilikdən çəkindirmək istədi. Çünki bu qurama şurada müxalifətçilik pusquda dayanmış əlli nəfərin qılıncına tuş .gəlmək demək idi

Əbdür-Rəhmanın məqsədindən xəbərdar olan Osman Əliyə (ə) təklif etdi ki, hər ikisi səslərini Əbdür-Rəhmana versinlər və o nə deyirsə, o da olsun. Əbdür-Rəhman Osmanın təklifini həvəslə qarşıladı və and içdi ki, özünün xəlifəlik fikri yoxdur, bu işi ya .Əli (ə), ya da Osmana tapşıracaq

Həzrət Əliyə (ə) şuradakıların bütün gizli məqsədləri aydın idi. Bu dəfə Osman dedi: «Ya Əli (ə), müxalifliyə icazə yoxdur. Ömərin vəsiyyətinə əsasən hər kəs müxaliflik etsə, öldürüləcək. Gəl sən də Əbdürrəhmanın hakimliyini qəbul et». Əli buyurdu: «Bir halda ki, dövran sənə üz tutub, nə üçün tələsdin və məni öldürməklə hədələdin? Mənə aydındır ki, Əbdür-Rəhman sənin tərəfini saxlayacaq, haqqın ziddinə danışacaq. Amma başqa çarə olmadığından, Allahın razılığını və ümmətin xeyirini əsas götürəcəyi şərti ilə onun hakimliyini qəbul edirəm». Əbdür-Rəhman da and içdi ki, hər şey Əli (ə) dediyi kimi .olacaq

Əbdür-Rəhman camaatı Peyğəmbər (s) məscidinə topladı ki, mühacir və ənsarın hüzurunda öz rə'yini bildirsin. Özünü bitərəf göstərmək məqsədi ilə əvvəlcə Əliyə yaxınlaşdı və dedi: «Ya Əli, mən də onu məsləhət görürəm ki, bu gün bütün müsəlmanlar sənə bey'ət etsinlər. Amma bu şərtlə ki, Allahın göstərişi, Peyğəmbərin sünnəsi və əvvəlki iki xəlifənin yolu əsasında hakimlik edəsən». Əbdür-Rəhman gözəl bilirdi ki, bütün yeri və göyü Əliyə versələr haqqın ziddinə danışmaz və hərəkət etməz. O yaxşı başa düşürdü ki, əvvəlki xəlifələr haqqın ziddinə hərəkət etdiyindən Əli (ə) onların yolunu qəbul etməz. Əbdür-Rəhman bu yolla Əlinin (ə) imtina etməsini istəyirdi. həzrət Əli (ə) buyurdu: «Mən Allahın göstərişi və Peyğəmbər sünnəsi əsasında

hakimlik edəcəyəm. Başqalarının yolu ilə yox, Allah razılığı və Peyğəmbər

sünnəsinə əsaslanan öz yolumla gedəcəyəm». Əbdür-Rəhman və Osman, eləcə də bütün camaat Əlidən (ə) başqa bir söz gözləmirdi. Hamı yaxşı bilirdi ki, həzrət Əli (ə) .yalan danışmaz, haqq yoldan sapmaz

Digər bir tərəfdən həzrət Əli (ə) Əbu-Bəkr və Ömərin xilafətini qəsbi sayırdı. O öz haqqının qəsb olunmasından şikayətləndiyi halda, həmin iki şəxsin yolunu necə qəbul !?edə bilərdi

Əbdür-Rəhman Əlidən (ə) kənarlaşıb, Osmana tərəf getdi və Əliyə (ə) dediklərini ona da dedi. Şübhəsiz ki, sevincindən baş-ayaq seçməyən Osman Əbdür-Rəhmanın təklifinə müsbət cavab verdi. O belə bir və'di öz qanı ilə yazıb imzalamağa razı idi. Osman fəryad çəkərək dedi: «And içirəm ki, şeyxlərin (əvvəlki xəlifələrin) yolu ilə .«gedəcək və həmin yoldan kənara çıxmayacağam

Əbdür-Rəhman bey'ət üçün əlini Osmana uzatdı və onu təbrik etdi. Belə bir fürsətin intizarında olan bəni-Üməyyə dəstə-dəstə Osmana yaxınlaşıb bey'ət etdi. Amma bəni-haşim və səhabələrdən bir qrupu, məsələn, Əmmar Yasər, Miqdad bey'ət etməkdən çəkindilər. Beləcə, Əbdür-Rəhman ibn Ovf öz rolunu məharətlə oynadı və Osmanı xilafət kürsüsünə oturaraq Ömərin məqsədini həyata keçirdi. Həzrət Əli (ə) .həqiqət sorağında olduğundan üçüncü dəfə öz qanuni haqqından məhrum edildi

Ömərin tədbirləri sayəsində baş tutmuş müqəddimələr Osmanın xilafətə gətirilməsi və müxaliflik edəcəyi təqdirdə Həzrət Əli (ə) qətlə yetirilməsi məqsədi daşıyırdı. Həzrət Əli (ə) şuranın təşkili və Əbdür-Rəhmanın hiylələri haqqında buyurmuşdur: «Hiylə, özü də .necə hiylə!» Bəli, Ömərin şurası hiyləgərlikdən başqa bir şey deyildi

Təbərsinin nəql etdiyinə görə, həzrət Əli (ə) həmin altı nəfərlik şura məclisində öz fəzilətlərini və üstünlüklərini şuradakıların diqqətinə çatdırdı. Şuradakılar həzrətin dediklərini yekdil şəkildə təsdiqlədilər. Həzrət Əli (ə) buyurdu: «Bir olan Allahdan qorxun, onun hökmünə qarşı çıxmayın, haqqı sahibinə qaytarın, Peyğəmbərinizin sünnəsinə əməl edin. Əgər siz onunla müxalif olsanız, Allaha müxalif olmuşsunuz. Ona görə də xilafət haqqını onun əhlinə qaytarın». Şuradakılar bir-birlərinə baxıb dedilər: «Onun fəzilətini tanıdıq və bildik ki, o, xilafət işinə hamıdan layiqlidir. Amma o kimsəni üstün saymır, bərabərliyə əməl edir. Əgər onu xəlifəliyə seçsəniz, sizi xalqla eyni

.tutacaq. Amma Osman xəlifəliyə seçilsə, sizin mənafelərinizi qoruyacaq

## XƏLİFƏLƏRİN ƏLİDƏN (Ə) ASILILIĞI

Həzrət Əli (ə) Əbu-Bəkrin, Ömərin və Osmanın iyirmi beş il çəkmiş xəlifəliyi dövründə zahirən kənara çəkilib evdə otursa da, İslamın qorunması xatirinə xəlifələrin aciz qaldığı işlərdə onlara yardım əli uzadır, onlara büdrəmələrini xatırladır, çox dəyərli məsləhətlər verirdi. Xəlifələr özləri şəxsən müxtəlif məsələlərlə bağlı yardım almaq üçün Əliyə (ə) müraciət edirdilər. Həzrət (s), doğrudan da, kənara çəkilmiş olsaydı, xəlifələrin nadanlığı səbəbindən İslam öz həqiqi simasını itirərdi. Bə’zi məqamlara :işarə edək

Əbu-Bəkrin xəlifəliyi dövründə bir şəxs şərab içmişdi. Əbu-Bəkr göstəriş verdi ki, ona.١ cəza verilsin. Şərab içmiş şəxs isə e’tiraz edirdi ki, guya şərabın haramlığından xəbərsiz olub. Əbu-Bəkr tərəddüddə qalmışdı. Nəhayət, həzrət Əliyə (ə) müraciət etdi. Həzrət buyurdu: «Mühacirlə ənsar bir yerə toplandığı vaxt bir nəfər uca səslə soruşsun ki, bu adama şərabın haramlığı haqqında bir söz deyən olubmu? Əgər iki nəfər şəhadət versə ki, ona bu barədə deyiblər, cəza verilsin, əks-təqdirdə o azad edilsin». Əbu-Bəkr həzrət Əlinin (ə) dediyi kimi də etdi. Topluma verilən sual cavabsız qaldı və kimsə şəhadət vermədi. Beləcə, cəzalandırılası şəxs azad edildi və ona tapşırıldı ki, .tövbə edib bir daha belə bir iş görməsin

Yəhudi alimlərindən biri Əbu-Bəkrin yanına gəlib dedi: «Sən bu ümmətin.٢ Peyğəmbərinin canişinisən?» Əbu-Bəkr dedi: «Bəli». Yəhudi dedi: «Biz tövratda oxumuşuq ki, peyğəmbərlərin canişinləri həmin ümmətin ən elmli şəxsləri olar. Mənə «?de görüm Allah-təala haradadır? Səmadadır, yoxsa yerdə

Əbu-Bəkr dedi: «Allah səmada, ərşdədir». Yəhudi dedi: «Demək, yer üzündə Allah yoxdur. Sənin deməyindən belə çıxır ki, Allah bir yerdə var, bir yerdə isə yox?» Əbu-Bəkr dedi: «Bu söz zındıqların (kafirlərin) sözüdür. Məndən uzaqlaş, yoxsa səni öldürərəm». Yəhudi Əbu-Bəkrin sözlərinə təəccüb

edərək, İslamı məsxərəyə qoya-qoya uzaqlaşdı. Söhbətə şahid olan həzrət Əli (ə) yəhudini saxlayıb dedi: «Ey yəhudi sənin nə soruşduğunu və nə cavab aldığını eşitdim. Biz deyirik ki, Allah-təala məkanın yaradıcısıdır və onun üçün heç bir məkan yoxdur. Allah heç bir məkanla təmasda olmadan bütün məkanlarda vardır. Onun elmi məkanda olan bütün şeyləri əhatə edir. Onun tədbir dairəsindən kənarda heç bir şey mövcud deyil. Dediklərimin doğruluğunu öz kitabınızla sübuta yetirərəm. Görsən ki, düz deyirəm, iman gətirərsənmi?» Yəhudi dedi: «Bəli». Həzrət buyurdu: «Öz kitablarınızda oxumamısanmı ki, bir gün məşriq tərəfdən bir mələk Musa ibn İmranın yanına gəldi və Musa ondan soruşdu ki, haradan gəldin? Mələk dedi ki, Allah-təala tərəfindən». Sonra Musa məğrib tərəfdən gəlmiş mələyə eyni sualı verdi. Həmin mələkdən də eyni cavabı aldı. Daha sonra başqa bir mələk yeddinci səmadan gəldiyini bildirdi. Növbəti mələk isə yeddinci yerdən gəldiyini bəyan etdi. Musa dedi: «Pakdır O Allah ki, hər yerdə vardır və bir yerə o birindən yaxın deyil».

Yəhudi dedi: «Şəhadət verirəm ki, dediklərin həqiqətdir. Yenə şəhadət verirəm ki, sən Peyğəmbərin canişinliyi məqamını ona zorla qəsb edəndən daha layiqsən».(١)

٣. Həzrət Peyğəmbərin vəfatından sonra bir qrup yəhudi Mədinəyə gəlib dedi: «Qur’anda Kəhf səhabələri haqqında bildirilir ki, onlar ٣٠٩ il orada yatmışlar. Hansı ki, tövratda bu rəqəm ٣٠٠ kimi göstərilmişdir. Bu iki bildiriş bir-birinə ziddir».

Yəhudilərin bu iradı qarşısında təkcə xəlifə yox, bütün səhabələr də aciz qaldılar. Nəhayət, yardım üçün Əliyə (ə) müraciət etdilər. Həzrət buyurdu: «Bu iki bildiriş arasında ziddiyyətin səbəbi odur ki, yəhudilər günəş, ərəblər isə ay təqvimindən istifadə edirlər. Tövrat yəhudi, Qur’an isə ərəb dilində nazil olmuşdur. Günəş təqvimi ilə ٣٠٠ il qəməri təqvimi ilə ٣٠٩ ilə bərabərdir. Günəş ili ilə ay ili arasında on bir gün altı saat fərq vardır. Nəticədə otuz üç şəmsi ili təqribən otuz dörd qəməri ilinə bərabər olur».(٢)



---

١- [٦٠] «Иршад» ١-чи чилд, ٢-чи баб, ٥٨-чи фәсил.

٢- [٦١] «Мүнтәхәбут-тәварих» сәһ. ٦٩٧.

İbn Şəhr Aşub nəql edir ki, Əbu-Bəkrə belə bir sual verdilər: «Bir kişi səhər vaxtı bir .۴ qadınla izdivac etdi. Axşam vaxtı həmin qadın hamiləlikdən azad oldu. Kişinin əcəli çatdı və o öldü. Ana və övladı onun varına sahib durdular. Hansı halda bu iş mümkündür?» Əbu-Bəkr uyğun suala cavab verməkdə aciz qaldı. Həzrət Əli (ə) buyurdu: «Həmin kişinin əvvəlcədən ondan hamilə olmuş kənizi vardı. Doğuş vaxtı yaxınlaşdıqda kənizi azad edib onunla izdivac etdi. Axşam qadın hamiləlikdən azad oldu. Əri öldüyü üçün qadın və onun övladı ərinin varına sahib durdular». Bəli, Əbu-Bəkr .bu sayaq suallara cavab verməkdə aciz idi

İki kişi bir kisəyə yüz dinar qoyub həmin kisəni bir qadına əmanət tapşırmışdılar..۵ Demişdilər ki, yalnız ikimiz birlikdə gəldikdə əmanəti qaytaracaqsan. Bu əhvalatdan bir müddət ötmüş həmin iki şəxsdən biri gəlib öz dostunun dünyasını dəyişdiyini bildirdi və yüz dinarı istədi. Qadın onun tək gəldiyini əsas gətirərək pulu qaytarmaqdan imtina etdi. Kişi qadının qohum-əqrəbası ilə görüşüb məcburi şəkildə qadından yüz dinarı aldı. Bir il keçdikdən sonra ikinci kişi gəldi və yüz dinarı istədi. Qadın bildirdi ki, həmin pulu onun yoldaşı gəlib götürmüşdür. Kişi israr etdi ki, qadın pulu ona qaytarmalıdır. Beləcə mübahisə yarandı və onlar Ömərə müraciət etdilər. Ömər bildirdi ki, qadın zamin olduğundan əmanəti kişiyə qaytarmalıdır. Qadın dedi: «Səni Allaha and verirəm, sən bizi Əlinin (ə) yanına göndər, qoy o öz hökmünü versin». Ömər bu təklifi qəbul edib, onları Əlinin (ə) yanına göndərdi. Həzrət əhvalatı dinləyib başa düşdü ki, həmin iki kişi qadına qarşı hiylə qurmuşlar. Həzrət buyurdu: «Məgər əmanəti tapşırarkən şərt kəsməmişdinizmi ki, yalnız ikiniz birlikdə gəlib əmanəti götürə bilərsiniz?» Kişi ərz etdi: «Elədir». Həzrət buyurdu: «Sənin pulun bizdədir, get öz dostunu gətir və pulunu götür». (Hiyləgər kişi çarəsiz qalıb, qadından əl çəkdi.(۱

Ömərin yanına bir divanə qadın gətirib, onun günaha yol verdiyini dedilər. Ömər .۶ qadının günahına müvafiq olaraq onun daşqalaq edilməsini hökm verdi. Məsələdən xəbər tutan həzrət Əli (ə) Ömərə buyurdu: «Məgər eşitməmisənmi ki, həzrət Peyğəmbər buyurmuşdur: «Üç şəxs mühakimə



---

.Зәхаирул-үгба» сәh. ۷۹» [۶۲] -۱

olunmur: Ağılı başına qayıdanadək divanə, həddi-büluğ olmamış uşaq, yatmış şəxs». Bu sözlərdən sonra Ömər qadını azad etdi.(۱)

۷. Zinaya yol vermiş hamilə bir qadını Ömərin yanına gətirdilər. Qadın günaha yol verdiyini e'tiraf etdi. Ömər onun daşqalaq edilməsini hökm verdi. Qadını daşqalaq etmək istəyərkən həzrət Əli (ə) gəldi və əhvalatı öyrənib qadını Ömərin yanına qaytardı və buyurdu: «Zinaya görə qadın cavabdehdir, onun bətnindəki körpə yox. Bundan əlavə sən onun başına qışqıraraq qorxutmusan və e'tiraf etməyə məcbur etmisən». Ömər dedi: «Bəli, dediyin kimidir». Həzrət Əli (ə) buyurdu: «Məgər eşitməmisənmi ki, Peyğəmbər (s) buyurmuşdur: «Əzab əziyyətlə günahı e'tiraf etdirilmiş kəsə hədd (cəza) yoxdur? Axı istənilən adama işgəncə verilərsə, o, əziyyətdən qurtarmaq üçün ittihamı qəbul edər». Ömər qadını azad edib dedi: «Qadınlar Əliyə (ə) oxşar övlad doğmaqda acizdirlər. Əgər Əli olmasaydı, Ömər həlak olardı.(۲)

۸. Altı aylıq uşaq doğmuş qadını Ömərin yanına gətirdilər. Belə bir fikir vardı ki, əgər qadın doqquz aydan tez doğmuşsa, deməki, o hansısa günaha yol vermişdir. Ömər qadının daşqalaq edilməsinə hökm verdi. Həzrət Əli (ə) Ömərin mühakiməsinə e'tiraz edərək buyurdu: «Bu qadına cəza yoxdur». Belə bir mühakimənin səbəbini soruşduqda həzrət buyurdu: «Qur'ani-Kərimdə buyurulur: «Analar uşaqlarını əmizdirmə müddətini tamamlamaq istəyənlər üçün tam iki il əmizdirsinlər».(۳) Hamiləlik və südvermə müddəti birlikdə ۳۰ aydır. Qadın altı ay hamilə olmuşdur. İyirmi dörd ay isə övladını əmizdirmə müddətidir». Ömər qadını azad edib yenə də «Əli olmasaydı, Ömər həlak olardı» söylədi.

۹. Ömərin yanına bir qadın və bir kişi gətirdilər. Kişi qadını zinakarlıqda ittiham edir, qadın isə ona belə deyirdi: «Sən məndən də zinakarsan». Ömər göstəriş verdi ki, hər iki şəxsə cəza verilsin. Hadisəni müşahidə edən həzrət Əli (ə) buyurdu: «Mühakimə yürütməkdə tələsməyin, bu düz olmaz».



---

۱- [۶۳] «Кәшфул-ғәммә» cəh. ۳۳.

۲- [۶۴] «Кәшфул-ғәммә» cəh. ۳۳.

Soruşdular ki, bəs nə edək? Həzrət buyurdu: «Kişini azad edin, qadına isə ikiqat cəza verin. Çünki kişinin zina etdiyi sübuta yetirilməyib, amma qadın zina etdiyini e’tiraf edir. Qadın kişini özündən də zinakar saymaqla əslində öz zinakarlığını e’tiraf etmişdir. Onun digər bir günahı isə kişini zinada ittiham etməsidir. Hansı ki, iddiasının sübutu üçün heç bir dəlili yoxdur».(۱)

۱۰. Bir kişi bir şəxsi qətlə yetirmişdi. Öldürülənin ailəsi Ömərin yanına şikayətə gəlmişdi. Ömər göstəriş verdi ki, qatili öldürülən şəxsin atasının ixtiyarına versinlər ki, qisas alsın. Öldürülənin atası qatilə iki zərbə yetirib, onun öldüyünü güman etsə də, qatilin canı çıxmadığından o altı ay müalicədən sonra sağalıb ayağa durmuşdu.

Qətlə yetirilənin atası bir gün həmin şəxsi bazarda görüb təəccübləndi. Onu yaxşı tanıdığından yaxasından yapışıb, Ömərin yanına gətirdi. Əhvalatı Ömərə danışdı. Ömər növbəti dəfə qisas üçün göstəriş verdi. Hadisəni izləyən həzrət Əli (ə) Ömərə buyurdu: «Ey Ömər, bu nə hökmdür verirsən?» Ömər dedi: «Ya Əbül-Həsən, bu şəxs bu kişinin oğlunu qətlə yetirib. Ona görə də kişi ondan qisas alıb öldürməlidir». Həzrət buyurdu: «Məgər bir şəxsi iki dəfə öldürmək olarmı?» Ömər həzrətə cavab verməkdə çətinlik çəkdi. Bu vaxt həzrət Əli (ə) qətlə yetirilmiş şəxsin atasına dedi: «Məgər qatil sənin oğlunu iki zərbə ilə öldürməyib?» Kişi ərz etdi: «Mən onu öldürdüm, amma o hələ də sağdır. Əgər onu yenidən öldürməsəm, oğlumun qanı yerdə qalar».

Həzrət Əli (ə) buyurdu: «Əgər iddiandan əl çəkmirsənsə, onda o şəxs sənə iki zərbə vurmalıdır. Əgər sağ qalsan, onda bu şəxsi öldürərsən». Qətlə yetirilənin atası dedi: «Ya Əbəl-Həsən, bu qisas ölümdən də çətindir. Mən fikrimdən daşınıram». Beləcə, həmin iki şəxs arasında sülh bərqərar oldu. Ömər bu sonluğu müşahidə edib dedi: «Əli olmasaydı, Ömər həlak olardı».

۱۱. Ömərin xəlifəliyi zamanı iki qadın bir uşaq üstündə davaya qalxmışdı. Hər biri iddia edirdi ki, uşaq ona məxsusdur. Bu qadınların heç birinin şahidi yoxdu. Başqa bir şəxs də uşaq haqqında iddia irəli sürmürdü. Məsələ



---

۱- [۶۶] «Мәнагибе-Ибн-Шәhр Ашуб».

Ömərə qaranlıq qalmışdı. O çarəsizlikdən Əliyə (ə) müraciət etdi. Həzrət Əli (ə) həmin iki qadını nəsihət edib, ilahi əzabla qorxutdu. Amma heç bir nəticə hasil olmadı və qadınlar öz iddialarından əl çəkmədilər. Həzrət vəziyyəti belə görüb buyurdu: «Mənə bir hərə (mişar) gətirin». Qadınlar həzrətdən mişarı nə üçün istədiyini soruşdular. Həzrət buyurdu: «Uşağı ikiyə bölüb hərənizə yarısını verəcəyəm». Qadınlardan biri susdu o biri isə fəryad çəkərək dedi: «Səni and verirəm Allaha, ya Əbəl-Həsən, əgər bundan başqa bir yol yoxdusa, mən payımdan keçirəm və uşağı bu qadına verirəm». Həzrət buyurdu: «Əllahu Əkbər! Bu uşaq sənindir, ey qadın. Əgər onun uşağı olsaydı, o da sənin kimi öz körpəsinin ölümünə razı olmazdı. Bu söhbətdən sonra o biri qadın həqiqəti e’tiraf etdi və bildirdi ki, uşaq o biri qadınındır. Beləcə, Ömər çətin vəziyyətdən (çıxdı və Əliyə (ə) dua etdi.(١)

Əsbəğ ibn Nəbatədən belə nəql olunur ki, zina ittihamı ilə beş nəfəri Ömərin yanına.١٢ gətirdilər. Ömər göstəriş verdi ki, həmin beş nəfər daş-qalaq edilsin. Həzrət Əli (ə) e’tiraz etdi: «Xalq üzərində mühakimə belə də asan deyil. Bu adamların vəziyyəti nəzərə alınmalıdır». Araşdırma apardıqdan sonra mə’lum oldu ki, həmin beş nəfərdən biri məsihidir və müsəlman qadınla zina edib. Həzrət Əli (ə) buyurdu: «Bu zimmi kişi İslam hökumətinin himayəsində olduğu halda zimmə haqqını pozmuşdur. Ona görə də boynu vurulacaq». İkinci şəxs ailəsi olduğu halda zinaya yol vermişdi. Həzrət buyurdu ki, onu Qur’an hökmü əsasında daş-qalaq etsinlər. Üçüncü kişi isə subay halda zinaya yol verdiyindən həzrət onun haqqında buyurdu: «Ona yüz qamçı vurun». Dördüncü şəxs qul idi. Həzrət bildirdi ki, qulun cəzası azad şəxsin cəzasının yarısı qədərdir. Ona görə də bu şəxsə əlli qamçı vuruldu. Beşinci şəxs isə dəli idi. Həzrətin göstərişi ilə onu azad etdilər. Ömər Həzrət Əli (ə) haqqında əvvəllər söylədiyi məşhur sözü təkrarladı: «Əgər .«Əli olmasaydı, mən rüsvay olardım

Yəmən əhli olan bir kişi arvadını Yəməndə qoyub Mədinəyə iş dalınca gəlmişdi. Bu.١٣ şəhərdə bir qadınla zina etmişdi. Onu zina ittihamı ilə Ömərin yanına gətirdilər. Ömər .göstəriş verdi ki, onu daşqalaq etsinlər



---

١- [٦٧] «Иршад» ١-чи чилд, ٢-чи баб, ٥٩-чу фəсил.

Amma həzrət Əli (ə) Ömərin hökmünə e’tiraz edərək buyurdu: «Bu kişinin ailəsi yanında olmadığından daş-qalaq edilməməli, qamçılanmalıdır. Ona subay kişinin cəzası verilməlidir». Ömər işin belə sadə həll olduğunu görüb dedi: «Allah məni elə bir çətinliyə salmasın ki, Əli həmin çətinliyi aradan qaldırmaq üçün orada olmaya».

۱۴. İbn Əbil-Hədid «Nəhcül-bəlağənin şərhində» yazır: «Bir gün Ömər ibn Xəttabın yanında Kə’bə evinin bərbəzəyinin çoxluğundan danışıldı. Bə’ziləri təklif etdilər ki, həmin qiymətli şeylər qoşun əhlinə paylansın. Guya Kə’bənin ehtiyacı olmayan bu şeyləri əsgərlərə paylamaqla daha çox savab qazanmaq olar. Ömər ona verilən məsləhəti yerinə yetirmək istədi. Əvvəlcə, Əlinin fikrini öyrənmək qərarına gəldi. Həzrət Əli (ə) buyurdu: «İslam Peyğəmbərinə nazil olmuş Qur’an bütün sərvətləri dörd hissəyə bölmüşdür: Müsəlmandan qalmış mal vərəsələrə çatır, qənimət ona haqqı olanlar arasında bölünür, xüms iki istiqamətdə Allah hökmü ilə xərclənilir, sədəqənin də öz sərfolunma yerləri var. Göründüyü kimi Kə’bənin zinətləri haqqında bir söz deyilməyib. Eləcə də, Allah bu barədə söz deməyi yaddan çıxarmayıb. Sən də Allahın və Onun rəsulunun çəkdiyi xətti keçmə». Ömər həzrətin göstərişi ilə Kə’bənin zinətlərindən əl çəkdi.

۱۵. İran və Ərəb arasındakı müharibə zamanı müsəlmanlarla məsləhətləşən Ömərə hərə bir təklif verirdi. Bə’ziləri də təklif edirdilər ki, Şam qoşunu toplanıb Nəhavəndə göndərilsin. Bə’ziləri isə Ömərin öz komandanlığı altında cəbhəyə getmək istəyirdilər. Ömər üzünü həzrət Əliyə (ə) tutub dedi: «Ya Əbəl-Həsən, nə üçün bizə məsləhət vermirsən?» Həzrət Əli (ə) buyurdu: «Şamdan qoşun toplanması və sənin özünün cəbhəyə getməyin məsləhət deyil. Birinci vəziyyətdə Rumla sərhədlər boş buraxılır, ikinci vəziyyətdə isə sən məğlub olacağın halda müsəlmanların üz tutmağa yeri qalmır. Özün komandanlıq fikrindən əl çək və təcrübəli bir adam seç. Həm də cəbhəyə kömək üçün Bəsrə əhlindən qoşun topla. Çünki Bəsrənin vəziyyəti Şamın vəziyyətindən fərqlənir». Ömər həzrətin göstərişinə əməl etdi və müharibədə qələbə qazanıldı. Rum və ərəb döyüşündə də Əlinin (ə) məsləhətləri əsasında qələbə əldə olundu.

۱۶. İbn Səbbağ Maliki «Füsulul-muhimmə» əsərində yazır: Ömərin yanına bir

kişi gətirdilər və bildirdilər ki, sübhü necə açdın sualına belə cavab verib: «Sübhü elə bir halda açdım ki, fitnəni sevirəm, haqqı xoşlamıram, yəhudi və məsihiləri təsdiq edirəm, görmədiyimə iman gətirmişəm və yaranmışı təsdiqləyirəm!» Ömər həzrət Əlinin (ə) ardınca adam göndərib, onu yanına çağırdı. Kişinin danışdıqlarını ona danışdı və izahat istədi. Həzrət Əli (ə) buyurdu: «Bu şəxs fitnə dedikdə övladlarını nəzərdə tutur,(۱) onun xoşlamadığı həqiqət ölümdür(۲), yəhudi və məsihilərin sözünü təsdiq edərkən Allah-təalanın buyuruğunu nəzərdə tutur: «Yəhudilər dedilər ki, məsihilər düzgün bir şeyə istinad etmir, xaçpərəstlər dedilər ki, yəhudilər düzgün bir şeyə istinad etmir».(۳) Bu şəxs görmədiyimə iman gətirdim dedikdə Allah-təalanı nəzərdə tutur».

Ömər dedi: «Allaha pənah aparıram o çətinlikdən ki, onun həllində Əli (ə) yanımda olmaya».(۴)

Şeyx Süleyman Bəlxi «Yənabiul-məvəddət» kitabında yazır: «Həzrət Peyğəmbərin səhabələri Qur’anın hökmləri barədə ona müraciət edər və ondan fitva istəyərdilər. Necə ki, Ömər dəfələrlə demişdi: «Əli (ə) olmasaydı, Ömər həlak olardı».

Osman da öz xilafəti dövründə müxtəlif problemlərin həllində həzrət Əlinin yardımlarından faydalanmışdı. Həzrət Əli (ə) onu elmi, siyasi, fiqhi və digər məsələlərin həllində doğru yola yönəltmişdir. Həzrət Əlinin (ə) bütün bu işlərdə məqsədi İslam və müsəlmanların ümumi mənafeyi olmuşdur. Həzrət İslamın zahiri təşkilatının hifzi üçün səbr və dözüm göstərmiş və ümmət arasında təfriqəyə yol verməmişdir. Həzrət Əli (ə) əksər xəlifələrə, eləcə də, Osmana daim tövsiyələr vermişdir. Amma Osman həzrətin nəsihətlərini qulaqardına vurdu və nəticədə müsəlmanlar tərəfindən qətlə yetirildi.



---

۱- [۶۸] «Әнфал» сурәси, ajә ۲۸.

۲- [۶۹] «Гаф» сурәси, ajә ۱۹.

۳- [۷۰] «Бәгәрә» сурәси, ajә ۱۱۳.

۴- [۷۱] «Фүсулул-муһиммә» cәh. ۱۸.

## ÜÇÜNCÜ HİSSƏ. ƏLİNİN (Ə) XİLAFƏT DÖVRÜ

### OSMANIN QƏTLƏ YETİRİLMƏSİNİN SƏBƏBLƏRİ

Əbdür-Rəhman ibn Ovf Osmana bey’ət etdiyi vaxt onunla şərt kəsmişdi ki, həzrət Peyğəmbərin (s) sünnəsinə və xəlifələrin qaydalarına əməl edəcək. Osman bu şərtləri .qəbul etsə də, xilafət kürsüsünə oturduqdan sonra verdiyi sözə əməl etmədi

Osman başda Əbu-Süfyan olmaqla bəni-Üməyyəni var-dövlət və məqam baxımından tə’min etdi. Osmanın bəni-Üməyyə böyüklərinin iştirakı ilə qurduğu məclisdə Əbu-Süfyan belə dedi: «Xilafət kürsüsünü top tək bir-birinizə ötürün ki, başqasının əlinə (düşməsin. Xilafət dünyəvi bir hakimiyyətdir və mən cənnət-cəhənnəmə inanmıram».(١

Osman beytül-malı (dini büdcəni) öz qohum-əqrəbasına xərcləyir və rəhbər vəzifələrə .öz nəsil nümayəndələrini tə’yin edirdi

Əyalətlərin əhalisi Osmanın hakimlərinin əlindən boğaza yığılmışdı. Xalq Peyğəmbərin səhabələrinə, eləcə də, birbaşa Osmana şikayətlər ünvanlayırdı. Amma şikayətlər heç nəyi dəyişmirdi. Ona görə də müsəlmanlar xəlifənin ləyaqətsiz işlərinin qarşısını almaq qərarına gəlmişdilər. Osman xalqın malını qohum-əqrəbasına, yaxınlarına hədiyyə verirdi. Onun bu hərəkəti Peyğəmbər səhabələrini çox qəzəbləndirirdi. Ona görə də səhabələr bir araya gəlib qərar çıxardılar ki, Osmanın və onun hakimlərinin bütün ləyaqətsiz işlərini yazsınlar və ona məktubla müraciət edib ləyaqətsiz işlərdən .çəkindirsinlər. Əks təqdirdə onu işdən kənarlaşdırmaq qərara alındı

Məktub hazır olduqdan sonra Peyğəmbərin sevimli səhabəsi Əmmar Yasər onu Osmana çatdırdı. Osman məktubu nəzərdən keçirib e’tinasızlıqla bir kənara atdı və .qulamlarına göstəriş verdi ki, Əmmarı cəzalandırsınlar



---

.Әл-әсабә» ۴-чү чилд, cəh. ٨٨» [٧٢] -١

Hətta Osman özü də Əmmara bir neçə təpik vurdu. Əmmar aldığı zərbələrdən huşunu itirdi və sonradan ağır bir xəstəliyə düçar oldu. Bu xəbər tez bir zamanda İslam şəhərlərinə yayıldı. Osmana qarşı qəzəb dalğaları ölkəni bürüdü. Osmanın göstərişi ilə Mədinədən sürgün edilmiş Əbuzər Qəffari məclislərdə açıq-aşkar Osmanın əməllərini .pisləyir, onun yolunu azdığını e'lan edirdi

Osman bəni-Üməyyəyə böyük səxavət göstərirdi. Təkcə Mərvan ibn Həkəm və Zeyd ibn Sabitə beytül-maldan yüz min dinar hədiyyə vermişdi. Bunu eşidən Əbuzər öz e'tiraz səsini qaldırmışdı. Bu səbəbdən də Osman onu Şama sürgün etmişdi. Əbuzərin sözləri Osmanı çox qəzəbləndirmişdi. Əbuzər bir məclisdə xalqdan soruşmuşdu: «Caizdirmi ki, vali müsəlmanların beytül-malından başqasına borc versin?» Kə'bul-əhbar demişdi: «Eybi yoxdur!» Əbuzər Kə'bul-əhbara üz tutaraq belə e'tiraz etmişdi: «Ey yəhudi kişi və qadının oğlu dinimizi sənmi bizə öyrədirsən?» Əbuzər əlindəki əsa ilə Kə'bul-əhbara bir zərbə vurmuşdu ki, başı yarılmışdı. Bu səbəbdən Osman onu Mədinədən çıxarıb Şama göndərmişdi. Deyilənlərə görə Əbuzər orada Osman və Müaviyədən əl çəkməmiş, xalq arasında bu adamların iç üzünü açmaqla məşğul olmuşdu. Müaviyə onu zindana salmış və Osmana məktub yazaraq bildirmişdi ki, Əbuzər xalqı sənin əleyhinə qaldırmaqla məşğuldur. Osman Müaviyəyə göstəriş vermişdi ki, Əbuzəri yalın dəvəyə mindirib işgəncə ilə Mədinəyə göndərsin. Müaviyə .Osmanın tapşırığını yerinə yetirmişdi

Əbuzər Mədinəyə gətirildikdən sonra Osman ona dedi: «Eşitdim ki, Şamda mənim ziddimə sözlər danışırsan». Əbuzər dedi: «Nə demişəmsə, düz demişəm. Mən bir müsəlmanam və öz əmr be mə'ruf və nəhy əz münkər vəzifəmi yerinə yetirirəm». Osman Əbuzərlə mübahisə gücünə malik olmadığından onu Rəbəzəyə sürgün etdi. Hətta Mərvana göstəriş verdi ki, Əbuzər şəhərdən çıxarkən kimsə onu müşayiət etməməlidir. Əksəriyyət Osmanın qorxusundan Əbuzərlə görüşə gəlməsə də, həzrət Əli və bəni-haşimdən bir neçə nəfər başqası Əbuzəri yola salmağa gəldilər, onu ağuşlarına almaqla məhəbbətlərini bildirdilər. Əbuzər Rəbəzəyə çatdıqdan bir müddət .sonra dünyasını dəyişdi

Tarixçilərin yazdığına görə, Misir əhlindən bir qrupu Mədinəyə gəlib, Osmana qarşı çıxdılar. Təhlükə hiss edən Osman həzrət Əlidən (ə) kömək istədi. Həzrət Əli (ə) misirlilərə buyurdu: «Siz haqqı ayağa qaldırmaq üçün qiyam etmisiniz. Amma Osman sizinlə rəftarından peşiman olub və tövbə edib. O, söz verir ki, üç gün müddətində zalım hakiminizi dəyişəcək və istəklərinizi yerinə yetirəcək». Bundan sonra Osmanla misirlilər arasında müqavilə imzalandı. Misirlilər geri qayıdarkən yolda Osmanın Misirə doğru tələsik hərəkət edən qulamını gördülər. Onlar bu işdən şübhələndilər və qulamı saxlayıb onda axtarış apardılar. Osmanın qulamında Misir hakiminə ünvanlanmış məktub tapıldı. Osman Misir valisinə yazırdı: «Allahın adı ilə. Əbdürrəhman ibn Udəys Misirə çatanda ona yüz şallaq vur, başını və saqqalını qırx və uzun müddətə zindana sal. Bu hökmü Əmr ibn Huməq, Sudan ibn Həmran, Ürvə ibn Nəba haqqında da icra et». Misirlilər qəzəblənərək yenidən Osmanın yanına qayıtdılar və onu bu xəyanətinə görə təqsirləndirdilər. Osman belə bir məktub yazdığını inkar etdi və hər şeyi qulamın boynuna atdı. İddia etdi ki, qulam onun dəvəsini də oğurlayıb. misirlilər Osmanın hər sözə qarşı bir bəhanə gətirdiyini görüb onu xilafətə layiq bilmədiklərini söylədilər. Onlar Osmanın iste’fasını tələb edirdilər. Nəhayətdə, misirlilər məclisi qəzəblə tərk etdilər.(١)

Osmanın analığının qardaşı Vəlid ibn Uqbəni Kufəyə vali tə’yin etmişdi. Vəlid daim sərxoşluqla məşğul olan bir adam idi. Bir gün o sərxoş vəziyyətdə məscidə gəlib, sübh namazında pişnamaz dayanmış və iki rəkət əvəzində dörd rəkət namaz qılmışdı. Əbdüllah ibn Məs’ud ona rişxənd edərək demişdi: «Əmr öz səxavətini göstərdi və namazda da hədiyyə etdi».

Kufədən Mədinəyə gəlmiş nümayəndə hey’əti Osmanla görüşüb onun nümayəndəsinin sərxoşluğu haqqında şikayət etdi. Onlar Vəlidin işdən kənarlaşdırılmasını tələb edirdilər. Osman dedi: «Siz ona böhtan atırsınız». Xəlifə Kufədən gələnlərin şikayətinə baxmaq əvəzinə onlara şallaq vurulmasını əmr etdi. Xalqa belə mə’lumat verdi ki, bu adamlar onun



---

١- [٧٣] «Тарихе-Тəбəри» ٣-чү чилд, сəh. ۴٠٢.

.valisinə böhtan atdıqları üçün şər’i me’yarlarla cəzalandırılmışlar

həzrət Əli (ə) Osmanın bu əməlinə e’tiraz edib buyurdu: «Sən günahkar əvəzində şahidi şallaqladın». həzrət öz yetərli dəlilləri ilə xəlifəni onun ləyaqətsiz əməllərindən xəbərdar etdi. Nəhayət, Osman çarəsiz qalıb Vəlidi işdən kənarlaşdırdı və onun yerinə öz əmioğlusu Səid ibn Ası tə’yin etdi. Osman hətta Peyğəmbərin Mədinədən çıxarıb Taifə sürgün etdiyi həkəm ibn As və onun oğlu Mərvan ibn həkəmi Mədinəyə qaytarıb vəzirlik mənsəbinə qaldırdı. hansı ki, bu adamları əvvəlki xəlifələr də Mədinəyə .buraxmamışdılar. Nəticədə Osman müsəlmanların ciddi e’tirazları ilə qarşılaşdı

Osman əmisi oğlu Əbdüllah ibn Amiri Bəsrə və İran hakimliyinə tə’yin etdi. Misir hakimliyi isə Əbdüllah ibn Sə’də tapşırıldı. Ömərin xəlifəliyi dövründə Şam hakimliyinə tə’yin olunmuş Müaviyə ibn Əbu-Süfyan Osmanın vaxtında öz yerini daha da .möhkəmləndirdi və əzəmətli bir qəsr tikdi

Osmanın bütün ləyaqətsiz əməlləri onun öz zərərinə tamamlandı. Nəhayət, bəni-Üməyyə üzərində hökmü zəifləyən Osman hakimiyyət cilovunu əlindən verdi. Məsələn, Müaviyə belə bir fikrə düşdü ki, mərkəzi hökumətə tabeçilikdən çıxsın və Şamı müstəqil bir mərkəzə çevirsin. Ona görə də Osman qiyamçılar tərəfindən hədələndiyi vaxt Müaviyədən yardım istədikdə Müaviyə hiyləgərlik işlədərək ona heç bir yardım göstərmədi və nəticədə Osman qətlə yetirildi. Müaviyə Yezid ibn Əsədin başçılığı altında bir dəstə adamı Mədinəyə göndərsə də, onlara göstəriş verdi ki, Mədinənin təqribən səkkiz fərsəxliyində yerləşən Zi-xəşəb adlanan məhəldə dayansınlar və xüsusi göstəriş gələnədək gözləsinlər. Amma həmin dəstə Osman öldürülənədək heç bir göstəriş almadı. Yalnız bu qətl baş verdikdən sonra onların .geriyə dönməsi barədə əmr gəldi

Xilafətin vəziyyəti günbəgün ağırlaşırdı. Səhabələr Osmana nə qədər nəsihət verirdilərsə də, heç bir faydası olmurdu. Bir dəfə də həzrət Əli (ə) müsəlmanlar tərəfindən nümayəndə olaraq Osmanın yanına getdi. Ona xeyirxahcasına nəsihətlər verdi, bu özbaşınalığın çox pis nəticələnəcəyi barədə xəbərdarlıqlar etdi. Amma Osman bu sayaq sözləri dərk etmək qüvvəsində deyildi. Hətta bir dəfə minbərə qalxaraq səh:٧٧

.xalqı onun e’tirazları müqabilində hədələdi və öz valilərini müdafiə etdi

Mədinə əhalisi vəziyyəti belə görüb çox qəzəbləndi. Küçələrdə açıq-aşkar Osman haqqında pis sözlər danışılırdı. Xalqın qəzəbini Təlhə, Zübeyr, Ayişə və Həfsə daha da .qızışdırırdılar. Nəhayət, bu qiyam Osmanın evinin mühasirəyə alınması ilə nəticələndi

Osman başa düşdü ki, Mədinə müsəlmanları ondan əl çəkən deyil. O, bəni-Üməyyə başçılarını bir yerə toplayıb onlarla məsləhətləşdi. Osmanın müşavirləri ona təklif etdilər ki, ətrafdan kömək istəsin, Şam və Bəsrə qoşununu Mədinəyə gətirib .qiyamçıları yerində oturtsun

Osman dərhal Şam və Bəsrə valiləri olan Müaviyə və Əbdüllah ibn Amirə bu barədə mə’lumat verdi. Əbdüllah Bəsrə məscidinə gedib, xalqı Osmana köməyə çağırdı. Amma kimsə onun istəyinə müsbət cavab vermədi. Müaviyə də yuxarıda qeyd .olunduğu kimi bu işə ciddi yanaşmadı

Müsəlmanlar Osmanın evinin mühasirəsini saatbasaat gücləndirirdilər. Belə ki, Osmanın ətrafla əlaqəsi tamamilə kəsilmişdi. Evdə içməli su qurtardığından Osman çarəsiz qalıb evin damına çıxmış və Əlinin (ə) harada olduğunu soruşmuşdu. Ona cavab verdilər ki, Həzrət Əli (ə) bu işə qarışmır. Sonra Osman su istədi. Amma ona müsbət cavab verilmədi. Osmanın susuz qalması barədə eşidən Həzrət Əli (ə) narahat oldu. Həzrət dərhal bir neçə məşk su hazırlayıb oğlu Həsənlə (ə) Osmana göndərdi. Həsəni (ə) haşimilər müşayiət edirdilər. Osmanın evini mühasirəyə alanlar bu qrupa hücum edib onlara mane olmaq istədilər. Amma Həsən və onun ətrafındakılar suyu .Osman və onun ailəsinə çatdıra bildilər

Müsəlmanlar elə güman edirdilər ki, onlar Osmanın iste’fa verməsinə nail ola biləcəklər. Ona görə də onlar növbəti xəlifənin kimliyi haqqında düşünürdülər. Hansı ki, .nə Osman, nə də bəni-Üməyyə hakimiyyəti əldən vermək fikrində deyildi

Qiyamçılar Osmanın Şam və Bəsrədən qüvvə istədiyindən xəbər tutdular. Ona görə də kömək gəlib çatmamış öz məqsədlərini həyata keçirmək istədilər. Nəhayət, müzakirələrdən sonra Osmanın sarayına hücum edib, səksən iki yaşlı xəlifəni qılınc və .xəncər zərbələri ilə qətlə yetirdilər

Osmanın qətli hicri ٣٥-ci ildə baş verdi. Beləcə iyirmi beş illik çaşqınlıq yolu zahirən başa çatdı. Amma həmin dövrün acı nəticələri həmişəlik olaraq İslam və müsəlmanların .ayağından asıldı

## XƏLİFƏ SEÇİMİ

Osman qətlə yetirildikdən sonra müsəlmanlar Peyğəmbər məscidində toplanıb, xəlifə tə’yinatı haqqında söhbətə başladılar. Osmanın on iki illik fəaliyyəti onlara bir dərs olmuşdu. Yekdil qərar bu idi ki, xilafət işləri onun öhdəsindən tam gələcək bir adama .tapşırılsın

Əmmar Yasər, Malik Əştər, Rəfaə ibn Rafe və digər Əli aşiqləri xalqı həzrətə bey’ətə hazırlayırdılar. Bu adamlar əvvəlki xəlifələrin fəaliyyətini dəqiq şəkildə təhlil edərək, onların Əlinin (ə) xəlifəliyi haqqında Peyğəmbər göstərişindən çıxdıqlarını müsəlmanların nəzərinə çatdırırdılar. Müsəlmanlara həzrət Əlinin (ə) mücahidələri və Peyğəmbərlə yaxınlığı xatırladılırdı. Nəhayət, ictimai fikiri bir sıra həqiqətlərə yönəltmək mümkün oldu. Belə ki, onların sözünün sonunda həm mühacirlər, həm də ənsar yekdil olaraq Əliyə (ə) bey’ət etməyə hazır oldular. Toplum məsciddən çıxaraq həzrət Əlinin (ə) evinə üz tutdu. Onlar Əliyə (ə) dedilər: «Ya Əli, Osman qətlə yetirildi və müsəlman cəmiyyəti xəlifəsiz qaldı. Əlini ver, sənə bey’ət edək. Bu məqama səndən layiqli birisi yoxdur. Bütün müsəlmanlar səmimi qəlbdən sənə bey’ət etməyə .«hazırdırlar

Həzrət Əli (ə) buyurdu: «Əl çəkin və bu iş üçün başqa birini seçin. Mən də sizlərdən biri kimi ona itaət edərəm. Sizə vəzir olmağım əmir olmağımdan daha üstündür». Müsəlmanlar dedilər: «Peyğəmbərin səhabələri onların də’vətini qəbul etməyini istəyirlər». Əli buyurdu: «Sizdə mənim xəlifəliyimə dözmək taqəti yoxdur. Tez-gec məndən üz döndərərsiniz. Çünki xilafət məsələsi sadə və adi bir məsələ deyil. Xəlifəlik onu öhdəsinə götürəni əzən ağır bir yükdür. Bu iş adamın aramlığını və asayişini əlindən alır. Mən ayağımı həqiqət dairəsindən kənara qoyan deyiləm. Müxtəlif təbəqələrə görə haqqı ayağım altına alan, böyüklərin tə’siri altına düşən deyiləm. .Məzlumun haqqını zalımdan alanadək canım sakitləşməz

.«Asilərin burnunu torpağa sürtənədək özümdən razı qala bilmərəm

Həzrət Əli (ə) nə qədər danışdısa da, müsəlmanlar ondan əl çəkməyib itaətkarlıqlarını izhar etdilər. Malik Əştər həzrətə yaxınlaşıb dedi: «Ya Əbəl-Həsən, xalq səndən başqasını istəmir, ayağa qalx. And olsun Allaha, əgər yubanıb bir kənarda dayansan, öz şər'i haqqını dördüncü dəfə itirəcəksən». Bu vaxt müsəlmanların yekdil fəryadı ucaldı: «Səndən ayrılmırıq və sənə bey'ət edirik». Həzrət buyurdu: «Bir halda ki, israr edirsiniz, məscidə toplanıb öz bey'ətinizi aşkarlamaqdan başqa çarə yoxdur. Bu bey'ət .«müsəlmanların razılığı ilə və ümumi şəkildə gerçəkləşməlidir

Müsəlmanlar Peyğəmbər məscidində toplandılar və böyük həvəslə həzrətə bey'ət etdilər. Hətta özləri haqqında çox böyük fikirdə olan Təlhə və Zübeyr kimiləri də hökumətdən imtiyazlar qoparmaq məqsədi ilə Əliyə bey'ət etdilər. Belə ki, həzrətə ilkin bey'ət edən Təlhə oldu. Amma Sə'd Vəqqas, Əbdüllah ibn Ömər və bir qrup başqaları bey'ətdən çəkindilər. Həzrət Əliyə (ə) bey'ət etməyən Əbdüllah ibn Ömər sonralar Həccac ibn Yusif öz müxaliflərini tə'qib etdiyi vaxt qorxusundan onun hüzuruna gəlib bey'ət etmək istədiyini bildirdi. Həccac ona dedi: «Sən Əliyə (ə) bey'ət etmədin, necə olur ki, mənə bey'ət etmək istəyirsən? Səni bu fikirə salan yalnız dar ağacından asılmış cəsədlərdir. Görürsən ki, əlim yazı yazmağa məşğuldur. Əgər istəyirsən, ayağıma bey'ət et». Əbdüllah ibn Ömər də Əlini açıb Həccacın ayağına .uzatdı və ona bey'ət etdi

Həzrət Əli (ə) bey'ət mərasimindən sonra bir xütbə oxuyaraq buyurdu: «Bilin ki, həzrət Peyğəmbərin zamanı olduğunuz çətinliklər yenidən sizin sorağınıza gəlib. And olsun Peyğəmbəri haqq olaraq göndərənə, düzgün olaraq bir-birinizə qatılmalı və sınaq ələyindən keçməlisiz ki, geridə qalmış fəzilət sahibləri qabağa çıxsınlar və nahaqdan .«qabaqda duranlar arxaya keçsinlər

Günahlar harın atlar kimidirlər. Onlar batil və günah əhli olan öz süvarilərini uçuruma yuvarladır. Təqva və pəhrizkarlıq isə cilovu süvarilərinin əlində olan ram olmuş dəvələr kimidirlər. Onlar öz sahiblərini behiştə çatdırarlar. Buna görə də təqva haqq, günah isə batil yoldur. Əgər batil əhli çoxdursa, elə bu qədimdən belə olub. Əgər haqq əhli ,azdırsa

bə’zən az olan da qabaqda dayana bilir və inkişafına da ümid var. Əlbəttə ki, insana arxa çevirmiş bir şeyin yenidən ona üz tutması təsadüfi işdir».

Sonra həzrət Əli (ə) namaz qılıb evinə getdi. Səhəri gün məscidə gəlib xütbə oxudu və xalqı öz iş üsulundan, hakimiyyət proqramından xəbərdar etdi. Bu tanışlıqdan sonra Allaha həmd-səna oxuyub Peyğəmbərə (s) salam göndərdi və buyurdu: «Bilin ki, sizi haqq yola sövq edəcəyəm və uzun illər tərk olunmuş Peyğəmbər yolunu davam etdirəcəyəm. Sizə münasibətdə Allah kitabının göstərişlərini icra edəcək, Allah əmrləri və Peyğəmbər sünnəsindən zərrəcə kənara çıxmayacağam. Sizin asayişinizin tə’minini özüm üçün ilkin iş sayıram. Sizə münasibətdə görəcəyim hər bir iş xeyrinizədir. Amma bu xeyirxahlıq ümumi bir məsləhətdir. Mən bütün xalqı nəzərdə tutacağam, bir qrupu yox. Əvvəllər bu üsulun icrası sizə çətin gələ bilər. Amma dözümlü olun, çətinliyə səbr edin. Yaxşı bilirsiniz ki, nə xilafət tamahım var, nə də bu vəzifəni qəbul etmək istəyində idim. Qövmə rəhbərliyi sizin israrınızla öhdəmə götürdüm. Çünki xalqın gözü mənə dikilmişdi. Ona görə də haqq və ədalətlə rəftar etməliyəm. Mənim bildiyimə görə bə’ziləri böyük sərvətə, gözəl kənizlərə, bərəkətli torpaqlara malikdirlər. Əgər bu adamlar malik olduqları sərvəti haqq və dini ölçülərə əməl etmədən toplamışlarsa, mən onları məcbur edəcəyəm ki, sərvətlərini müsəlmanların beytül-malına qaytarsınlar. Bilməlisiniz ki, müsəlmanlar üçün təqvadan savay imtiyaz yoxdur. Bunun isə əvəzi o biri dünyada veriləcək. Beytül-malın bölünməsində bütün müsəlmanlar nəzərimdə eynidir. Hakimiyyətimin əsasını ədalət və bərabərlik təşkil edir. Çarəsiz məzlumlar nəzərimdə əziz, güclü zalımlar isə zəifdirlər».

Ərəb böyükləri, xüsusi ilə də bəni-Üməyyə Osmanın xilafəti dövründə beytül-malı öz mülkləri sayırdılar. Onlar gözlənilməz bir vəziyyətlə üzləşmişdilər. Onlar güman etmirdilər ki, Əli (ə) belə bir tərzdə danışar. Həzrətdən belə bir ciddi münasibət gözləmirdilər. Peyğəmbərin vəfatından ötən iyirmi beş il ərzində hər şey yaddan çıxmışdı. Hökmlər icra olunmamış qalırdı. Yalnız həzrət Əli (ə) iyirmi beş illik hərc-mərclikdən sonra buyurdu: «Ərəb və əcəm, ağa və qul, qara və ağ İslam qanunları qarşısında eynidirlər.

Beytül-mal tərəfsiz bölünməlidir». Başqa bir məqamda həzrət buyurmuşdur: «And olsun Allaha, Osmanın ona-buna bağışladığı torpaqları və mülkləri sahibinə qaytaracağam. Hətta həmin mal-mülklə qadınlar ərə verilmiş, satın alınmış olsalar belə. Çünki rifah və qurtuluş ədalətin icrası ilə mümkündür. Ədalət kimə ağır gəlsə, zülm-sitəm daha ağır gələsidir». Həzrət göstəriş verdi ki, Osmanın şəxsi mülkünü onun övladları üçün saxlasınlar. Beytül-maldan götürülənləri isə müsəlmanlar arasında bölsünlər. Bu bölgüdə hər şəxsə üç dinar düşdü. Azad olunmuş qul ilə ərəb əyanına .eyni gözlə baxıldı

Qeyd etməliyik ki, həzrətin bu üsulu bir qrupa xoş gəlmədi. Cahiliyyət adətlərinə uyğun olaraq özlərini üstün tutanlar beytül-maldan daha çox pay almaq istəyirdilər. Onlar öz aralarında danışırdılar ki, xəlifə onların qohumluq, ailə ehtiramını alçaltmışdır. Deyirdilər ki, Əli (ə) bizi qara quldan fərqləndirmir. Onlar həzrətin tutduğu yolu özləri .üçün dözülməz sayırdılar

Həzrət Əli (ə) yaxşı bilirdi ki, belə dünyagir insanların bey’əti uzun çəkməyəcək. Həzrət öncədən görürdü ki, belə nüfuzlu adamlar avam xalqı asanlıqla yoldan çıxarır və .haqqa qarşı qaldırır. Elə bu səbəbdən də xilafət məqamını qəbul etmək istəmirdi

.Həzrət Əli (ə) xəlifəlik fəaliyyətinin əvvəlində üç böyük maneə ilə qarşılaşdı

Əbdüllah ibn Ömər, Sə’d Vəqqas kimi tanınmış şəxslərdən bir qrupu həzrətə bey’ət.١ .etməmişdilər

Osmanın Müaviyə kimi valilərinin hər biri ölkənin bir guşəsində istədikləri kimi iş.٢ .aparırdılar. Onları hakimiyyətdən uzaqlaşdırmağın çətinlikləri vardı

Osmanın qətli yenicə baş verdiyindən tüğyan və itaətsizliyə əl atanlar bu işi bəhanə.٣ gətirirdilər. Həzrət Əli (ə) Osmanı qətlə yetirənlərlə münasibəti aydınlaşdırmağa .məcbur idi

Həzrət Əlinin (ə) qısa müddətli xilafəti dövründə onu məşğul edən əsasən bu üç problem oldu. Həzrətin xəlifəliyinin dördüncü günü Əbdüllah ibn Ömər həzrətə dedi: «Belə görünür ki, sənin xilafətindən bütün müsəlmanlar razı deyil. Yaxşı olar ki, bu

məsələni şura icra etsin». Həzrət buyurdu: «Ey axmaq, bu işdən sənə nə? Məgər mən xəlifəlik məqamına çatmaq üçün

xalqa ağız açmışam? Məgər mənim evimə izdihamla yürüş edən xalq olmayıbmı? Hansı əsasla deyirsən ki, bu məsələyə şura baxsın?» Sonra həzrət minbərə çıxdı və əhvalatı cəmiyyətə bəyan etdi. Xalqı Qur'an və Peyğəmbər göstərişlərinə itaətə çağırdı. Bey'ət edənlərin arasında bir qrupu da elə güman edirdi ki, Əlinin də xilafəti Osmanın xilafəti kimidir və həzrətə birinci bey'ət etdiklərindən yaxşı vəzifələr alacaqlar. Təlhə və Zübeyr də belə düşünənlər arasında idilər. Qeyd olunduğu kimi, həzrətə birinci bey'ət edən Təlhə olmuşdu. Bu bey'ət məqsədli idi. Həzrətin beytül-.malı insanlara fərq qoymadan bölüşdürməsi onlara pis tə'sir edirdi

Səhl ibn Hənif dedi: «Ya Əmirəl-mö'minin, sənin üç dinar verdiyin qulu mən azad etmişəm. Sən bu gün öz ətalarında onunla mənim aramda fərq qoymursan». Təlhə, Zübeyr, Mərvan ibn Həkəm, Sə'd ibn As və başqa Qüreyşilər də bu sayaq sözlər söylədilər. Həzrət Əli (ə) bu e'tirazların qarşısında möhkəm dayanmışdı və yolundan dönəsi deyildi. Həzrət onların cavabında buyurdu: «Yoxsa hakimi olduğum şəxsə zülm-sitəm etməkdə yardımçı olmağımı istəyirsiniz? And olsun Allaha, nə qədər ki, gecə-gündüz get-gəldədir, ulduzlar səmada sıralanıb belə bir iş görməyəcəyəm. Hətta mənim şəxsi beytül-malım olsa da, onu fərqsiz böləsiyəm. Hansı ki, bu beytül-mal Allahındır və mən necə fərq qoya bilərəm?» Daha sonra həzrət buyurdu: «Bilin ki, hər hansı malı qeyri-həqiqi yolda sərf etmək israfdır. Düzgün sərf edilməmiş mal onu bağışlayana dünyada ucalıq, axirətdə alçaqlıq gətirər. Belə insanlar xalq yanında hörmətli, Allah yanında isə hörmətsiz olarlar. Malını tə'yinatı üzrə xərcləməyən bütün insanlar təşəkkürdən məhrum edildilər. Çünki onların dostluğu Allaha görə deyildi. Əgər bir gün həmin insanlara ehtiyac yaranarsa, onlar ən pis dost kimi rəftar edərlər. Həzrət Əlinin (ə) xəlifəliyinin ilk günlərində Təlhə və Zübeyr ona e'tiraz edərək bildirdilər: «Biz xalqı sənin xəlifəliyinə rəğbətləndirib bey'ət üçün hazırladıq. Mühacir və ənsar da bizə qulaq asdı və hamısı sənə bey'ət etdi. İndi isə iş başına keçib bizi yaddan çıxarmısan, Malik Əştər və onun kimilərinə üz tutmusan. Həzrət Əli (ə) həmin iki şəxsin göndərdiyi elçidən onların məqsədlərini soruşdu. Elçi ərz etdi: «Təlhə Bəsrənin, Zübeyr isə

Kufənin hakimi olmaq istəyir». Həzrət Əli (ə) buyurdu: «Onlar Mədinədə heç bir məqama sahib olmadıqları halda məni rahat buraxmırlar. Əgər Bəsrə və Kufə onların əlinə keçsə, xalqı mənə qarşı qaldırar, dini işlərdə intizamsızlıq yaradarlar. Mən onların şərindən amanda deyiləm. Bu iki qocaya de ki, Allah və rəsulundan qorxsunlar, Peyğəmbər ümməti arasında fəsad yaratmasınlar. Yəqin ki, Allah-təalanın belə buyurduğunu eşidiblər: «Biz bu axirət yurdunu yer üzündə təkəbbür etməyən və fitnə-fəsad törətməyənlərə qismət edirik. Gözəl aqibət ancaq Allahdan qorxub pis (əməllərdən çəkinənlərindir».(١)

Təlhə və Zübeyr həzrət Əlinin (ə) sözlərindən belə bir qənaətə gəldilər ki, onun ədalətli hakimiyyətində imtiyaz və məqam istəmək faydasız bir işdir və öz arzularını həyata .keçirmək üçün başqa yol axtarmalıdırlar

Digər bir tərəfdən həzrət Əli (ə) xalqın bey’ətindən sonra qərara gəldi ki, ilk fürsətdə Osmanın ləyaqətsiz hakimlərini işdən uzaqlaşdırsın. Bu adamların yerinə saleh adamlar tə’yin olunmalı idi. Bu məqsədlə həzrət Əli (ə) Müaviyə ibn Əbu Süfyana .məktub yazıb, onu öz xilafətindən xəbərdar etdi və bey’ət etməsini istədi

Amma özü xəlifəlik arzusunda olan Müaviyə Əlinin məktubunu Şam əhlindən gizlədi, xalqdan özü üçün bey’ət aldı. Hətta həzrətin məktubuna da cavab vermədi. O, cavabı .yubandırmaqla öz məqsədlərini həyata keçirmək üçün fürsət əldə etdi

Planlarını gerçəkləşdirmək üçün daha çox fürsət əldə etmək istəyən Müaviyə bu məqsədlə həzrət Əliyə (ə) qarşı başqalarını qaldırıb onun başını qatmaq istədi. Bu fikirlə Zübeyrə məktub yazdı və bildirdi ki, Şam əhlindən Təlhə və Zübeyrin növbə ilə xilafəti üçün bey’ət alıb. Müaviyə onlara tövsiyə edirdi ki, Əlidən (ə) qabaq Bəsrə və Kufəni ələ keçirsinlər və Osmanın qanını almaq bəhanəsi ilə Əliyə (ə) qarşı müharibəyə .başlasınlar



---

.Гәсәс» сурәси, ајә ٨٣» [٧۴] -١

(görüşüb ona məktub haqqında mə’lumat verdi.(1)

Bə’zilərinin dediyinə görə, Müaviyə Zübeyrə məktub yazdı ki, Şam əhlindən öz xəlifəliyim üçün bey’ət almışam. Məndən sonra sən, səndən sonra isə Təlhə xəlifə (olacaq.(2)

Bəsrə və Kufənin valiliyi həvəsində olan Təlhə və Zübeyr heç olmaya bu arzularına çatmaq məqsədi ilə Müaviyəyə müsbət cavab verdilər. Onlar Əli (ə) ilə müxalifətə başlayıb həzrətlə düşmənçilik yolu tutdular. Müaviyənin məsləhətinə qulaq asaraq bu işdə Osmanın qətlini bəhanə gətirmək qərarına gəldilər. Onlar Mədinədən çıxıb, Məkkəyə getdilər və Məkkədə həzrət Əlinin digər düşmənləri ilə, o cümlədən Mərvan ibn Həkəm və Ayişə ilə bir araya gəldilər. Bu adamlar öz toplantılarında Cəməl .döyüşünün planını hazırladılar

## CƏMƏL DÖYÜŞÜ

Cəməl döyüşünün səbəbi həzrət Peyğəmbərin vəfatından sonra xəlifələrin azğınlığı ucbatından yaranmış təbəqə ixtilafları idi. Həzrət Əlinin (ə) ədalət və bərabərlik prinsipləri üzərində qurulmuş hakimiyyətində özünə məqam qazana bilməyən Təlhə və Zübeyr kimiləri öz maddi mənafelərinin təhlükə altına düşdüyünü görüb həzrətə qarşı mübarizəyə başladılar. Bu adamlar həzrətə ünvanlanmış müraciətlərinə mənfi cavab almışdılar. Onlar Mədinədə bir iş görə bilmədiklərindən Məkkəyə üz tutdular. Əvvəlcə, Məkkədə ümrə əməllərini yerinə yetirmək bəhanəsi ilə həzrət Əlidən (ə) .şəhərdən çıxmaq icazəsi aldılar

Həzrət buyurdu: «Siz istədiyiniz yerə gedə bilərsiniz. Amma sizin bu səfərinizdə bir hiylə var. Siz öz planınızı Mədinədə həyata keçirə bilmirsiniz». Təlhə və Zübeyr and içdilər ki, .bu səfərdə ümrədən başqa məqsədləri yoxdur



---

1- [75] «Кетабе-Чәмәл» səh. 29.

2- [76] «Мунтәхәбут-Тәварих» səh. 177.

Həzrət Əli (ə) onlara icazə verdi və bu iki şəxsi öz əhdlərini pozmağa çağırdı. Onlarla bey’ətini təzələdi və Peyğəmbərin onların iştirakı ilə dediyi sözləri xatırlatdı. Həzrət Peyğəmbər (s) məhz Təlhə və Zübeyrin gözü qarşısında buyurmuşdu: «Ya Əli (ə), (məndən sonra alçaq insanlarla döyüşəcəksən».(١)

Nəhayət, Təlhə və Zübeyr həzrətin yanından mürəxxəs olub Məkkəyə getdilər. Bu şəhər onların çirkin fəaliyyətləri üçün daha münasib idi.

Təlhə və Zübeyr Məkkəyə gəlməmişdən Ayişə Məkkədə idi. Ayişə bir vaxt xalqı Osmana qarşı təhrik etmiş və bu hərəkətləri bir kənardan izləmişdi. Ayişə dəfələrlə bəyan edirdi ki, «bu alçaq qocanı öldürün». Osmanın evi mühasirəyə alındıqdan sonra və onun öldürüləcəyinə heç bir şübhə qalmadığı vaxt Ayişə yaxasını kənara çəkib Məkkəyə üz tutdu. O, Məkkədə də Osman haqqındakı pis danışıqlarını davam etdirirdi.

Məkkədə həcc mərasimi başa çatdıqdan sonra Mədinəyə qayıdan Ayişə yolda həzrət Əlinin (ə) xilafətə çatdığını eşidib yenidən Məkkəyə döndü. Həmin vaxt Məkkədə Osmanın tərəfdarı, həzrət Əlinin qatı müxalifi Əbdüllah ibn Həzrəmi hakim idi.

Ayişədən əlavə, Məkkə hakimi, Təlhə və Zübeyr, Mərvan və başqa müxaliflər bir araya gəldilər. Yəməndən gəlmiş Yəli ibn Üməyyə, Bəsrədən gəlmiş Əbdullah ibn Amir də onlara qoşuldu.

Bu toplumun uzun-uzadı söhbətləri Cəməl döyüşü üçün müqəddimə oldu. Ayişə Peyğəmbərin o biri arvadlarını da bu dəstəyə qatmaq üçün çox çalışdı. O, bu məqsədlə Ümmü-Sələmə və Həfsəyə də müraciət edib, onları aldatmaq istədi. Amma Ümmü-Sələmənin sərt cavabı onu geriyə əliboş döndərdi.

Ümmü-Sələmə dedi: «Ey Ayişə, məgər xalqı Osmanın qətlinə çağıran sən deyildin?! Nə olub ki, bu gün onun qanını almaq istəyirsən? Əli həzrət Peyğəmbərin (s) qardaşı və canişini olduğu halda onunla düşmənçilik edirsən? Bu gün mühacir də, ənsar da ona bey’ət etmişdir. Bunlar bir yana

dursun, məgər Peyğəmbər öz qadınları haqqında buyurmayıbmı ki, evlərinizdə qərar tutun və cahiliyyət dövründəki kimi özünüzü nümayiş etdirməyin?!» Ümmü-Sələmənin sözləri, xüsusi ilə də Qur’ani-Məcidə istinad etməsi Ayişəni sarsıtdı. O heç bir cavab tapmayıb Ümmi-Sələmədən ümidini üzdü və Həfsənin yanına getdi. Həfsə onun də’vətini qəbul etdi. Amma qardaşı Əbdüllah ibn Ömər bacısına bu işə qatışmağı qadağan etdi. Həfsədən də ümidi üzülən Ayişə tək-tənha yola düşüb, bu avara dəstəyə başçılığı öz öhdəsinə götürdü. Əvvəldə qeyd etdik ki, Müaviyə Zübeyrə məktub yazıb onu xilafət məqamına tamahlandırmaqla Əliyə qarşı müxalifətə çağırmışdı. Müxalif qrupun fikri bu idi ki, əvvəlcə Şama getsinlər və Müaviyəni də Əliyə qarşı qaldırsınlar. Onların bu qərarından xəbər tutan Müaviyə düşündü ki, əgər bu qrupa qatılsa və onlar Əliyə qalib gəlsələr, Müaviyə Təlhə və Zübeyrə bey’ət etməyə məcbur olacaq. Ona görə də başqa bir şəxsin imzası ilə Təlhə və Zübeyrə məktub yazıb, onlara belə bir məsləhət verdi: «Siz Müaviyənin sözlərinə aldanmayın. Ondan sizə bir xeyir dəyməyəcək. Çünki o, Osman tərəfindən hakim tə’yin olunduğu halda Osmana yardım göstərmədi və Osmanı qətlə yetirdilər. Necə ola bilər ki, Müaviyə sizə «?kömək etsin

Məktub Zübeyrə çatdıqdan sonra o bu məktubun məzmunu ilə Ayişəni tanış etdi. Beləcə, azğın dəstə Şama səfər etməkdən vaz keçdi. Onlar qərara gəldilər ki, Bəsrəyə .getsinlər. Çünki Təlhə və Zübeyrin Bəsrə və Kufədə xeyli tərəfdarları vardı

Nəhayət, Ayişə Təlhə və Zübeyrin və digər Əli (ə) müxaliflərinin yardımı ilə Məkkədə qoşun toplaya bildi. Yə’li ibn Üməyyənin maddi yardımlarının hesabına kifayət qədər döyüş vasitələri alındı. Ayişəni bir dəvəyə oturdub Bəsrəyə yola düşdülər. Döyüş Ayişənin dəvəyə süvar olması ilə bağlı «Cəməl» («Dəvə») və Bəsrədə baş verdiyi üçün .«Bəsrə» döyüşü adlandırılmışdır

Dəstə həzrəti duyuq salmayıb, Bəsrəni ondan qabaq fəth etmək üçün istirahət etmədən sür’ətlə yol gedirdi. Onlar yolda Hoəb adlanan bir yerə çatdılar. Gecə olduğundan yorğunluqlarını almaq üçün bu yerdə dayandılar. Həmin gecə Hoəb itləri Ayişənin çadırı ətrafında çox

hürüşdülər. Belə ki, bu itlərin səsindən Ayişə yuxudan oyandı və həmin yerin adını soruşdu. Bu yerin Hoəb adlandığını eşitdikdən sonra qorxuya düşüb tutduğu işdən peşiman oldu. Çünki həzrət Peyğəmbərdən (s) eşitmişdi ki, onun arvadlarından birinə Hoəb itləri hürəcək». Peyğəmbər Ayişəyə müraciətlə demişdi: «Huməyra, məbada sən «!olasan

Həzrətin sözlərini Ayişə indi xatırlamışdı. O, israrla Məkkəyə qayıtmaq istəyirdi. Zübeyr vəziyyəti belə görüb bir neçə yalançı şahid tapdı və onlar iddia etdilər ki, bu yerin adı Hoəb deyil və Hoəb buradan çox-çox uzaqdakı bir məhəllin adıdır. Ayişə onların andına .inandı və yola davam etməyə razılaşdı

Bəsrə yaxınlıqlarına çatdıqları vaxt Zübeyr Bəsrə böyüklərinə məktub yazıb onları Osmanın qanını almaq məqsədi ilə Əliyə qarşı çıxmağa çağırdı. Bəsrə böyükləri belə cavab verdilər ki, Osmanın qatilləri Mədinədədir və sizin bu məqsədlə Bəsrəyə gəlməyiniz məntiqsizdir. Amma müxalif dəstə Bəsrə böyüklərinin sözünə əhəmiyyət verməyib şəhərə hücum etdi. Xeyli adam qətlə yetirdikdən sonra həzrət Əli (ə) tərəfindən Bəsrə hakimi tə'yin olunmuş Osman ibn Hunəyfi təslim olmağa məcbur .etdilər. Beləcə, Bəsrə şəhəri müxaliflərin nəzarəti altına keçdi

Digər bir tərəfdən, həzrət Əli (ə) bu müddət ərzində əyalət hakimlərini dəyişməklə məşğul idi. Əvvəldə qeyd etdik ki, həzrət Əli (ə) məktub yazmaqla Müaviyəni də özünə bey'ətə də'vət etmişdi. Amma Müaviyə həzrətə cavab vermək əvəzində Zübeyrə məktub yazmış, onu Əliyə qarşı çıxmağa vadar etmişdi. Həzrət Əli (ə) ikinci dəfə məktub yazıb Müaviyəni öz mövqeyini müəyyənləşdirməyə çağırdı. Həzrətin Şamdakı nümayəndəsi Müaviyədən ya bey'ət almalı, ya da onun döyüş fikri barədə həzrətə xəbər verməli idi. Müaviyə öz növbəsində həzrət Əlini (ə) Osmanın qətlində ittiham edərək ondan qatilləri təhvil verməsini istədi. Müxalifləri arasında Müaviyənin hamıdan hiyləgər olduğunu bilən həzrət Əli (ə) Şam üzərinə hərəkət edib Müaviyənin işini bitirmək qərarına gəldi. Amma bu məqamda xəbər çatdı ki, Ayişə Təlhə və Zübeyrin yardımı ilə Bəsrəni tutmuşdur və Osmanın qanının alınması bəhanəsi ilə xalqı həzrət Əliyə (ə) qarşı qaldırır. Həzrət Əli (ə) Şam səfərini

saxlayıb, Bəsrə qiyamını yatırmaq qərarına gəldi. həzrət məsciddə minbərə qalxaraq Allaha həmd-səna və Peyğəmbərə salamdan sonra belə buyurdu: «Ey camaat, Ayişə Təlhə və Zübeyrlə birlikdə Bəsrə üzərinə hərəkət etmişdir. həm Təlhə, həm də Zübeyr hakimiyyəti özü üçün istəyir. Təlhə Ayişənin əmisi oğlu, Zübeyr isə onun bacısının əridir. And olsun Allaha, əgər istəklərinə çatsalar, hansı ki heç vaxt çatmayacaqlar, biri o birinin boynunu vurar. And olsun Allaha, qırmızı dəvəyə minmiş bu qadın özünü və yoldaşlarını fəlakətə salacaq. And olsun Allaha onların qoşunun üçdə biri öldürülər, üçdə biri qaçar və üçdə biri tüğyanından dönər. Bu həmin Ayişədir ki, hoəb itləri ona hürər. Təlhə və Zübeyr hər ikisi azğın yola düşdüklərini bilirlər. Amma nə çoxdur elmindən faydalanmayan və cəhaləti içində məhv olan alimlər. Bizə Allah yetər və O ən yaxşı vəkildir».

Əlbəttə ki, Peyğəmbərin (s) arvadı, Əbu-Bəkrin qızı Ayişə, eləcə də tanınmış Peyğəmbər səhabələri olan Təlhə və Zübeyrə qarşı qoşun səfərbər etmək asan iş deyildi. Ona görə də həzrət Əli (ə) bu adamların yol verdikləri azğınlıqları Mədinə əhlinə bəyan etdi. Həzrət Mədinə əhlini Cəməl səhabələri ilə döyüş üçün hazırlayırdı. Bu səbəbdən də səhəri gün yenidən minbərə çıxdı və belə buyurdu: «Mənim müxaliflərim Məkkədən çıxdılar və Peyğəmbərin zövcəsini də bir kəniz imiş kimi özləri ilə Bəsrəyə apardılar. Təlhə və Zübeyr öz qadınlarını evlərində saxladıqları halda, Peyğəmbərin zövcəsini qoşun içərisində nümayiş etdirirlər. Bu qoşunda olanlar öz istəyi ilə mənə bey’ət edib, sonradan bey’ətini sındıranlardır. Onlar mənim valimə, müsəlmanların beytül-malının xəzinadarlarına və digər Bəsrə xalqına hücum edib, bir qrupu ağacla, daşla, digərini hiylə ilə öldürənlərdir».

Həzrət Əli (ə) öz aydın xütbəsi ilə Mədinə əhlini vəziyyətdən xəbərdar etdi. Cəməl əshabının çirkin planları, həzrətə bey’ət etdikdən sonra bu bey’əti sındıran qövmün əmməlləri xalqa açıqlandı. Bu azğınlığın qarşısının alınması üçün Mədinə xalqı ayağa qaldırıldı.

Həzrət Əli (ə) Səhl ibn Hünəyfi Mədinədə öz yerində qoyub, əksəri Bədrdə olmuş mühacir və ənsarı səfərbər etdi. Qoşun Bəsrəyə üz-tutdu.

İmam Həsən, Malik Əştər və Məhəmməd ibn Əbu-Bəkr Kufəyə göndərildi ki, orada .qoşun toplanılsın və bu qoşun həzrət Əlinin (ə) ordusuna qoşulsun

Həmin vaxt Kufə hakimi olan Əbu-Musa Əş'əri tutduğu məqama Osman tərəfindən tə'yin olunmuşdu. Həzrət Əli (ə) ona yazmışdı ki, Kufə xalqından bey'ət alsın. Amma Əbu-Musa elə düşünürdü ki, Osmanın qanının alınmasına havadarlığı, Təlhə və Zübeyrə yardımı onun öz məqamında qalmasına kömək edəcək. O, Kufə xalqını Təlhə və Zübeyri müdafiə etməyə çağırdı. Beləcə, Kufə əhli həzrət Əliyə bey'ətə də'vət .olunmadı

Həzrət Əlinin (ə) nümayəndələri Əbu-Musaya nə qədər nəsihət verdilərsə, heç bir faydası olmadı. İş o yerə çatdı ki, Əştər Əbu-Musanın qulamlarını pərən-pərən salıb vali qərargahını tutmağa məcbur oldu. Həmin vaxt Əbu-Musa məsciddə idi. Malik Əştər məscidə daxil olub Əbu-Musanı minbərdən aşağı endirdi və dedi: «Ey axmaq və xain, xalq Əlidən başqasına bey'ət etməz». Əbu-Musa özünü Malikin əlində aciz görüb susmağa məcbur oldu. Sonra Malik minbərə qalxdı və xalqı Əliyə bey'ətə çağırdı. Təqribən bütün Kufə əhlindən Əliyə bey'ət alındı. Malik Əştər qısa bir müddətdə .Kufədə on iki minlik bir qoşun səfərbər edib həzrətin xidmətinə yola düşdü

Bu qoşun Kufədən çıxıb Zi-qar adlı məhəldə həzrət Əlinin (ə) ordusuna qatıldı. Onlar həzrətlə görüşdən duyduqları sevinci izhar edərək bildirdilər: «Həmd olsun o Allaha ki, səninlə yaxınlığı bizə nəsib etdi». Həzrət Əli (ə) onların məhəbbətlərinə görə təşəkkür edərək, Allaha həmd-səna oxudu, Peyğəmbərə (s) salam göndərdi və kufəliləri Cəməl əshabının hərəkətlərindən xəbərdar etdi. Onlar həzrətin bəyanatlarını dinlədikdən .sonra haqq yolda mübarizə aparmaq hazırlıqlarını e'lan etdilər

Həzrət Əli (ə) öz ordusu ilə Zi-qardan çıxıb Bəsrənin bir neçə kilometrliyində yerləşən Zaviyə adlı məhəldə düşərgə saldı. Sülh və barışı daim döyüşdən üstün tutan həzrət Təlhə və Zübeyrə məktub göndərdi və onları doğru yola də'vət etdi. Məktubdan əlavə, öz yaxın səh:٩٠

adamlarından bir qrupunu Cəməl əshabı ilə müzakirələrə göndərdi. Amma özünü qarşıdakı savaşda qalib görən müxaliflər heç bir nəsihət dinləmədilər. Həzrət Əlinin (ə) Kufədən yardım ala bilməyəcəyini zənn edən Ayişə həzrəti Bəsrə yaxınlığında görüb, Zübeyrə göstəriş verdi ki, Təlhənin və Mərvanın yardımı ilə qoşunu döyüşə hazırlasın. Ayişənin qoşununda otuz minə yaxın adam vardı. Cəməl əshabı bu döyüşçüləri müxtəlif şəhərlərdən toplamışdılar. Həzrət Əlinin (ə) Cəməl əshabı ilə danışığa göndərdiyi nümayəndə müzakirələrin heç bir nəticə vermədiyini və müxaliflərin .döyüşə hazırlaşdığını görüb həzrətin yanına qayıtdı və onu vəziyyətdən xəbərdar etdi

Bu müddət ərzində Bəsrənin Rəbiə qəbiləsindən üç minə yaxın adam həzrət Əlinin (ə) qoşununa qatıldı. Həzrətin ordusunun ümumi sayı iyirmi min nəfərə çatdı. Həzrət Cəməl əshabının savaş fikrində olduğunu görüb öz komandanlarını, o cümlədən Malik Əştəri, Ədi ibn Hatəmi, Məhəmməd ibn Əbu-Bəkri, Əmmar Yasəri Təlhə və Zübeyrin .mövqeyindən xəbərdar etdi və döyüş hazırlığı haqqında əmr verdi

Ayişə öz qoşunu ilə Bəsrənin şimalında yerləşən və müdafiə üçün münasib olan Zaviyədə mövqe tutdu. Qoşunlar üzbəüz dayanmışdılar. Qoşunların üzbəüz nizama salınması tarixi bə’zi mənbələrdə hicri ۳۶-cı il, cəmadiüssaninin ۱۷-si, bə’zi mənbələrdə .isə cəmadiül-əvvəlin ۱۹-u kimi göstərilmişdir

Növbəti gün Zübeyr qoşunun müxtəlif hissələrinə nizamlı şəkildə Əli ordusunun üzərinə yerimək göstərişi verdi. Həzrət savaş alovunun şö’ləndiyini görüb, qoşununa geri çəkilmək əmri verdi. Həzrət hələ də ümid edirdi ki, iş sülhlə başa çata. Ayişə də öz .qoşununa geri dönmək əmri verdi. Beləcə, müharibənin ilk günü savaşsız başa çatdı

Növbəti gün hər iki qoşun savaş libası geydi və qarşı-qarşıya dayandı. Həzrət Əli (ə) qoşunundan ayrılıb tək-tənha və silahsız, Bəsrə qoşununa tərəf hərəkət etdi. Cəməl qoşununun ön sırasına çatıb uca səslə Zübeyri çağırdı. Hamı yerində donub qalmışdı. Heç kim Əlinin (ə) məqsədini anlaya bilmirdi. Həzrətin zirehsiz və qılıncsız halda .düşmən qoşununa yaxınlaşması onun misilsiz rəşadətindən danışırdı

Başdan ayağa polad zireh içində olan Zübeyr Ayişənin kəcavəsi yaxınlığında dayanmışdı. Nəhayət, atını yerindən tərpədib həzrət Əli (ə) ilə üzbəüz dayandı. Zübeyri Əli ilə üzbəüz dayanmış görən Ayişə onun ölümünü gözü qarşısına aldı. Amma ətrafdakılar ona ürək-dirək verirdilər ki, Əli kimsəni bu şəkildə öldürməyib. Həzrətin .qılıncsız gəlməsi onun Zübeyrlə nə barədəsə danışmaq istəyini göstərirdi

Zübeyr Həzrət Əli (ə) ilə göz-gözə dayanıb onun nə deyəcəyini gözləyirdi. Həzrət Əli (ə) buyurdu: «Bu nə büsatdır qurmusunuz?» Zübeyr dedi: «Osmanın qanını almaq istəyirik». Həzrət Əli (ə) buyurdu: «Əgər düz deyirsinizsə, onda qollarınızı bağlayıb özünüzü «?Osmanın valisinə təslim edin. Məgər onun qətlində sizdən başqa biri rol oynayıbmı

Zübeyr susdu. Həzrət Əli (ə) buyurdu: «Mən gəlmişəm ki, səni yarıyoldan qaytarım. Peyğəmbərin sənə buyurduğu bir çox sözləri unutmusan. Onları sənə xatırlamaq istəyirəm. Ey Zübeyr, yadındadırmı ki, bir gün Peyğəmbərin sorağı ilə Əmr ibn Ovfun evinə gəldiyim vaxt həzrət qabağa düşüb salam verdi. Sən dedin ki, Ey Əli, nə üçün təkəbbür edirsən və Peyğəmbərə (s) birinci salam vermirsən? Həmin vaxt həzrət buyurdu: «Ey Zübeyr, Əli təkəbbürlü deyil. Sən gələcəkdə onunla vuruşacaqsan və sənin savaşın zalimanə olacaq. Yadındadırmı ki, bir gün Peyğəmbər sənə belə buyurdu: «Əlini sevirsənmi?» Dedin ki, bəli, o mənim dayım oğludur. Həzrət buyurdu: .«««Bununla belə onunla döyüşəcəksən

Həzrət Əli (ə) Zübeyrə bu sözləri xatırladıqca Zübeyrin iradəsi qırılırdı. O, keçmişləri xatırlayır, Peyğəmbər canişininə qarşı çıxdığı üçün əzaba düçar olacağını hiss edirdi. Nəhayət, Zübeyr xəcalət çəkərək Əlidən (ə) üzr istədi və ərz etdi: «Söz verirəm ki, indicə Bəsrə qoşunundan ayrılacaq və zərrəcə bu işə qarışmayacağam». Həzrət Əli (ə) .öz ordusuna tərəf qayıtdı, Zübeyr də Ayişənin yanına döndü

Ayişə soruşdu: «Əlinin səninlə nə işi vardı?» Zübeyr dedi: «Ötənlər haqqında danışırdı». Ayişə dedi: «Hiss edirəm ki, Əlinin bir neçə kəlməsi səni silkələyib. Əlbəttə ki, buna haqqın da var. Əli ilə üzbəüz dayanıb lərzəyə gəlməyən kimdir?! Bizim rəqibimiz elə bir şəxsdir ki, ərəb qəhrəmanları onun adını çəkəndə titrəyirlər». Ayişə o qədər tikanlı

danışdı ki, nəhayət, Zübeyr qəzəbləndi. Onun oğlu Abdullah da Ayişənin sözlərini təsdiqlədi. Zübeyr öz oğluna dedi: «Mən and içmişəm ki, bu döyüşdə əlimə qılınc almayacağam». Abdullah dedi: «Kəffarə verməklə andı pozmaq olar». Zübeyr qəzəbləndi və qulamını çağıraraq andının kəffarəsi kimi onu azad etdi. Sonra birbaşa .həzrət Əli (ə) qoşununun üzərinə hücuma keçdi

Həzrət Əli (ə) buyurdu: «Zübeyri azad buraxın, onun döyüşmək fikri yoxdur». Zübeyr də bir neçə həmlə nümayiş etdirib, kimsəni yaralamadan, özü də yaralanmadan Bəsrə qoşununa tərəf qayıtdı. Oğlu Abdullah və Ayişəyə üz tutub dedi: «Gördünüzmü, mən onlara həmlə etməkdən qorxmuram». Abdullah güldü və dedi: «Bu da bir növ hiylədir». Amma Zübeyr bu sözlərə qulaq asmadı və Cəməl meydanını tərk etdi. O, vadius-səba deyilən bir yerə getdi və orada Əmr ibn Curmuz adlı birinin qonağı oldu. Zübeyr yuxuya getdikdən sonra Əmr qılıncını çəkib onun başını kəsdi. Bədənini torpağa basdırıb, başını həzrət Əlinin yanına gətirdi. Həzrət buyurdu: «Zübeyri öldürdün? Yaxşı iş görməmisən. Çünki o sənin qonağın idi. Bundan əlavə, həzrət Peyğəmbərdən eşitmişəm ki, Zübeyri qətlə yetirənə lə’nət göndərdi və ona nifrin etdi». Əmr heyrətə gəldi və təəssüf etdi. Sonra həzrət Əliyə dedi: «Mən bilmirəm siz bəni-haşim ailəsi ilə necə rəftar etmək lazımdır? Sizə itaətsizlik edənə də lə’nət göndərirsiniz, düşməninizi (öldürənə də».(۱

Zübeyr getdikdən sonra onun oğlu Abdullah Ayişənin göstərişi ilə Cəməl qoşununa Əli ordusunu oxa tutmaq əmri verdi. Kufə əsgərləri də fəryad çəkib həzrətdən döyüş üçün .icazə istədilər

Hər zaman sülhü döyüşdən üstün tutan həzrət Əli (ə) imkan həddində səbr etdi. Amma həzrət Əli (ə) ordusunun sükutu nəticəsində düşmən daha da cür’ətləndi və onların .oxları bir neçə nəfər Kufə əsgərini yaraladı

Həzrət Əli (ə) müxalifləri hidayət etmək, doğru yola çağırmaq üçün növbəti dəfə Müslim adlı bir gənci bir cild Qur’anla onların yanına göndərdi. Bu gənc onları Qur’an hökmləri ilə yaxından tanış etməli idi. Amma könüllü

olaraq orduya gəlmiş bu xoşbəxt gənc Cəməl ordusuna yaxınlaşdığı vaxt onların qılınc zərbələri altında qollarını itirdi və şəhadət dərəcəsinə çatdı. Onun əlindəki Qur’anın !vərəqləri havaya səpildi

Bu səhnəni müşahidə edən həzrət Əli (ə) buyurdu: «Artıq savaş şirin olmuşdur. O, döyüşçülərə savaş göstərişi verdi və oğlu Məhəmməd Hənəfiyyəni düşmən üzərinə göndərdi. Həzrət buyurdu: «Dağlar yerindən tərpənsin, sən yerindən tərpənmə. Dişini-dişinə sıx, başını Allaha tapşır, ayaqlarını mıx tək yerə çal və qoşunun son sıralarını .«gözünə al. Bil ki, qələbə Allah tərəfindəndir

Məhəmməd Hənəfiyyə dərhal hücuma keçdi. O şücaətli və qəhrəman olmasına baxmayaraq, düşmənin yağdırdığı ox yağışı qarşısında bir qədər dayanmalı oldu. Bu vaxt həzrət Əli (ə) ona yaxınlaşdı və əlini onun sinəsinə vurub buyurdu: «Bu ehtiyat sənə anandan keçib. Atan belə deyil». Həzrət bu sözləri deyib özü düşmən üzərinə hücuma keçdi. Əli saman xırmanına düşmüş alov tək qısa bir müddətdə Cəməl qoşununun sıralarına pərakəndəlik saldı. Qarşısına çıxan bir çox qəhrəmanları qanına qəltan etdi. Həzrət o qədər qılıncı çaldı ki, qılıncı əyildi. Kənara çəkilib qılıncını dizində düzəltdi və yenidən hücuma keçdi. Bir qədər döyüşdükdən sonra qərargaha qayıtdı. Oğlu Məhəmmədə dedi: «Oğlum, belə hücuma keç». Səhabələr həzrətə ərz etdilər ki, .Məhəmməd çox şücaətlidir, amma qəlb və qol gücündə sizin kimisi yoxdur

Bu söhbətdən sonra Məhəmməd Hənəfiyyə bir neçə ənsar və Bədr döyüşçüləri ilə hücuma keçdi. Bu dəfə düşmən qoşunundan xeylisini qılıncdan keçirib geri qayıtdı. Həmin gün Bəsrə qoşununa sarsıdıcı zərbə endirildi. İkinci və üçüncü gün də Kufə əsgərlərinin hücumları nəticəsində Cəməl qoşunu geriyə oturdu. Artıq düşmənin .müqavimət gücü qalmamışdı

Əlinin (ə) Malik Əştər, Əmmar Yasər kimi komandanları hər biri öz növbəsində rəşadət göstərib, düşməni xəzan yarpağı tək yerə tökürdülər. Digər bir tərəfdən Təlhə də xalqı səbr və müqavimətə çağırıb, pərakəndəliyin qarşısını almağa çalışırdı. Bu məqamda Təlhədən heç də xoşlanmayan Mərvan ibn Həkəm öz qulamının arxasında pusqu .qurub zəhərli bir ox atdı, ox Təlhəyə dəyib onu həlak etdi

Təlhənin ölümündən sonra Cəməl qoşunu pərən-pərən düşüb qaçmağa başladı. Həzrət Əlinin (ə) qoşunu əvvəlcə onları tə’qib etdi. Yalnız bəni-Zəbbə qəbiləsi qalıb .Ayişənin kəcavəsini dövrəyə aldı və onu müdafiə etməyə başladı

Həzrət Əlinin sərkərdələri misilsiz şücaətlə hücuma keçib Ayişənin kəcavəsinə üz tutdular. Ayişənin dəvəsinin cilovundan yapışan əl qılınclarla doğranırdı. Nəhayət, Əbdürrəhman ibn Sürəd (başqa bir rəvayətə görə imam Hüseyn) özünü dəvəyə .çatdırıb onu saxladı. Kəcavə yerə aşdı, onun müdafiəçiləri baş götürüb qaçdılar

Həzrət Əli (ə) Ayişəyə yaxınlaşıb buyurdu: «Ey Ayişə, məgər Peyğəmbər sənə beləmi hərəkət etməyi tapşırmışdı?» Ayişə dedi: «Ey Əli, qələbə qazanmısan, yaxşılıq et, malik (olmusan, bağışla».(١)

Həzrət Əli (ə) Məhəmməd ibn Əbu-Bəkrə öz bacısı Ayişədən muğayət olub, onu .Mədinəyə aparmağı tapşırdı

Cəməl döyüşü üç gün çəkdi. Həzrət Əlinin (ə) qoşunu Bəsrə şəhərini tutdu. Həzrətin iyirmi minlik qoşunundan min yeddi yüzü şəhadətə çatdı. Otuz minlik Cəməl qoşunu isə on üç minə yaxın döyüşçüsü qətlə yetirildi. Cəməl döyüşü Ayişə, Təlhə və Zübeyr tərəfindən tövrədilmiş böyük bir fitnə idi. Bu fitnə Təlhə və Zübeyrin ölümü ilə başa çatdı. Həzrətin Ayişə və məğlub olmuş Bəsrə əhli ilə rəftarı onun şəxsiyyətinin .böyüklüyündən danışırdı

Cəməl ordusunun Bəsrə ətrafında gizlənmiş fərariləri aşkara çıxmağa cür’ət etmirdilər. Həzrət Əli (ə) göstəriş verdi ki, silahını yerə qoyub təslim olanlar ümumi əfv fərmanı ilə bağışlanılır. Cəzalandırılacaqlarını gözləyənlər bu xəbəri eşidib, özlərinə .gəldilər və silahlarını yerə qoyub evlərinə qayıtdılar

Həzrət Əli (ə) göstəriş verdi ki, cümə günü xalq Bəsrənin came məscidində namaza toplansın. Əhli məscidə gəlib həzrətlə birlikdə namaz qıldı. Namazdan sonra həzrət Əli (ə) Bəsrə əhlini məzəmmət edərək buyurdu: «Ey Bəsrə əhli, siz bir qadına əsgər və bir dördayaqlıya (Ayişənin dəvəsi) ardıcıl oldunuz. Dəvə ətrafına toplanıb, sonradan ,qaçdınız. Əxlaqınız süst

.«əhdiniz e’tibarsız, ayinləriniz ikiüzlülükdür

Həzrət Əlinin (ə) sözlərini dinləyən Bəsrə əhli xəcalət çəkib üzr istədilər. Onlar .məsciddə təkrar olaraq həzrətə bey’ətlərini təzələdilər

Həzrət Əli (ə) Bəsrədə asayişi bərpa etmək üçün bir neçə gün qaldı. Bu müddət ərzində minbərə çıxıb xütbə oxuyur, xalqı allahpərəstliyə, təqvaya, xeyir işlərə də’vət edirdi. Həzrət öz sözləri ilə xalqı fitnə-fəsaddan çəkindirir, Cəməl fitnəsinin incəliklərini onlara aydınlaşdırırdı. Xalqa anladırdı ki, onların əhdə vəfasızlığı çoxlarının ölümü ilə nəticələndi. Nəhayət, həzrət şəhərdə asayişi bərpa edib, Abdullah ibn Abbası şəhərə hakim tə’yin etdi, özü isə qoşunla birlikdə Kufəyə qayıtdı. Müxtəlif əyalətlərə valilər .tə’yin edildi, Malik Əştər isə Nəsibinə vali göndərildi

Cəməl döyüşünün bir çox ağrılı nəticələri oldu. İslamın mə’nəvi əsaslarına zərbə vuruldu, ərəblər arasında kin-küdurət hissləri qızışdı, ixtilaf və ədavətin əsasları möhkəmləndi. Əlli min nəfərin iştirak etdiyi üç günlük döyüşdə on beş minə yaxın .adam tələf oldu. Bə’ziləri isə bu rəqəmin daha böyük olduğunu bildirirlər

Cəməl döyüşünün digər siyasi nəticələrindən biri əvvəlcədən mövcud olan ixtilafların daha da artması oldu. Həzrət Əlinin (ə) Cəməl döyüşünə qatılmasını fürsət sayan Müaviyə öz hərbi qüdrətini daha da gücləndirdi və onun xilafət arzuları çinləşməyə başladı. Müaviyə bu müddət ərzində müxtəlif bəhanələrlə xalqda həzrət Əliyə (ə) qarşı .mənfi münasibət yaradırdı

### SİFFEYN DÖYÜŞÜ

Cəməl döyüşünün qələbə ilə başa çatması həzrət Əlini (ə) asudəliyə çıxarmadı. Ömər zamanından Şamda hakim olan Müaviyənin itaətsizliyi günbəgün güclənirdi. Müaviyə .xəlifə olmaq fikrində idi. Həzrət Əli (ə) bu hiyləgər rəqibi aradan götürməyə məcbur idi

Həzrət Əli (ə) Şama hücum üçün Kufəni fəaliyyət mərkəzi qərar verdi və qoşunu .hazırlamağa başladı

Nəsibinə hakim tə’yin olunmuş Malik Əştər yolda olarkən Müaviyə səh:۹۶

tərəfindən Hərrana vali tə’yin olunmuş Zöhhak ibn Qeyslə rastlaşdı. Zöhhak Malikin .qarşısını kəsmək istədi. Döyüş başladı və Malik Zöhhakın dəstəsini darmadağın etdi

Zöhhakın məğlubiyyətindən xəbər tutan Müaviyə dərhal Əbdürrəhman ibn Xalidi böyük bir qoşunla Malik üzərinə göndərdi. Malikin dəstəsinə çatan Əbdürrəhman böyük qüvvəyə malik olsa da, Malikin şücaəti nəticəsində biabırçı məğlubiyyətə uğradı. Malikin döyüşçüləri fərariləri tə’qib edib onları şamlıların əlində olan ərazidən .çıxardılar

Malikin məktubu həzrət Əliyə (ə) çatdığı vaxt həzrət minbərə qalxdı və Malikin məktubunu oxuduqdan sonra Müaviyənin hiyləgərliyi haqqında danışdı. Müaviyənin düşmənçiliyinə inanmayanlar onun hiyləgərliyinə əmin oldular. Artıq Müaviyə ilə döyüş .üçün hamı öz hazırlığını bildirirdi

Əvvəlcə qeyd etmişdik ki, həzrət Əli (ə) xəlifə seçildikdən sonra Şama hücum etmək istəyirdi. Amma həmin vaxt Təlhə və Zübeyrin Bəsrəni tutması bu işi tə’xirə saldı. Həzrətin Şama hücum etməkdə məqsədi onun Peyğəmbər canişininə bey’ət etməməsi, hətta bu canişini Osmanın qətlində ittiham etməsi idi. Müaviyə həzrət Əliyə (ə) məktubunda belə yazmışdı: «And olsun canıma, əgər əlin Osmanın qanına batmasaydı, sən də Əbu-Bəkr, Ömər və Osman kimi olardın. Amma sən mühacirləri Osmanın qətlinə təhrik etdin və ənsara Osmana yardım göstərməkdə mane oldun. Nadan xalq sənin sözlərinə itaət edib, onu zalımlıqla qətlə yetirdilər. Nə qədər ki, Osmanın qətlini Şam xalqına, xilafəti şuraya tapşırmamısan, bu xalq səndən əl götürməyəcək. Mən Təlhə və Zübeyr kimi sənə bey’ət etmədiyimdən, onlar üzərində olan hakimliyin mənim üzərimdə yoxdur. Eləcə də, Şam xalqı sənə bey’ət etmiş Bəsrə xalqı kimi deyil. Bununla belə sənin İslamdakı şərafətini, Peyğəmbərlə yaxınlığını, (Qüreyş arasındakı mövqeyini inkar etmirəm».(١

Osmanın qətli ilə bağlı söhbətlərdən mə’lum olur ki, bu qətl həmin dövrdə fitnəkarlıq həvəsində olanlar üçün bəhanə olmuşdur. Bu qətldə elə bir şəxs ittiham olunurdu ki, nəinki bu qətldə iştirak etməmişdi, hətta

.Osmana xeyirxahlıq göstərmiş, evi mühasirədə oluduğu vaxt ona su göndərmişdi

Ustad Əbdüllah Ə’layi «Əyyamul-Husəyn» kitabında belə yazır: «Həmin dövrün gülünc qəribəliklərindən biri budur ki, Əmr As xalqı Osmanın qətlinə təhrik etdiyi Ayişə onunla aşkar müxalifətə qalxdığı, Müaviyə ona yardımdan imtina etdiyi, Təlhə və Zübeyr onun müxaliflərinə yardım göstərdiyi halda, bu adamların hər biri Osmanın qətlində Əlini (ə) ittiham edirdi. Hansı ki, Osmana xeyirxahlıq göstərmiş, ona əməllərinin acı aqibətini .bəyan etmiş yeganə şəxs Əli idi

Həzrət Əli (ə) Müaviyəyə məktubunda yazdı ki, mənə bey’ət ümumi bir bey’ətdir. Bu bey’ət Mədinədə olub-olmamasından asılı olmayaraq bütün müsəlmanlara şamildir. Sən məni Osmanın qətlində ittiham etməklə bey’ətdən yaxa qurtarmaq fikrindəsən. Hamı bilir ki, onu mən öldürməmişəm. Osmanın qanına cavab verməyə sən daha layiqsən. Sən özün o adamlardansan ki, Osmanla müxaliflik etdin, səndən yardım .«istədiyi vaxt yaxanı kənara çəkdin

Həzrət Əli (ə) başqa bir məktubda Müaviyəyə belə yazırdı: «Sənin Osmanın qətli və qatilləri haqqında çox danışmağın yersizdir. Çünki sən xeyirin olanda Osmana yardım .«edirdin. Amma o sənin köməyinə ehtiyac duyduqda onu tənha buraxdın

Həzrət Əli (ə) bir neçə aylıq Kufədə olduğu vaxt məsələni savaşsız həll etmək üçün bir neçə dəfə Müaviyəyə məktub yazdı. Həzrət Əli (ə) Müaviyəni ağır qanlarla nəticələnəcək müxalifətçilikdən çəkinməyə çağırırdı. Amma bu məktublar heç bir müsbət nəticə vermədi. Həzrətin hər məktubuna Müaviyə eyni şəkildə cavab verir və onu Osmanın qətlində ittiham edirdi. Müaviyə məktublarından birini çirkin təbliğatları sayəsində həzrət Əli (ə) ilə düşmən olmuş Əbəsəli bir kişi ilə Əliyə (ə) göndərdi. Həmin şəxs Kufəyə çatan kimi bir başa məscidə getdi və Müaviyənin məktubunu həzrətə təqdim etdi. Həzrət Əli (ə) ondan Şamdakı vəziyyət haqqında soruşdu. Kişi belə cavab verdi: «Bütün Şam əhlinin sinəsi sənə kinlə doludur. Onlar Osmanın qanını almamış sakitləşəsi deyillər». Həzrət Əli (ə) buyurdu: «Ey axmaq, Müaviyə səni aldadıb. Osmanın qatillərindən biri

də Müaviyə özüdür». Səhabələr həmin şəxsi öldürmək istəsələr də, həzrət bu işə mane oldu və buyurdu: «O səfirdir. Səfir üçün təhlükə yoxdur». Sonra həzrət Müaviyənin məktubunu açıb, məktubda yalnız «Bismillahir-Rəhmanir-Rəhim» yazdıldığını gördü. Həzrət ətrafındakılara buyurdu: «Müaviyə savaş qərarındadır». Sonra həzrət öz xoş niyyəti və Müaviyənin hiyləgərliyi haqqında danışdı və xalqı bu hiyləgərliklə .mübarizəyə çağırdı

Həzrət Əlinin (ə) sözlərindən həyacana gəlmiş səfir dedi: «Ya Əmirəl-mö’minin, məni bağışla, sənin ən qatı düşmənin mən idim. Amma indi sənin dostunam. Çünki həqiqətləri mənə çatdırdın. Bildim ki, Müaviyə bütün Şam xalqını aldatmışdır. İcazə ver ki, sənin xidmətçilərin sırasına qatılım. Bu yolla sənə qarşı keçmiş kinimi məhəbbətə çevirim». Həzrət Əli (ə) ona nəvaziş göstərib səhabələrinə tapşırdı ki, bu şəxsdən .muğayət olsunlar

Bu xəbəri eşidən Müaviyə çox narahat oldu və dedi: «Bu kişi bizim bütün sirrimizi Əliyə danışacaq. Ona görə də Əli (ə) bizə hücum etməmiş biz qabağa düşək». Müaviyə öz məqsədini həyata keçirmək üçün bütün yaxınlarına, Mədinədəki Peyğəmbər səhabələrinə, xüsusi ilə də bəni-Üməyyəyə müraciət edib, onları həmkarlığa çağırdı. Bütün bu adamlara ayrı-ayrılıqda məktublar yazıldı. Amma bəni-Üməyyədən başqa onun çağırışlarına müsbət cavab verən olmadı. Hətta Abdullah ibn Ömər açıq-aşkar bildirdi ki, Müaviyənin hiylələrindən xəbərdardır və onun Osmana qəsdən kömək .etmədiyinə əmindir

Bə’zi səhabələr və bir çox başqaları Müaviyəyə Abdullahın cavabına oxşar cavab verdilər. Bəni-Üməyyədən başqa bütün müraciət olunanlardan rədd cavabı alındı. Müaviyə anlayırdı ki, öz məqsədinə asanlıqla çata bilməyəcək və Əli (ə) ilə üzbəüz gəlmək hər adamın işi deyil. Çünki həzrət Əli (ə) bütün baxımlardan Müaviyədən üstün idi. Müaviyə nə zöhd və elmdə, nə şücaət və qəhrəmanlıqda Əli (ə) ilə müqayisə oluna bilməzdi. Həzrət Peyğəmbərə yaxınlıq baxımından da Müaviyə çox zəif mövqeyə malik idi. Düşüncə sahibi olan hər bir insan üçün Əlinin Müaviyədən üstünlüyü aşkar bir həqiqət idi. Yalnız insanları ağıldan məhrum

.etməklə Müaviyənin üstünlüyünə inandırmaq olardı

Bə’zən təsəvvüründə canlandırırdı ki, döyüş meydanındadır və Əli onu mübarizəyə çağırır. Bu düşüncə onu lərzəyə salırdı. Ölümünü gözünün qarşısına gətirsə də, .hakimiyyət istəyi onu rahat buraxmırdı

Müaviyə bir müddət bu düşüncələr içərisində tənha qaldı. O məqsədinə çatmaq üçün münasib yol tapa bilmirdi. Nəhayət, qardaşı Ütbə ibn Əbu-Süfyan dedi: «Bu məsələnin yeganə həll yolu Əmr Ası işə qoşmaqdır. Çünki o siyasət və hiylə baxımından ərəblər arasında məşhurdur. Hiyləyə əl atdıqda avam xalqı aldatmaq asan olur. Xalqın ağlını .«oğurladıqdan sonra onu öz üstünlüyünə inandırmaq olar

Müaviyə dedi: «Əmr As mənim bu də’vətimi qəbul etməz. Çünki o da bilir ki, Əli bütün baxımlardan məndən üstündür». Ütbə dedi: «Sən Əmri pul və və’d ilə aldat, Əmr də «!xalqı aldatsın

Müaviyə qardaşının təklifini bəyəndi və həmin vaxt Fələstində olan Əmr Asa məktub yazdı. Məktubun məzmunu belə idi ki, mən Osman tərəfindən Şamda hakiməm, Osman da Peyğəmbərin xəlifəsi idi; o evində susuz və məzlum halda öldürüldü; sən bilirsən ki, müsəlmanlar onun qətlinə görə qəmlidirlər; Osmanın qanını almaq lazımdır; mən səni bu intiqamda iştirak etməyə çağırıram; bu işdə böyük mükafat və savabın «!olacaq

Müaviyə ilk əvvəl Əmr Asa öz məqsədini açmaq istəmədi. Əmr Ası də’vət etməkdə yeganə məqsədi müharibədə qələbə qazanmaq üçün onun vücudundan istifadə etmək idi. Amma ərəblər arasında hiyləgərlikdə misli olmayan Əmr Müaviyənin məktubunu oxuyan kimi onun əsl məqsədini anladı və Müaviyəyə belə bir cavab yazdı: «Ey Müaviyə, məni haqqa qarşı, Əli ilə döyüşə çağırırsan. Hansı ki, həzrət Əli (ə) Peyğəmbərin qardaşı, canişini və varisidir. Sən ki özünü Osmanın hakimi bilirsən. Osman öldükdən sonra sənin hakimiyyətin başa çatıb». Əmr As öz məktubunda İslam, həzrət Əlinin imanı, həzrətin iştirak etdiyi savaşlar və onun hərbi xidmətləri haqqında danışırdı. O, Müaviyəyə Əli haqqında nazil olmuş ayə və hədisləri xatırladırdı. Məktubunun sonunda isə əlavə etdi ki, sənin məktubunun cavabı budur ki, mən .yazdım

Fələstindən Şama gətirməyə müvəffəq olmayıb. O məcbur olub, yeni bir məktub yazdı və bu məktubda hər şeyi açıq şəkildə Əmr Asa bildirdi: «Ey Əmr, Təlhə və Zübeyrin Əli ilə savaşı haqqında eşitdin. İndi isə Mərvan ibn Həkəm Bəsrə əhlindən bir qrupu ilə mənim yanıma gəlib, Əli də məndən bey’ət istəyir. Gözümü sənin yoluna dikmişəm ki, bu məsələlər barədə söhbət edim. Özünü mənə yetirməkdə tələs, burada səni cah-cəlal, məqam gözləyir».

Hərislik qocanı həvəsə salar,

Sübhün yuxusunu gözlərdən alar.

Əmr As özünü tələsik Şama çatdırdı. Müaviyə onu gülər üzlə qarşılayıb girami tutdu. Ara sakitləşdikdən sonra Müaviyə Əmr Asla ikilikdə qaldıqda yenidən rəsmi tərzdə söhbətə başladı və onu Osmanın qanının alınmasına rəğbətləndirdi.

Əmr Müaviyənin qeyd-şərtsiz işə keçdiyini görüb, Əlini mədh etməyə başladı. O həzrət Əlinin (ə) Peyğəmbər (s) qəzavatlarındakı şəhadətlərini yada saldı, sonra isə Müaviyəyə e’tirazla dedi: «Sənin məqsədini həyata keçirmək çətin olmaqla yanaşı, həm də axirətini puça çıxarır».

Müaviyə dedi: «Mən axirət istəyi ilə bu işdə qədəm atıram. Məzlumcasına qətlə yetirilmiş Peyğəmbər xəlifəsi Osmanın qanı uğrunda qiyam etməkdən yaxşı iş ola bilərmi?» Əmr dedi: «Ey Müaviyə, sən məni çağırmısan ki, mən xalqı aldadım. İndi isə özün məni aldatmaq istəyirsən.

Ərəbin ən hiyləgər adamını avam yerinə qoyma. Hansı ağıllı adam sənin sözlərinə inanar?! Əgər doğrudan da Osmanın halına yanırdınsa, mühasirədə qalıb səndən yardım istəyəndə nə üçün kömək etmirdin? Sənin xilafətdə gözün var. Osmanın qanının alınması isə bir bəhanədir. Əgər bu işdə səninlə həmkarlıq etməyimi istəyirsənsə, mənimlə öz dilimdə danışmalısan və sədaqətli olmalısan. Çünki biz bir-birimizi yaxşı tanıyırıq və bir-birimizi aldatmağımız da mə’nasızdır. Səninlə həmkarlıq edəcəyim təqdirdə sən xəlifəlik istədiyin kimi, mən də Misir hakimliyini istəyirəm. Öhdənə götür ki, Misir hakimliyi həmişə mənim olacaq və heç vaxt geri «!almayacaqsan

Niyyətindən Əmr Asın xəbərdar olduğunu görən Müaviyə Misir hakimliyini ona və’d etmədən arzusuna çatmayacağını hiss edib Əmrin təklifini qəbul etdi. Aralarında müqavilə imzalandı ki, Müaviyə Əliyə qələbə çalıb xilafət məqamına çatacağı təqdirdə Misir hakimliyini Əmr Asa verəcək. Müaviyə hiylə işlədərək müqavilənin sonunda öz katibinə dedi: «Yaz ki, Əmr Müaviyəyə itaət şərtini pozmayacaq». Müaviyə Əmr Ası mütləq bir bey’ətə sövq etmək istəyirdi. Yə’ni hətta Misir hakimliyi Əmr Asa verilməyəcəyi halda da o, Müaviyəyə qarşı çıxa bilməzdi. Amma Əmr As Müaviyədən cəld tərpənib dedi: «Yaz ki, Müaviyəyə itaət qeyd olunmuş şərtlər pozulanadək sındırılmayacaq». Əmr As demək istəyirdi ki, Misir hakimliyini almayacağı təqdirdə Müaviyəyə itaəti özünə vacib bilməyəcək. Bir sözlə, Əmr As Müaviyədən yazılı öhdəlik .aldı və özünü Müaviyənin ixtiyarına verib onun vəziri, müşaviri oldu

Müaviyə ilkin fürsətdə Əmr Ası hüzuruna çağırıb ona mövcud çətinliklər haqqına mə’lumat verdi. Müaviyənin müşküllərindən biri bu idi ki, onun ilkin düşmənlərindən olan Məhəmməd ibn Əbu-Huzəyfə zindandan qaçmışdı. Bu məsələ Müaviyəni çox narahat edirdi. Ona görə də Əmrə dedi: «Əgər mən Əli ilə döyüş üçün Şamdan çıxsam, qorxuram ki, Məhəmməd arxadan Şama hücum edib onu ələ keçirə. Bundan da təhlükəlisi Əli (ə) ilə savaşdır. O, mənim yanıma adam göndərib bey’ət istəmişdir. Rum dövləti də aramızdakı ixtilafdan istifadə edib Şama hücum etmək fikrindəndir». Əmr As ,bir qədər düşünüb dedi: «Ən əsası Əli ilə döyüşdür. Əvvəla

Məhəmməd ibn Əbu-Huzəyfə o qədər də qorxulu deyil. Digər tərəfdən Rum dövlətini hədiyyələrlə müvəqqəti də olsa sakitləşdirmək mümkündür. Sənin əsl təlaşın Əli ilə döyüşə yönəlməlidir. Müaviyə dedi: «Nə desən edəcəyəm». Əmr As Məhəmmədi tə’qib etmək üçün xüsusi bir dəstə göndərdi. Onlar Məhəmmədi həbs edib qətlə yetirdilər. Sonra Əmr Rum imperatoruna hədiyyələr göndərməklə onun başını qatdı. Nəhayət .bütün güc Əli (ə) ilə döyüş üçün qoşun hazırlanmasına sərf edildi

Müaviyə həzrət Əli (ə) ilə savaşda qələbə üçün heç bir çirkin yoldan çəkinmirdi. O, Osmanın qanının alınması bəhanəsi ilə Şam xalqını Əliyə (ə) qarşı qaldırdı. Hər yerdə həzrət Əli (ə) təhqir olunur, şamlıların qəlbində ona qarşı kin yaradılırdı. Belə ki, Əliyə .(ə) qarşı üç yüz minlik ordu təchiz olundu

Digər bir tərəfdən, həzrət Əli (ə) sülh yolu ilə Müaviyəni bey’ətə sövq edə bilmədi. Malik Əştərin məktubu da Müaviyə ilə döyüşün labüdlüyünü göstərirdi. Bəsrə valisi Abdullah ibn Abbasa göstəriş verildi ki, şəhər əhlini təchiz edib Kufəyə göndərsin. Bu məqsədlə bir neçə şəxs, eləcə də, Malik Əştər həzrətin hüzuruna çağırıldı. Həzrət özü minbərə qalxdı və onları Müaviyənin məqsədlərindən xəbərdar etdi. Sonra qoşun .səfərbərliyinə başlanıldı

Siffeyn döyüşü haqqında danışmazdan əvvəl Müaviyə və Əmr Asın bioqrafiyasına .nəzər salmaq yaxşı olardı

### ?MÜAVİYƏ KİMDİR

Müaviyə iki çirkin vücuddan dünyaya gəlmiş varlıq idi. Bu şəxs irsiyyət qanuna əsasən, öz ata-anasının çirkin xüsusiyyətlərinin daşıyıcısı idi. Atası Əbu-Süfyan Qüreyş müşriklərinin və bütpərəstlərinin başçısı olmuşdu. Allah-təala Qur’anda bu şəxs haqqında buyurur: «Küfr başçıları ilə döyüş, onların andları möhtərəm deyil ki, ona (riayət edilsin!»(۱

Peyğəmbərin əksər qəzavatlarında Əbu-Süfyan bütpərəst və müşrik qoşununun başçısı olurdu. Əslində Ühüd, Bədr və Əhzab döyüşlərini bu adam

qızışdırmışdı. Əbu-Süfyan həzrət Peyğəmbərlə bir il düşmənçilik etdi. Məkkənin fəthi zamanı qılınc qorxusundan İslamı qəbul etdi. Daxilində kafir və bütpərəstliyində qaldı. Müaviyənin anası isə Ütbə ibn Rəbiənin qızı Hind idi. Bu qadının həzrət Peyğəmbərlə dərin düşmənçiliyi vardı. Bu qadın Məkkədə həzrətə olmazın əzab-əziyyətini verirdi. Ühüd savaşında isə başqa qadınlarla birlikdə kişilərin ardınca hərəkət edir, dəf çalmaqla onları döyüşə həvəsləndirirdi. Həmin döyüşün sonunda Peyğəmbərin əmisi Həmzənin ciyərini çıxartdırıb dişlərinə çəkdi. Həmin vaxtdan Hində «ciyərxar» deməyə başladılar. Hindin göstərişi ilə Həmzəni qətlə yetirmiş Vəhşi sonradan İslamı qəbul etdi .və həzrət Peyğəmbər onu bağışladı

Cahiliyyət dövründə Hind öz əxlaqsızlığı ilə məşhur idi. Müaviyə də həmin vaxtlarda dünyaya gəlmişdi. Zəməxşəri «Rəbiül-əbrarda» nəql edir ki, həmin vaxtlar dörd kişi Müaviyənin atası sayılırdı: Əbu-Əmr ibn Müsafir, Abbas ibn Əbdül-Müttəlib, Əmarə ibn Vəlid, Səbbah adlı bir qara şəxs. Bu məsələyə İbn Əbil-Hədid də «Nəhcül-bəlağənin» şərhində toxunmuşdur. «Ən-nəsayehul-kafiyyə» kitabının müəllifi Məhəmməd ibn Əqil yazır ki, Həssan ibn Sabit Hind və onun ərini həcv edər, Peyğəmbər və səhabələri isə bu şe'rləri dinləyib e'tiraz etməzdilər. Bəli, Müaviyə belə ata və anadan dünyaya gəlmişdi. O həm ata, həm də anasının çirkin əxlaqını daşıyırdı. O da müsəlmanlara qarşı döyüşlərdə iştirak edib, nəhayətdə, qorxusundan İslamı qəbul etdi. Həzrət Əli (ə) Müaviyə və onun atasının qılınc qorxusundan iman gətirməsi barədə Müaviyəyə belə buyurmuşdur: «Babanı (Ütbəni), dayını (Vəlidi), qardaşını (Hənzələni) Bədr döyüşündə öldürən mən oldum. Həmin qılınc yenə əlimdədir. Mən həmin cür'ətlə düşmənlərimlə üzbəüz gəlirəm. Başqasının dinini qəbul etməmişəm, təzə Peyğəmbər seçməmişəm. Mən elə bir yoldayam ki, siz həmin yolu ixtiyari olaraq tərk etmiş, məcbur qalaraq .«qəbul etmisiniz

Məhəmməd ibn Cərir Təbəri nəql edir ki, həzrət Peyğəmbər buyurmuşdur: «Əgər Müaviyəni mənim minbərimdə görsəniz, onu öldürün». Təbərinin yazdığına görə, Əbu-Süfyan ulağa süvar, Müaviyə onun cilovundan tutmuş, qardaşı isə arxalarınca gələn halda Peyğəmbər onların haqqında buyurdu: «Allah

.«hər üçünə lə’nət etsin

Məsihi alimi Corc Cordaq «İmam Əli (ə)» əsərinin dördüncü hissəsində yazır: «Üməyyənin bütün çirkin sifətlərinə malik olan şəxs Müaviyə ibn Əbu-Süfyandır. Müaviyənin ilkin nəzərə çarpan sifəti onun insaniyyət və İslamdan xəbərsiz olmasıdır. .«Onun əməlləri İslamdan uzaq olduğunu sübut edir

## ƏMR AS

Bu hiyləgər ərəb də əsil-nəsil baxımından Müaviyə kimi çirkin bir şəxsdir. Zəməxşərinin yazdığına görə onun anası əvvəlcə kəniz olmuş, günahda məhşurluğuna görə ağası tərəfindən azad edilmişdir. Qadın öz azadlığından istifadə edərək azğınlığını daha da .artırmış və belə bir məqamda Əmr Asa hamilə olmuşdur

Əvvəllər Əmr beş atası ilə tanınırdı: Əbu-Ləhəb, Üməyyə ibn Xələf, Əbu-Süfyan, As, Hişam ibn Muğəyrə. Cahiliyyət dövrünün ən’ənələrinə uyğun olaraq Əmr dünyaya gəldikdən sonra bu beş nəfərin hər biri onun atası olduğunu iddia etmişdir. Nəhayət, uşağa ata seçimi anaya tapşırılmışdır. O da Ası daha sərvətli görüb, onu öz uşağına ata seçmişdir. Hansı ki, Əmr Əbu-Süfyana daha çox oxşamışdır. Həssan ibn Sabit bu :barədə belə bir şe’r oxumuşdur

,Şəksiz, Əbu-Süfyan onun atası

.Əmr oxşarlıqla ona çatası

Əmr As da Müaviyə kimi Peyğəmbər və onun Əhli-beyti ilə düşmən olmuşdur. O həzrət Peyğəmbəri həcv edən qəsidələr yazmışdır. Peyğəmbər onunla bağlı demişdir: «Pərvərdigara, mən şair deyiləm ki, onun şe’rinə cavab verim. Onun beytlərindəki .«həriflərin sayı qədər ona lə’nət et

Əmr As daim Peyğəmbərə müxalif cəbhədə olmuşdur. O Həbəşəyə hicrət edənləri geri qaytarmaq üçün Qüreyş tərəfindən nümayəndə kimi göndərilmişdir. Cə’fər ibn Əbu-Talib Nəcaşinin hüzurunda onu məhkum edən vaxt düşmənçiliyə başladı. Ömərin dövründə Misir hakimi olduğu vaxt

müsəlmanların beytül-malını dağıdırdı. Onun Müaviyə ilə həmkarlığa qatıldıqdan sonra .etdiyi cinayətlər haqqında söhbətimizin davamında danışacağıq

Bir sözlə, ərəblər arasında hiyləgərliyi ilə məşhur olan bu iki şəxs əl-ələ verərək dünya məqsədləri naminə həzrət Əliyə qarşı bayraq qaldırdılar. Müaviyə böyük bir qoşunla Şamdan çıxıb Siffeyn adlı məhəldə, Fəratın kənarında düşərgə qurdu və həzrətə .müharibə e'lan etdi

Həzrət Əli (ə) öz qoşununu Nuxəylədə nizama salıb ən ləyaqətli insanları sərkərdə .tə'yin edirdi. Hicri ۳۶-cı il, şəvvalın beşində həzrətin qoşunu Mədain yoluna üz tutdu

Onlar Mədainə çatdıqdan sonra bir neçə gün orada qaldılar. Mədaində olduqları vaxt xalqın bə'zi istəklərini yerinə yetirdilər, sonra isə Siffeynə yola düşdülər. Nəhayət, .Əlinin (ə) qoşunu Müaviyənin qoşunu ilə üzbəüz mövqe tutdu

Malik Əştər, Qeys ibn Sə'd, Əmmar Yasər, Məhəmməd ibn Əbu-Bəkr, Uvəys Qərəni, Ədi ibn Hatəm, Əbu Əyyub Ənsari, Haşim ibn Ütbə (Mirqal), Xuzəymə ibn Sabit həzrət .Əlinin sərkərdələri sırasında idilər

Həzrət Əli (ə) bu döyüşdə də Cəməl döyüşündə olduğu kimi düşmənə öyüd-nəsihət verdi, Müaviyəyə yenidən məktub yazıb onu döyüşün ağır nəticələrindən agah etdi. Həzrət öz əsgərlərinə buyurdu: «Nə qədər ki, onlar sizinlə döyüşmür, siz də döyüşməyin. Şükr olsun Allaha ki, möhkəm dəlillərimiz var. Onlar döyüşə başlamamış sizin döyüşə girməməyiniz də haqlı olmağınızın dəlilidir. Əgər döyüş başlasa, Allahın iradəsi ilə onlar qaçsalar, qaçanları öldürməyin, geri qalanları yaralamayın, yaralıları .«qətlə yetirməyin. Qadınları sizi təhqir etsələr də, onları incitməyin

Müaviyə nəinki həzrətin məktublarına, nəsihətlərinə əhəmiyyət vermədi, hətta öz qoşununu bir az da qızışdırdı. O qoşunu qarşısında xütbə oxuyub dedi: «Bu döyüşdə süstlük göstərməyin. Canınızdan keçin, çünki siz haqsınız, sizin üçün dəlil var. Siz elə bir kəslə döyüşürsünüz ki, Osmanla bey'əti sındırıb və nahaq olaraq onun qanını töküb. Allahın yanında onun heç bir üzrü yoxdur». Əmr As da şamlılarla eynən Müaviyə kimi danışdı və onları döyüşə təhrik etdi. Müaviyə və Əmr Asın qoşuna müraciətindən xəbər tutan

həzrət Əli (ə) öz qoşununu şamlılarla döyüşə hazırlamaq üçün Allaha həmd-səna oxuduqdan sonra buyurdu: «Ey Allahın bəndələri, Allahdan qorxun. Döyüş zamanı sizi qorxudası şeylərə göz yumun. Səsinizi yavaşıdıb, az danışın. Düşmənlə üzbəüz gəlmək, onunla döyüş, qılınc çalmaq və nizə atmaq, düşmənin yaxasından yapışmaq üçün qəlbinizi gücləndirin və sabitqədəm olun. Allahı daha çox zikr edin ki, xilas olasınız. Allaha və onun rəsuluna itaət edin və bir-birinizlə didişməyin ki, süst olarsınız və gücünüz azalar. Səbirli olun, çünki Allah səbirlilərlədir. Pərvərdigara, bunların qəlbində səbr qərar ver, onlara yardımçı ol və mükafatlarını böyük buyur».

Siffeynə Əlidən (ə) qabaq çatmış Müaviyə suya yaxın yerdə düşərgə qurmuş və Fərata yolu bağlamışdı. Amma Malik Əştər Əlinin (ə) göstərişi ilə Fəratın qabağını kəsmiş, şamlılara hücum edib, onları pərən-pərən saldı və fərata yol açdı. Həzrət Əli (ə) Fərat ətrafını tutduqdan sonra düşmən qoşununun suya yolunu kəsmədi.

Müaviyə şamlıların ruhiyyəsindəki sınıqlığı aradan qaldırmaq üçün ən məşhur cəngavər Səhmi çağırıb onu Maliklə döyüşə göndərdi. Böyük bir ata minmiş, polad zirehə bürünmüş Səhm Kufə qoşununun qarşısına çıxıb Maliki mübarizəyə çağırdı. Bir çox ərəb qəhrəmanlarını qılıncı ilə ikiyə bölmüş Malik qəzəbli şir tək meydana çıxdı. Səhm o qədər heybətli idi ki, hətta Kufə əsgərləri də Malikə görə narahat oldular. Şamlı cəngavər əvvəlcə Maliki təhqir etdi, sonra isə hücuma keçdi. Malik düşmənin hücumlarının qarşısını məharətlə aldı və ilkin fürsətdə qılıncını onun sinəsinə sancdı. Bu vaxt başqa iki şamlı Malikin üzərinə hücuma keçdi. Amma Malik bu qəfil hücumun qarşısında özünü itirməyib hər iki şamlını qətlə yetirdi və öz düşərgəsinə qayıtdı.

Bu zəhimli cəngavərin ölümündən sonra Müaviyə Übeydullah ibn Öməri bir dəstə döyüşçü ilə kufəlilərin üstünə göndərdi. Übeydullah meydanda rəcəz oxuyub özünü tə’rif etdi və mübariz çağırdı. Həzrət Əli (ə) onunla döyüşə Məhəmməd ibn Əbu-Bəkri göndərdi. Məhəmməd bir dəstə döyüşçü ilə Übeydullahın dəstəsinin üzərinə yeridi. Günün sonunadək bu iki dəstə meydanda qanlı savaş apardı. Nəhayət, Müaviyə Übeydullahın köməyinə Şərhəbili göndərdi. Kufə ordusundan Malik Məhəmmədin

köməyinə tələsdi. İki qoşun arasında qanlı savaş hicri ۳۶-cı il, zilhiccənin sonunadək .davam etdi

Həzrət Əli (ə) əvvəlki döyüşlərdə olduğu kimi, bu döyüşdə də çalışırdı ki, imkan həddində az qan axıdılsın. Müaviyə isə heç bir vəchlə danışığa getmək istəmir və döyüşü davam etdirirdi. Nəhayət, hicri ۳۷-ci il yetişdi. Hər iki qoşun məhərrəm ayında savaşı saxlamaq qərarına gəldi. Həzrət Əli (ə) bu fasiləni daha çox arzulayır və hansısa bir razılığa gəlinəcəyinə ümid edirdi. Həzrət qanlı savaşa son qoymağa cəhd göstərsə də, inadkar Müaviyə sülhlə razılaşmırdı. Nəhayət, məhərrəm ayı başa çatdı. Səfər ayının ilk günündən döyüş başladı və səfərin on yeddisinədək davam etdi. Belə ki, bu .döyüş ardıcıl şəkildə on iki və ya on səkkiz ay çəkdi

Bu döyüş ərəb arasında ən qanlı daxili savaş idi. Döyüşün ilk günlərində həzrət Əli (ə) təkbətək döyüşə üstünlük verirdi. Amma Əmmar Yasər, Üveys Qərəni kimi səhabələrin şəhadəti döyüşü qızışdırırdı. Həzrət Əlinin (ə) qulamı Müaviyənin döyüşçüsü Əcir tərəfindən şəhadətə yetirildi. Həzrət Əli (ə) öz qulamının şəhadətindən narahat olub özü meydana çıxdı. Əlini (ə) tanımayan Əcir qılıncını qürurla onun üzərinə endirdi. Əcirin zərbəsini ötürən Əmirəl-mö’minin, əli ilə yapışıb onu göyə qaldırdı və yerə elə çırpdı ki, sümükləri qırıldı. Həzrət düşmən qoşununa baş vurub xeyli qılınc .çaldıqdan sonra düşərgəyə qayıtdı

Səfər ayının dördündə Əbu-Əyyub Ənsari bir dəstə döyüşçü ilə Şam qoşununa doğru hərəkət etdi. O bir başa Müaviyənin çadırı üzərinə hücuma keçdi və qarşısına çıxanı qılıncdan keçirdi. Əbu-Əyyubu çadırının yaxınlığında görən Müaviyə qaçıb şamlılar arasında gizləndi. Nəhayət, Əbu-Əyyub öz düşərgəsinə qayıtdı. Əbu-Əyyubun hücumundan xofa düşmüş Müaviyə öz döyüşçülərini məzəmmət edib xeyli danladı. Bu vaxt Mərqə ibn Mənsur adlı bir döyüşçü qabağa gəlib Əlinin çadırına hücum etmək üçün icazə istədi. Müaviyənin əmri ilə Mərqə atına süvar olub Kufə qoşununa üz tutdu. O, yolu açıb Əliyə yaxınlaşmaq fikrində idi. Amma ilk sırada dayanmış Əbu-Əyyub Ənsari onu görüb bir zərbə ilə başını bədənindən ayırdı. Bu hadisə Müaviyəni daha da qəzəbləndirdi. Bütün Şam qoşununa hücum əmri verildi. Həzrət Əli (ə) də öz qoşununa .hücum əmri verdi

Bu ilk ümumi hücum idi. Həzrət Əlinin (ə) cəngavərləri həmin gün böyük şücaət və rəşadət göstərərək bir çox düşmən qüvvələrini fənaya uğratdılar. Bütün bu qanların günahkarı Müaviyənin həvəsbazlığı idi. Əlbəttə ki, o, həzrət Əlinin nəsihətlərini qəbul etsəydi və Şam xalqını müxtəlif hiylələrlə aldatmasaydı, vəziyyət belə olmazdı. Həzrət Əli (ə) Müaviyə ilə üzbəüz gəlmək fikrində idi. Ona görə də Şam qoşununun qabağına çıxıb «haradasan, ey Hind oğlu» deyə soruşdu. Düşmən qoşunundan cavab çıxmadığını görüb yenidən Müaviyəni səslədi və buyurdu: «Ey Müaviyə, sən ki xəlifəlik iddiasındasan və xalqın qanının tökülməsinə səbəbkar olmusan, indi özün mənimlə meydana çıx. Hansımız qalib gəlsək, xilafət də onun olsun. Gəl mühakiməni qılıncların öhdəsinə buraxaq».

Müaviyənin qorxudan səsi çıxmadı. Şamlılar arasına pıçhapıç düşdü. Vəziyyəti belə görən Şam cəngavəri Əbrəhə Əssəbah ibn Əbrəhə qoşuna üzünü tutub dedi: «Ey camaat, and olsun Allaha, əgər vəziyyət belə davam etsə, biriniz də sağ qalmayacaqsınız. Nə üçün özünüzü ölümə verirsiniz?! Həzrət Əli (ə) Əbrəhənin sözünü eşidib buyurdu: «Hələ Şam qoşunundan Əbrəhənin sözü tək sevindirici söz eşitməmişdim».

Amma Müaviyə Əlinin (ə) zülfüqarının qorxusundan öz qoşununun axır sıralarında dayanmışdı. O, yaxınlığında olan adamlara dedi: «Əbrəhənin ağlı çaşıb». Şam böyükləri isə bir-birlərinə belə dedilər: «And olsun Allaha, Əbrəhə din və elmdə bizdən biliklidir. İş budur ki, Müaviyə həzrət Əli (ə) ilə vuruşmaqdan qorxur».(١)

Həzrət Əli (ə) Müaviyəni bir neçə dəfə mübarizəyə çağırdı. Amma Müaviyədən cavab çıxmadı. Nəhayət, Ürvə ibn Davud Müaviyənin qoşunu arasından fəryad çəkdi ki, Müaviyə Əli ilə döyüşdən çəkinirsə, mən onunla vuruşa gedirəm. Ürvə nərə çəkdi: «Ey Əbu Talib oğlu, gözlə gəlirəm». Amma həzrət Əli ona yaxınlaşan Ürvəyə elə bir qılınc zərbəsi endirdi ki, o atının üstündə ikiyə bölündü. Bu vaxt Ürvənin əmisi oğlu onun qanını almaq üçün meydana çıxdı. Amma o da həzrətin bir zərbəsi ilə başını torpağa



---

١- [٨٢] «Насехут-Тəварих», cəh. ٤٠١.

.qoydu. Həzrət Əli (ə) öz düşərgəsinə qayıtdı

Bu savaşda Əmr Asın həzrət Əli (ə) ilə üz-üzə gəlməsi də maraqlı oldu. Əmr As hiyləgər və ehtiyatlı adam idi. O nəinki Əli ilə, hətta başqa cəngavərlərlə döyüşə çıxmazdı. Amma Əmr As qorxaq da görünmək istəmirdi. Bir gün həzrət Əli (ə) qiyafəsini dəyişib, döyüş meydanına çıxdı və Şam ordusuna çatdıqda bir dövrə vurdu. Həzrət qəsdən qorxaq döyüşçülər kimi hərəkət edirdi. Özünü göstərmək üçün qorxaq bir döyüşçü axtaran Əmr As fürsəti qənimət bilib meydanda dövrə vuran döyüşçüyə hücum etdi. Əmr Asın ağlına da gəlmirdi ki, bu döyüşçü Əlidir. Əmr As ona yaxınlaşıb bir rəcəz oxudu. Əmri yaxınlığında görən həzrət Əli (ə) onun üstünə şir tək şığıyaraq bir rəcəz oxuyub özünü tanıtdırdı. Həzrətin bir zərbəsi ilə nizəsini itirmiş Əmr onu tanıyıb ölümü gözlərinin qabağına gətirdi. Belə bir vəziyyətdə Əmr As yeganə çıxış yolu kimi Əlinin nəcabətin və uca şəxsiyyətini gördü. Dərhal libasını soyunub çılpaq vəziyyətdə qaçmağa başladı. Bu Əmr Asın əsil sifəti idi. Həyada misli olmayan həzrət Əli (ə) üzünü yana çevirib buyurdu: «Allah sənə lə’nət etsin, ayıb yerinin hesabına azad oldun». Həzrət Əlinin uzaqlaşdığını görən Əmr yıxılıb dura-dura öz düşərgəsinə qaçmağa .başladı. Yalnız Müaviyənin çadırına girdikdən sonra Əmr rahat nəfəs aldı

Müaviyə ürəkdən gülüb dedi: «Ey Əmr, bu hiyləgərlik səndən başqa birinin ağlına gəlməzdi. Get öz ayıb yerinə «sağ ol» de. Afərin o şəxsin əxlaqına ki, səni rahat buraxdı. And olsun Allaha, Əlidən (ə) başqa biri səndən keçməzdi». Müaviyə danışa-danışa qəh-qəhə çəkir və Əmri məsxərəyə qoyurdu. Əmr As da dilini saxlamayıb Müaviyənin qorxaqlığını ona xatırlatdı və dedi: «Məgər Əli mübarizəyə səni çağırmırdımı?!» Nə üçün özünü alçaldıb ona cavab vermədin?» Müaviyə dedi: «Mən e’tiraf edirəm ki, Əli kimi şücaətli şəxslə vuruşmaq mümkünsüzdür. Amma sənin bugünki işin çox gülməli oldu». Müaviyənin məsxərəsi Əmr Ası qəzəbləndirdi. O, Müaviyəni söyə-söyə oradan .uzaqlaşdı

Döyüşün əvvəllərində Əlinin cəngavərləri ardıcıl qələbələrlə geri dönsələr də, həzrət yenə də sülhə ümid edir, nəsihət və moizəyə üstünlük verirdi. Onu bu savaşa vadar .edən nəsihətlərin cavabsız qalması idi

Həzrət Əli (ə) öz döyüşçülərinə atəşin xütbələr buyurdu, öz tə’sirli sözləri ilə qoşunun iman və mübarizə qüdrətini gücləndirdi. Həzrətin qəlbdən gələn ilahi buyuruqları .dinləyicilərin könlünə oturur, onları silkələyirdi

Həzrət öz qoşununa üz tuturaq buyururdu: «Ölüm qorxusu ilə müharibədən qaçmağın nəticəsi yoxdur. Bir kəsin əcəli çatmayınca ölməyəcək. Allah-təala buyurur: «Əgər ölməkdən və ya öldürülməkdən qaçırsınızsa, qaçmaq sizə heç bir fayda verməz».(۱) Həzrət öz döyüşçülərini səbr və dözümə çağıraraq onlar üçün Qur’andan belə bir ayə oxudu: «Şübhəsiz ki, Allah öz yolunda möhkəm divar kimi səd çəkib döyüşənləri sevər».(۲) Həzrət öz ardıcıllarına haqq və batili tanıtdırır, onların daxili əzmini gücləndirirdi. Həzrətin səhabələri və köməkçiləri də onun səsinə səs verib öz .fədakarlıqlarını nümayiş etdirirdilər

Müaviyə də öz qoşununu məkr və hiylə yolu ilə həvəsləndirir, çalışırdı ki, bu yolla Əli (ə) .qoşununun da arasına ixtilaf salsın

Ərəblərin adlı-sanlı qəhrəmanlarından olan və həzrət Əlinin (ə) qoşununda döyüşən Xalid ibn Muəmmər Müaviyənin hiylələrinin qurbanı oldu. Xalid həzrət Əlinin göstərişinə əsasən on min nəfərlik bir dəstə ilə Müaviyənin qoşununa hücum etdi. Qoşun arasından yol açıb Müaviyənin qərargahınadək irəli getdi. Müaviyənin ən yaxın .keşişçiləri qətlə yetirildi

Məcburiyyətin labüd olduğunu görən Müaviyə Xalidin yanına adam göndərib onu tovlamaq qərarına gəldi. Həmin şəxs Xalidə yaxınlaşıb dedi: «Bu döyüş, bu qan nəyə lazımdır? Xalqı qırmaq əvəzinə Müaviyənin xəlifəliyinə yardımçı ol, o da sənə Xorasan hakimliyini versin». Xalidin qılınc çalan qolu süstləşdi. Sakitcə öz düşərgəsinə qayıtdı. Xalidin qəlbindəki hisslər Əli sərkərdələrinin arasında Müaviyənin səpdiyi ilk nifaq toxumu idi. Sonra Əş’əs ibn Qeysə də əmirlik və’d edildi. Məhz bu şəxslər həzrətin .ardıcıllarını ona qarşı qaldırdılar

Siffeyn döyüşü günbəgün şiddətlənirdi. Hamı anlayırdı ki, iki qoşun arasında

son sözü qılınclar deyəcək. Hər gün meydanda qanına qəltan olanların sayı artırdı. Xüsusi ilə şamlılar arasında ölənlər çox idi. Həzrət Əlinin (ə) əlində qətlə çatmış Müaviyə qəhrəmanlarından biri də Muğariq idi. Savaşın qızğın günlərindən birində bu şəxs meydana çıxıb mübariz tələb etdi və həzrət Əlinin döyüşçülərindən dördünü ardbaard şəhadətə yetirdi. O qətlə yetirdiyi şəxslərin başlarını kəsdi və ayıb yerini göstərdi. Onun bu hərəkəti həzrət Əlini (ə) narahat etdi. Həzrət qiyafəsini dəyişib tanınmayan bir görkəmdə meydana çıxdı. Əmirəl-mö'mininin bir zərbəsi ilə Muğariq atı qarışıq ikiyə bölündü. Muğariqin ardınca meydana çıxan daha yeddi şam mübarizi .həzrətin əlində dünyasını dəyişdi

Şam qoşunundakı adlı-sanlı qəhrəmanlardan biri də Bosr ibn Ərtat idi. Müaviyə həzrət Əlinin (ə) də'vəti qarşısında acizliyini nümayiş etdirdikdən sonra Bosr ad-san qazanmaq naminə həzrətlə vuruşmaq qərarına gəldi. Beləcə, o, Şam qoşunundan aralanıb, Kufə qoşununa yaxınlaşdı. Amma həzrət Əli (ə) ilə göz-gözə gəldikdə canını .üşütmə bürüdü, ürəyinin çırpıntısı qulaqlarını batırdı

Həzrət Əli (ə) dərhal meydana çıxıb Bosra hücum etdi. Özünü ölüm ayağında görən Bosr Əmr As kimi ayıb yerini açmaqla həzrətin qılıncından amanda qaldı. Həzrət üzünü yana çevirib buyurdu: «Əmr Asa lə'nət olsun, bu çirkin əməli adətə çevirdi». Bosr fürsətdən istifadə edib özünü Şam qoşununa çatdırdı, ucalmaq əvəzində daha da .alçaldı

Bunun ardınca Kufə əsgərləri şamlıları həcv edir və deyirdilər ki, mərdlikdən danışır, amma döyüş meydanında ayıb yerinizin arxasında gizlənirsiniz. Həzrət Əli (ə) Əmr Asın .bu əxlaqsızlığına «Nəhcül-bəlağə»də də toxunmuşdur

Siffeyndə şəhadət şərbətini içənlərdən biri də həzrət Peyğəmbərin (s) böyük səhabəsi Əmmar Yasər oldu. Doxsana yaxın yaşı olan bu böyük insan döyüş meydanına çıxıb şirin bir məntiqlə Peyğəmbər (s) və onun övladını mədh etdi və Müaviyə ilə ardıcıllarını :qınadı. Əmmar meydanda belə bir şe'r oxudu

Bir zaman vuruşduq Qur’ana görə

.Bu gün qılınc çəkdik yanlış tə’birə

Əmmar uzun-uzadı döyüşdən sonra Əbül-Adiyə tərəfindən şəhadətə yetirildi. Həzrət Əli onun şəhadətinə çox qəmgin oldu və buyurdu: «Əmmarın şəhadətinə qəmlənməyən İslamdan bəhrə götürməz». Amma Əmmarın şəhadəti Şam qoşununun ruhiyyəsini tamam sarsıtdı. Çünki hamının bildiyi məşhur bir hədisdə həzrət Peyğəmbər Əmmara buyurmuşdu: «Səni azğın və zalım bir qövm öldürəcək». Əmmarın şəhadətindən sonra şamlılar bir-birlərinə dedilər: «Belə çıxır ki, həmin azğın və zalım qövm bizik. Müaviyə isə həmişəki hiyləgərliyindən qalmayıb dedi: «Əmmarı o şəxs öldürdü ki, onu evindən çıxarıb döyüşə gətirdi». Müaviyə yenə də diqqəti Əliyə (ə) yönəldirdi. Əmr As astaca Müaviyəyə dedi: «Sənin deməyindən belə çıxır ki, Həmzənin qatili müşriklər yox, onu Ühüd meydanına gətirən Peyğəmbərdir». Müaviyə dedi: .««Zarafat yeri deyil, bu sözləri başqa yerdə danışma

Həzrət Əlinin (ə) fədakar döyüşçüləri olan Haşim ibn Ütbə (Mirqal), Əmr ibn Möhsin, Xuzəymə ibn Sabit də bu döyüşdə şəhadət dərəcəsinə çatdılar. Bu döyüşdə Malik Əştərin rolunu xüsusi qeyd etmək lazımdır. Siffeyndə böyük rəşadətlər göstərən Malik dəfələrlə Şam qoşununu pərən-pərən salmışdı. Bir gün Malik döyüş meydanına çıxıb özünü tanıtdırmadan mübariz tələb etdi. Müaviyə tərəfindən Übeydullah ibn Ömər irəli çıxdı. Uzaqdan rəcəz oxumaqla özünü öyən bu şəxs Malikə yaxınlaşıb onu tanıdıqdan sonra üşütməyə düşdü və dedi: «Ey Malik, əgər bilsəydim ki, meydandakı sənsən, heç vəchlə qabağa çıxmazdım. Icazə ver, geri qayıdım». Malik dedi: «Nə üçün bu alçaqlığı qəbul edirsən? Şamlılar deyərlər ki, Übeydullah rəqibin qarşısından qaçdı». Übeydullah dedi: «Mənim canımdan söhbət gedən yerdə xalqın nə deyəcəyi mühüm deyil». Malik dedi: «Səni görməməzliyə vurdum, qayıt. Amma bundan sonra tanımadığın adamla döyüşə çıxma». Übeydullah düşərgəyə qayıtdı və «Allah məni bu gün bir şirin əlindən xilas etdi» dedi. Müaviyə dedi: «Ey qorxaq, qaçmağın bəs deyil, hələ qoşununun ruhiyyəsini də zəiflədirsən? Malik də bir kişidir, sən də bir kişi. Nə üçün bir bu qədər qorxursan?» Übeydullah dedi: «Ey

Müaviyə, bu döyüşü qızışdıran sən olmusan. Yaxşı olar ki, özün çıxıb onunla «!döyüşəsən. Niyə çıxmırsan? Axı sən də bir kişisən, Malik də bir kişidir

Müaviyənin döyüşçülərindən bir neçəsi öz qəbilələri ilə Əmr Asın rəhbərliyi altında Maliklə döyüşə çıxdılar. Malik də öz adamları ilə birlikdə onlara ağır zərbələr vurdu və səksənə yaxın düşmən döyüşçüsünü qanına qəltan etdi. Malik Əmr Asın özünü ələ keçirmək istəyirdi. Amma Malikin məqsədini anlayan düşmənlər Əmr Ası meydandan .qaçıra bildilər

Malik öz qəbiləsi ilə meydana çıxmış başqa düşmən cəngavərlərinə də diz çökürdü. Yezid ibn Ziyad, No’man ibn Cəbələ kimi bir çox cəngavərlər öz qəbilələri ilə birlikdə .tar-mar edildi

Əvvəlcə qeyd etdiyimiz kimi, Siffeyn döyüşü İslamın ən qanlı daxili döyüşlərindən idi. Həzrət Əlini (ə) bu ixtilaf və pərakəndəlik çox narahat edirdi. O dəfələrlə Müaviyəni nəsihət edir, onu islah etməyə çalışırdı. Bütün bunlar nəticə vermədikdə həzrət Əli (ə) Müaviyəni meydana çağırsa da, o qoşunun arxa cərgələrində gizlənirdi. Həzrət Əli (ə) .Müaviyədən heç bir müsbət cavab ala bilmədiyindən düşmən qoşununa hücum edirdi

Döyüşün son günlərində Şam qoşununun məğlubiyyəti şübhə doğurmurdu. Həzrətin rəhbərliyi altında Kufə döyüşçülərinin göstərdiyi qəhrəmanlıq Müaviyə ordusunun sütunlarını uçurmuşdu. Amma ətrafındakı adamları min bir və’dlə şirnikləşdirən .Müaviyə hələ də məqsədindən daşınmırdı

Tarixçilərin rəvayət etdiyinə görə, Kufə qoşunu iki ümumi həmləyə keçdi. Birinci hücum həzrət Əlinin Əmmar Yasər, Üveys Qərəni kimi səhabə və yaxınlarının şəhadətindən sonra baş verdi. Həmin vaxt həzrətin öz komandanlığı altında düşmən üzərinə yürüş edildi və bütün Şam döyüşçüləri, eləcə də, Müaviyə özü qaçmağa üz tutdu. Müaviyə ağır sarsıntı içində əsgərlərinə və’dlər verir, onları döyüşə .şirnikdirməyə çalışırdı

İkinci döyüş isə Ləylətul-hərirdə baş verdi. Soyuq qış gecələrində itlər, adətən, hürmək əvəzinə ulaşırlar. Ərəb dilində bu sayaq ulaşma və zingiltiyə «hərir» deyilir. Ləylətul-hərir döyüşündə o qədər yaralı vardı ki, gecənin qaranlığındakı zarıltılar qış

.gecələrindəki it ulaşmalarını xatırladırdı. Yaralıların əksəri Müaviyənin qoşunundan idi

Siffeyn döyüşünün axır mərhələsi olan Ləylətul-hərir qarşılaşmasından qabaq həzrət Əli (ə) ilə Müaviyə arasında məktublaşma oldu. Bu döyüşdən bir neçə gün qabaq Müaviyə həzrət Əliyə (ə) məktub yazıb Şam əyalətinin onun ixtiyarına verilməsini istədi. İbn Əbil-Hədid «Nəhcül-bəlağə»nin şərhində yazır ki, Müaviyə məktub yazarkən Əmr Ası öz məqsədindən xəbərdar etdi. Əmr gülüb dedi: «Ey Müaviyə, necə də «!?sadəsən. Məgər sənin hiylən Əliyə (ə) tə’sir edərmi

Müaviyə dedi: «Məgər həm həzrət Əli (ə), həm də mən Əbdül-Mənafın övladları deyilikmi?» Əmr dedi: «Dediklərin düzdür. Amma o Peyğəmbər ailəsindəndir, sənə isə «!həmin məqamdan pay düşməyib. Məktub yazmaq istəyirsənsə, yaz

Müaviyə həzrət Əliyə (ə) belə bir məzmunda məktub yazdı: «Əgər bilsəydik ki, müharibədə bir bu qədər itki verəcəyik, döyüş meydanına çıxmazdıq. İndi isə gələcəyi fikirləşmək lazımdır. Mən əvvəllər də sənə tabe olmamaq şərti ilə Şam əyalətini istəmişdim. Sən qəbul etmədin. Mən bu gün də həmin istəyimdə qalıram. And olsun Allaha ki, saysız-hesabsız döyüşçülər həlak olub. Qalanlarının fikrini çəkmək lazımdır. Hər ikimiz Əbdül-Mənaf övladlarıyıq və hər birimizdən heç bir üstünlüyümüz yoxdur ki, .«birimiz o birinə tabe olsun

Həzrət Əli (ə) Müaviyənin məktubunu oxuduqdan sonra ona belə bir məzmunda cavab yazdı: «Sən məndən Şamı istəyirsən. Mən o kəs deyiləm ki, dünən səndən aldığımı bu gün sənə verəm. Sən ölənlərin çoxluğundan danışır və qalanlar haqqında düşünməyi lazım bilirsən. Bil ki, haqq yolda öldürülmüş hər bir kəs behiştə, batil yolda öldürülənlər isə cəhənnəmə düşmüşdür. Düz deyirsən ki, biz Əbdül-Mənaf övladlarıyıq. Amma Üməyyə Haşim kimi, Hərb Əbdül-Müttəlib kimi, Əbü-Süfyan Əbu-Talib kimi və mühacir də azad olmuş kimi deyil. Əsli-kökü pak olan kəs başqasına aid edilən kəs kimi olmaz. Haqq yolda gedən də batil yolda gedənlə eyni deyil. İman gətirmiş adamı hiyləgər və dığal adamla bir tutmaq olmaz. Əlbəttə ki, pis o övladdır ki, sənin tək, cəhənnəmə düşmüş babalarının yolunu gedir. Bundan əlavə, Peyğəmbərlik şərəfi bizim ailəmizdədir. Bu yolla asi şəxs xar olur, itaət edən ucalığa çatır. Allah ərəbləri öz -dininə dəstə

dəstə daxil etdiyindən bir dəstə öz meyli ilə dini qəbul etdi, başqa dəstə isə çarəsizlik ucbatından təslim oldu. Siz dinə qılınc qorxusundan, dünya eşqi ilə gələnlərsiniz. Amma imanda qabaqda gedənlər qalib oldu, hicrət edənlər fəzilət qazandı. Şeytanın ardınca .«getmə, özündə ona yol açma

Həzrət Əlinin (ə) cavabını aldıqdan sonra Müaviyə məktub yazmasına peşiman oldu. Əlinin cavabını bir neçə gün Əmr Asdan gizlədi. Nəhayət, onu yanına çağırıb məktubu ona oxudu. Əmr As Müaviyəni məsxərəyə qoydu və Əlinin Müaviyəni məzəmmət .etməsindən sevindi

Həzrət Əli (ə) Müaviyəyə cavab məktubu yazdıqdan sonra qərar gəldi ki, işi başa çatdırsın. Çünki Siffeyn döyüşü artıq bir ili ötməkdə idi. Bu müddət ərzində həzrətin öyüd-nəsihətlərinin heç bir faydası olmamışdı. Nə təkbətək döyüşlər, nə də ümumi həmlələr nəticə verməmişdi. Belə ki son döyüş üçün həzrət Əlinin (ə) göstərişi ilə hərbi şura toplandı. Nəhayət, belə bir qərar çıxarıldı ki, bütün qoşunun qəti hücumu ilə .müharibənin son nöqtəsi qoyulsun

Bu planın hicri otuz səkkizinci ilin səfər ayının gecələrindən birində həyata keçirilməsi müəyyənləşdirildi. Həzrət Əli (ə) tə’yin olunmuş gündən bir gün qabaq öz döyüşçülərinə savaş əmri verərək belə buyurdu: «Ey müsəlmanlar, özünüzə Allah qorxusunu şüar götürün, əyninizə vüqar və aramlıq libası geyinin, dişlərinizi bir-birinə bərk sıxın ki, bu iş qılıncları başlardan yan keçirir. Döyüş geyimini tam geyinin, qılıncları qınından çəkməzdən qabaq silkələyin, düşmənə gözünüzün yanı ilə baxın, sola-sağa nizə vurun, addımlarınızı irəli atmaqla qılınclarınızı düşmənə çatdırın. Bilin ki, siz Allahın nəzərində olub, Peyğəmbərin əmisi oğlu ilə birlikdəsiniz. Dayanmadan həmlə edin, qaçmaqdan utanın, çünki qaçmaq nəsil və övladlarınızda çirkinlik yaradar və hesab günü oda çevrilər. Ruhunuzun bədəninizdən ayrılmasından xoşhal olun. Ölümə doğru rahat gedin. Həmlə edin bu qara qoşuna, bu hündür xeyməyə. Onu döyəcləyin. Çünki şeytan onun bir guşəsində gizlənmişdir. O, üstünüzə sıçramaq üçün əlini uzatmış, qaçmaq üçün ayağını geriyə atmışdır. Məqsədiniz onunla və onun yoldaşları ilə döyüş olsun. Bu yolla həqiqət aydınlaşar. Siz üstün və səh:١١۶

(ucasınız, Allah sizinlədir və heç vaxt əməllərinizi mükafatsız qoymaz».(1)

Gecə düşəndə hücum əmri verildi. Bütün İraq (Kufə) döyüşçüləri şamlıların üzərinə yürüşə keçdilər. Sübh açılanadək hücumlar davam etdi. Kufə əsgərləri həmin gecə şamlıların qəlbinə elə bir qorxu saldılar ki, kimsədə qurtuluş ümidi qalmadı. Şam .qoşununun cərgələri dağıldı və düşmən sıralarında ruhi bir sarsıntı hakim oldu

Müaviyə qoşununun əsgərləri komandanların nəzarətindən çıxdı. Ən zəruri şərt olan hərbi intizam pozuldu. İraq döyüşçülərinin fədakarlığı ən yüksək nöqtəyə çatmışdı. İbn-Şəhr Aşubun yazdığına görə həmin gecə həzrət Əlinin qoşunundan dörd min, Müaviyənin qoşunundan isə otuz iki min əsgər həlak oldu. («Kəşful-ğəmmənin» müəllifi .(həmin gecədəki təlafatın otuz altı minə çatdığını yazır

Malik Əştər öz fəryadları ilə İraq qoşununa qələbə ümidi verir, qızğın mə’rəkənin içində onları öyürdü. Qoşuna komandanlığı həzrət Əli (ə) öz üzərinə götürmüşdü. Qoşunun ayrı-ayrı bölmələri arasında ciddi nizam-intizam yaradılmışdı. Döyüş zamanı bir hissə də süstlük gördükdə onların arasından hücuma keçib əsgərləri ardınca .aparırdı

Müaviyənin qoşunu çoxsaylı olmasına baxmayaraq, pərən-pərən düşmüş, ölümü gözlərinin önünə almışdı. Müaviyənin qatı tərəfdarları qətlə yetirilmiş, bir çoxları isə .qaçmışdı

Hava işıqlananda həzrət Əlinin (ə) qoşunu Müaviyənin düşərgəsində qərar tutmuşdu. Qaçmaqda olan Müaviyə həzrət Əlinin (ə) öz döyüşçülərinin düşməni tə’qibə rəğbətləndirdiyini eşitdi. Həzrət buyururdu: «Ey mö’minlər, düşmənlə müharibənin hansı yerə gəlib çatdığını gördünüz. Qələbə əlamətləri görünür və iş başa çatmaqdadır». Bu sözləri eşidən Müaviyə Əmr Asa xitabən dedi: «Eşitdinmi Əli nə dedi? .«İndi bir tədbir gör

Əmr dedi: «Ey Müaviyə, bizim döyüşçüləri Əlinin (ə) döyüşçüləri ilə bir tutmaq olmaz. Sən özün də Əliyə (ə) tay ola bilməzsən. Digər bir tərəfdən həzrət Əli (ə) bu döyüşdə şahədəti özünə səadət sayır, sən isə dünya mətahı istəyirsən. Kufə camaatı qorxur ki, əgər sən qalib gəlsən onları əsarət

altına alıb incidəcəksən. Hansı ki, Şam xalqı Əlinin qələbəsini özü üçün qurtuluş sayır. Onlar əmindir ki, Əli qalib gəlsə, düşmənlərini incitməyəcək. Bu vəziyyətdə sən heç .«vəchlə Əliyə qalib gələ bilməzsən

Müaviyə dedi: «Ey Əmr, mən səni yanıma gətirməmişəm ki, məni qorxudasan, Şam qoşununun ruhunu zəiflədəsən, İraq qoşununu tə’rifləyəsən. Bu bəla girdabından «?çıxmaq üçün tədbir tök. Misir hakimliyini istəmirsən

Əmr dedi: «Ey Müaviyə, mən ilk gündən bilirdim ki, sən Əliyə savaşla qalib gələ bilməzsən. Ona görə də belə bir gün üçün qurğu qurmuşam. Dərhal göstəriş ver ki, kimin yanında Qur’an varsa, öz nizəsinin başına sancıb, İraq qoşununa göstərsin. Qoy desinlər ki, müsəlmanların qanını nahaq yerə axıtmayın, bizimlə müsəlman kimi rəftar .«edin. Bu yolla İraq döyüşçüləri arasına təfriqə düşər və hücumdan əl çəkərlər

Müaviyə dedi: «Ey Əmr, yaxşı hiylə qurmusan». O dərhal göstəriş verdi ki, Qur’anlar bir yerə yığılsın. Bir qrup şəxs onu əsgərlərin nizələrinə sancmağa başladı. Şamlılar İraq döyüşçüləri qarşısında uca səslə fəryad çəkib dedilər: «Ey ərəb qəbiləsi, bu qədər ölüm «!nə üçündür? Qoy aramızda Allah kitabı mühakimə yürütsün

Öz şücaətli həmlələri ilə başqalarından seçilən Malik Əştər dedi: «Ey camaat, onların hiyləsinə aldanmayın. Onlar Allah kitabına inanmırlar. Biz bu vaxtadək onlara öyüd-nəsihət verdik, Qur’an və Peyğəmbər hədislərinə də’vət etdik. Amma nəticəsi olmadı. Onlar yalnız canlarının qorxusundan bu hiyləyə əl atıblar. Natiq (danışan) Qur’an .«Əlidir

İraq əsgərləri arasında olan Əş’əs ibn Qeys dedi: «Artıq qarşımızdakı qövmlə döyüşmək olmaz. Çünki onlar bizi Qur’anın mühakiməsinə də’vət edirlər. Əş’əsin ardınca Müaviyədən Xorasan əmirliyi və’dini almış Xalid ibn Muəmmər eyni sözləri təkrarladı. Döyüşdən yorulmuş xalq aldanaraq, onların sözünü qəbul etdi. Qoşun .arasında belə bir fikir yarandı ki, şamlılarla döyüşmək artıq haramdır

Gündə bir rəng alan Əş’əs ibn Qeys İslamı qəbul etdikdən sonra bir dəfə dindən çıxıb mürtəd olmuşdu. Əbu-Bəkrin dövründə o yenidən İslamı qəbul etdi. Osman onu (Azərbaycan hakimliyinə tə’yin etmişdi. Həzrət Əli (ə

xilafətə çatdığı vaxt Əş’əs də zahirən bey’ət etdi. Amma Əlidən istədiyini ala bilməyən Əş’əs daxilən həzrətə müxalif idi və zərbə vurmaq üçün fürsət gözləyirdi. Bəli, Əş’əsin əlinə fürsət düşmüşdü. Onun sözləri qələbə astanasında olan İraq qoşununun .ruhiyyəsini qırmışdı. Artıq il yarımlıq zəhmətlər hədərə getmək üzrə idi

Malik Əştəri ön sırada döyüş vəziyyətində görən Əş’əs xalqı döyüşməməyə çağırırdı. O, zahirdə qardaş qırğınına, nifaqa, artıq qan axıdılmasına qarşı çıxır, daxildə isə öz məqsədini izləyirdi. Nəhayət, Əş’əsin səsinə səs verənlər qılınclarını qınına qoyub bir .ağızdan fəryad çəkdilər ki, onlar sülh istəyirlər

Amma Malik Əştər onun sözlərinə qulaq asmır və öz işini görürdü. Onun əsas məqsədi Müaviyənin çadırına çatmaq idi. Maliki bu vəziyyətdə görən Əş’əs hədələyici tərzdə Əliyə (ə) dedi: «Ya Əli (ə), Maliki saxla, döyüşə son qoy!» Həzrət Əli (ə) çarəsiz qalıb Yezid ibn Hanini Malikin yanına göndərib onu vəziyyətdən xəbərdar etdi. Malik dedi: «Sən öz gözünlə vəziyyəti görürsən. Əliyə çatdır ki, mənə bir saat möhlət versin, .«Müaviyəni onun hüzuruna gətirim

Yezid geri qayıdıb Malikin sözlərini həzrətə çatdırdı. Bu sözləri eşidən Əş’əs fəryad «!çəkdi: «Ya Əli (ə), Maliki saxla, yoxsa qayıdıb səni sağ görməyəcək

Həzrət buyurdu: «Məgər ona xəbər göndərdiyimi görmədinizmi?» Sonra həzrət Əli (ə) Yezidi yenidən Malikin yanına göndərdi və ona Əş’əsin müxalifliyi barədə xəbər çatdırdı. Malik qəzəb içində geri dönüb həzrət Əlinin (ə) xidmətinə gəldi. Həzrətin yanına çatan Malik vəziyyəti qatışıq gördü. Haray çəkib dedi: «Ey İraq qoşunu, nə oldu ki, döyüşdən əl çəkib imamınıza qarşı çıxdınız? Axı bu gün qələbə qəti idi». Əş’əs dedi: «Ey Malik, bu sözlərdən əl götür. Qur’an tutanlarla döyüşmək olmaz!» Malik dedi: «Ey axmaq, biz bir ildir ki, onları Qur’ana də’vət edirik, qulaq asmırlar. Onların bugünkü işi Əmr Asın hiyləsindən başqa bir şey deyil. Mənə fürsət verin, onlara elə bu gün bey’ət etdirim». Əş’əs dedi: «Biz onlara bir ox da atılmasına razı deyilik». Malik dedi: «Siz gedin, bizi azad buraxın. Qoy işimizi görək». İkiüzlü dəstə dedi: «Yox, belə bir günah heç cür .bağışlanmaz

.«Əgər sizi azad buraxsaq, biz də sizin günahınıza şərik olarıq

Malik pərişan halda dedi: «Axı bu işdən sizə nə var? Siz elə əvvəldən vəfasız olmusunuz. Sizi öldürmək şamlıları öldürməkdən də yaxşıdır». Əş’əs uca səslə Maliki təhqir etdi. Malik əlindəki qamçı ilə Əş’əsin başına vurdu. Əş’əsin tərəfdarları qılınclarını çəkib Malikə hücum etdilər. Malik də əlini qılınca apardı. Fitnə yaranacağını görən həzrət Əli (ə) bu işə mane oldu. Hansı ki, təəssüf hissi həzrəti üzürdü. O, Malikə nəvaziş göstərərək buyurdu: «Ey Malik, artıq iş bizim əlimizdən çıxdı. Allah lə’nət etsin bizi Qur’ana də’vət edib, özü Qur’ana inanmayan qövmə». Sonra həzrət İraq əsgərlərinə buyurdu: «Siz öz işinizlə İslamın qüdrətini sarsıtdınız. Qüdrət əldən çıxdı, onun yerini zillət tutdu. Qələbəyə yaxın olduğunuz və düşmənin öz həlakından qorxduğu vaxt onlar hiylə işlədərək Qur’anları qaldırıb sizi Qur’an hökmlərinə çağırdılar. Məqsədləri sizin əlinizdən qurtarmaq və müharibəni saxlamaq oldu. Onlar öz hiylələri ilə sizi ruzgarın gedişatına tapşırdılar. Əgər onların istəklərini yerinə yetirsəniz, yalnız aldadılmış bir qövm olacaqsınız. And olsun Allaha, bundan sonra güman etmirəm ki, bir .«işdə möhkəm dayanasınız və ya uzaqgörənliyiniz sizi savaba çatdıra

Həzrət Əli (ə) məzlumanə bir halda döyüşdən əl çəkdi və zahirən müharibə alovunu söndürdü. Artıq sülh və həkəmiyyətdən söz gedirdi. Çünki başqa bir çarə yoxdu və .həzrətin qoşununun əksəri Əş’əsin tərəfinə keçmişdi

Əş’əs ibn Qeys dedi: «Ya Əli (ə), bir halda ki, hər iki tərəf Qur’anın mühakiməsinə (həkəmiyyətə) razıdır, icazə verin Müaviyənin yanına gedib onun nəzərini öyrənim». Həzrət Əli (ə) buyurdu: «Artıq iş mənim əlimdən çıxıb. Bir halda ki, öz istəklərinizə əməl edirsiniz, mən bu işə qatılmıram». Əş’əs Müaviyənin yanına getdi və Müaviyə onu tərəflərdən nümayəndələrin seçilməsinə vadar etdi. Əş’əs geri qayıdıb dedi: «Şamlılar bu fikirdədirlər ki, hər tərəfdən bir hakim, nümayəndə tə’yin olunsun və onlar bir .«müddət məsələni mütaliə etsinlər. Onlar nə hökm etsələr, hamı onlarla razılaşsın

Müaviyə özü də belə bir məzmunda həzrət Əliyə (ə) məktub göndərdi. Müaviyə yazırdı: «Aramızdakı çəkişmələr uzun çəkdi. Hər birimiz özünü haqlı

sayıb, o birinə itaət göstərmir. Bir çox adamlar qətlə yetirildi. Mən qorxuram ki, bu böyük bəla bundan sonra da davam etsin və qiyamət günü ikimizdən başqası bunun məs’uliyyətini daşımasın. Əqidəm budur ki, ixtilaf aradan götürülsün və bundan artıq qan axıdılmasın. Yaxşı yol budur ki, bizdən və sizdən iki həkəm (nümayəndə, hakim) seçilsin və onlar Qur’an əsasında mühakimə yürütsünlər. Allahdan qorx, əgər Qur’an əhlisənsə, Qur’anın hökmünə razı ol».

Müaviyənin cavabında həzrət Əli (ə) belə bir məktub yazdı: «İnsan üçün ən yaxşı iş yaxşılıqlara üz tutub, nöqsanları dəf etməkdir. Zülm-sitəm insanın dinini və dünyasını puça çıxarır, bəd dili açır. Ey Müaviyə, dünyadan həzər qıl və bil ki, dünya müvəqqətidir. Dünyadan nəsibin olan şeylərdən bəhrələnməyəcəksən. Yaxşı bilirsən ki, əldən çıxmış fürsəti geri qaytarmaq olmur. O gündən qorx ki, yaxşı əməl sahibinə xalq həsəd aparsın və nəfsinin cilovunu şeytana verən peşiman olsun, özünə dünyanın yalanları ilə toxdaqlıq versin. Məni Qur’anın hökmünə də’vət edirsən. Yaxşı bilirsən ki, özün Qur’an əhli deyilsən və Qur’an hökmlərinə tabe olmursan. Mən sənin də’vətini yox, Qur’anın hökmünü qəbul edirəm. Qur’anın hökmünə razılıq verməyən kəs zəlalət girdabından salamat çıxmaz».

Məktubların məzmunundan xəbər tutan İraq əhli şadlandı. Əş’əs yenidən Müaviyənin yanına getdi və iraqlıların həkəmiyyət haqqındakı razılığını ona çatdırdı. Müaviyə öz tərəfindən Əmr Ası tə’yin etdi. Əş’əs və onun tərəfdarları isə sadəlövh və axmaq bir adam olan Əbu-Musa Əş’ərini seçdilər. Həzrət Əli (ə) bu xəbəri eşidib buyurdu: «Sübhanəllah! Bu ikiüzlü qövm hökm ixtiyarını da mənə vermir. İş ki bu yerə gəlib çatdı, heç olmaya, həkəm seçmək ixtiyarını mənə verin. Bu iş üçün ya Əbdüllah ibn Abbas, ya da Malik Əştər seçilsin. Əbu-Musa mənimlə yaxşı münasibətdə olmamasından əlavə, avam və küt bir adamdır. O, Əmr As kimi hiyləgər bir adamla danışa bilməz». Əş’əs və onun tərəfdarları dedilər: «Ya Əli, Əbdüllah ibn Abbas sənin əmin oğludur və yalnız sənin razılığını güdür. Malik Osmanın qətlində ittiham olunur və bu döyüşün də alovunu o qızışdırıb. Belə bir savaş adamı Əmr Asla müdara edə bilməz. Əbu-Musa isə həm Peyğəmbər səhabəsidir, həm də bu işə münasibdir».

Həzrət Əli (ə) nə qədər israr etdisə də, faydası olmadı. İraq camaatı həzrətin istəyinin ziddinə olaraq hakimiyyət üçün Əbu-Musanı seçdi. Hicri ٣٨-ci il səfər ayının ١٧-də həzrət Əlinin (ə), Müaviyənin, hər iki tərəfdən olan şahidlərin imzası ilə belə bir sülh müqaviləsi yazıldı: «Həkəmlər (hakimlər) hicri ٣٨-ci il, ramazan ayınadək (altı ay ərzində) tərəflər arasındakı ixtilafları Qur’ani-Kərim əsasında həll edəcək və ilahi göstərişlərin pozulmasına yol verilməyəcək. Bu iki şəxsin İraq və Şam dövlətləri tərəfindən siyasi toxunulmazlığı var. Müəyyənləşdirilmiş müddət başa çatdıqdan sonra həkəmələrin hökmü Qur’an əsasında olsa, xalq onu dəlil kimi qəbul edəcək, Allahın hökmünün ziddinə olsa, xalq həmin qərara təslim olmayacaq. Əgər tə’yin olunmuş vaxt çatmamış həkəmələrdən biri ölsə, onu göndərmiş dövlət başqasını tə’yin edəcək və bu tə’yinatda şərtlər əsas götürüləcək. Əgər həkəmələr razılaşa bilməsələr, İraq və Şam arasında yenidən savaş başlayacaq».

Müharibənin mühakimə yolu ilə həll olunması məsələsi zahirən aqilanə bir iş idi. Amma xalq bir işdən xəbərsizdi ki, Əbu-Musanın hakimliyinə Əli, Malik, ibn Abbas və başqaları e’tiraz etdiyindən onun heç bir səlahiyyəti yoxdur. Əvvəldən mə’lum idi ki, Əmr As Əbu-Musanı öz tə’siri altına salacaq və hiylə işlədib aldadacaq. Bu mühakimənin Müaviyənin xeyrinə tamamlanacağına heç bir şübhə yox idi.

Sülh müqaviləsindən sonra Müaviyə Şama getdi. Həzrət Əli (ə) şəhadətə yetən əsgərlərinə namaz qıldı, onları torpağa tapşırdıqdan sonra səfər ayının axırlarında Kufəyə qayıtdı.

Əvvəldə qeyd olunduğu kimi, bu döyüş ərəblərin ən qanlı döyüşü idi. Bu döyüşdə ölənlərin sayının doxsan beş minə çatdığı bildirilir. «Nasexut-Təvarix» müəllifinin yazdığına görə, Süffeyn döyüşündə ölənlərin sayı yüz on min nəfər idi. Doxsan min Şam qoşunundan, iyirmi min Kufə qoşunundan həlak olmuşdu.

## HƏKƏMİYYƏ VƏ ONUN NƏTİCƏLƏRİ

Əbu-Musa və Əmr As hakimiyyət üçün seçildikdən sonra Mədinə və Şam arasındakı bir qala görüş yeri seçildi. Nümayəndələri hər tərəfdən dörd yüz

.süvari müşayiət edirdi. Hakimlər bu adamların hüzurunda öz rə'ylərini bildirməli idilər

Əmr As öz süvariləri ilə görüş yerinə üz tutub Əbu-Musadan bir neçə gün qabaq oraya çatdı. Həzrət Əli (ə) Əbu-Musa ilə gedən dörd yüz nəfərə Şərih ibn Harini sərkərdə tə'yin etdi. Abdullah ibn Abbas isə bu dəstənin cəmiyyət imamı kimi onlara qatıldı. Səfərə çıxmazdan qabaq Müaviyə Əmir Asa dedi: «Bilirsən ki, mən və Şam qoşunu səni həvəslə bu işə seçmişik. Əbu Musanın nümayəndəliyini isə zorla qəbul etdiriblər. İndi «.görək nə edəcəksən

Abdullah ibn Abbas Əbu-Musaya dedi: «Sən ərəblərin ən böyük hiyləgəri ilə üz-üzə gələcəksən. Məkrdə ərəblər arasında onun misli yoxdur. Özünü gözlə, çalış ona aldanmayasan. Bilirsən ki, həzrət Əli (ə) bütün əxlaqi və mə'nəvi dəyərlərə malikdir və «.xəlifəliyə ondan ləyaqətlisi yoxdur. Müaviyə isə zülm və azğınlıq yolunu tutmuşdur

Əmr Asa Əbu-Musanın gəlişi xəbər verildikdə onun qarşısına çıxdı, yaltaqcasına nəvaziş göstərərək ilk görüşdəcə rəqibinin ağlını oğurladı. Əmr Asın hörmət və ehtiramını görən Əbu-Musa özünü itirdi və bütünlüklə Əmrin ixtiyarına keçdi. Vəziyyəti yaxından izləyən İbn-Abbas Əbu-Musaya xəbər göndərdi ki, Əmr Asın təvazö və sadəliyinə aldanmasın. İraq nümayəndəsinin nəzərinə çatdırdı ki, Əmr As ondan daha möhkəm ictimai mövqelərə malikdir və göstərdiyi təvazö yalnız öz əqidəsin qəbul .etdirmək məqsədi daşıyır

İbn-Abbasın sifarişini Əbu-Musaya Ədi ibn Hatəm çatdırdı. Amma özünü ixtiyar sahibi hesab edən Əbu-Musa belə dedi: «Sizin bu mühüm işə qatılmağınızı istəmirəm. Bütün müsəlmanlar tərəfindən bu iş üçün seçilmişəmsə, mənə nəsihət verməyin. Sonra Əmr Asa dedi: «Bundan sonra söhbətlərimiz məhrəmanə və məxfi olsun ki, kimsə bu söhbətlərdən xəbər tutmasın». Özü belə bir təklif vermək istəyində olan Əmr As fürsəti fövtə verməyib dərhal bir guşədə çadır qurdurdu. Hətta çadırın ətrafında arx çəkildi ki, kimsə çadıra yaxınlaşa bilməsin. Beləcə Əbu-Musa Əmr Asla ikilikdə müzakirələrə .başladı

Əmr As Əbu-Musanı böyük hörmətlə qarşıladı və onu tovlamaq üçün bütün hazırlıqları .gördü. Nəhayət, iki nümayəndə arasında müzakirələr başladı

Əmr As Əbu-Musaya dedi: «Osmanın məzlumcasına öldürülməsinə heç bir şəkk yoxdur. Sən özün də Osmanın tərəfdarlarındansan». Əbu-Musa dedi: «Osman öldürülən zaman mən Mədinədə olmamışam. Yoxsa ona əlimdən gələn köməyi edərdim». Əmr dedi: «İndi Müaviyə Osmanın qanını almaq üçün ayağa qalxıb və xəlifəlikdə tamahı yoxdur. Sən də ona kömək etsən Osmanın qanı alınar. Əgər Müaviyəni xilafət kürsüsünə oturtsaq, özü də Qüreyş ailəsindən olan bu tədbirli kişi .«müsəlmanların xeyrinə iş görər

Əbu-Musa bir qədər tərəddüdlə soruşdu: «Müaviyə şərafətli ailədəndir, yoxsa Əli? Müaviyənin hansı şərafəti var ki, Əli həmin şərafətdən məhrum olsun? Bizim mühakimələrimiz bütün müsəlmanlara bağlıdır və bu sadəliklə qərar çıxarmaq olmaz. Mən elə güman edirəm ki, Abdullah ibn Ömər xəlifəlik üçün daha layiqlidir. Çünki bu .«vaxtadək fitnə yaratmayıb, həm də nəfsi təmiz, xoşəxlaq adamdır

Əmr dedi: «Xəlifəlik məqamı hər adamın yeri deyil. Müsəlmanların xəlifəsi cür'ətli, tədbirli və uzaqgörən olmalıdır. Abdullahda belə sifətlər yoxdur». Əbu-Musa dedi: «Sən .«israr edirsən ki, hökmən Müaviyə xəlifə olsun. Mən isə onun xəlifəliyinə razı deyiləm

Əmr As Əbu-Musanın müxalif olduğunu görüb başqa bir hiylə işlətmək qərarına gəldi. Əbu-Musanın əlindən tutub çadırdan bayıra çıxardı və dedi: «Başqa bir təklif edirəm və düşünürəm ki, bu təkliflə müxalif olmayacaqsan». Əbu-Musa dedi: «Məqsədin nədir?» Əmr As dedi: «Bir halda ki, sən Müaviyənin, mən isə Əli ilə Abdullah ibn Ömərin xəlifəliyinə ziddik, onda həm Əlini (ə), həm də Müaviyəni uzaqlaşdırıb, xəlifə seçimini müsəlmanların şurasına tapşıraq. Qoy onlar xəlifəni seçsin, biz isə məs'uliyyətdən .«azad olaq

Əbu-Musa Əmrin təklifi ilə razılaşdı və bu məsələ ilə bağlı öz mövqeyini e'lan etdi. Əmr As öz məqsədinə tez çatmaq üçün dedi: «Ey Peyğəmbərin (s) ən girami səhabəsi, bizim üçün tə'yin olunmuş vaxt başa çatmaqdadır. Yaxşı olar ki, fürsəti fövtə verməyib, öz .«rə'yimizi müsəlmanlara açıqlayaq

Əbu-Musa növbəti dəfə Əmrin hiyləsinə uyub səhəri gün bu işin görülməsinə razılıq ,verdi. Artıq məqsədinə çatmış Əmr As Əbu-Musanı gözdən qaçırmayıb

.onun səhabələrlə görüşünün qarşısını almaq istəyirdi

Nəhayət, nəzərdə tutulmuş vaxt çatdı, Əbu-Musa və Əmr As xalqın qarşısına çıxdı. Əmr As növbəti dəfə hiyləyə əl ataraq Əbu-Musanın ağlını oğurladı və onu ilk sözü deməyə vadar etdi. İbn-Abbas Əbu-Musaya birinci danışmamağı tapşırsa da, Kufə nümayəndəsi verilən tövsiyələrə əhəmiyyət vermədən xalqa xitabən dedi: «Ey camaat, kimsəyə gizli deyil ki, Siffeyn döyüşü neçə minlərlə insanın həyatına son qoydu, körpələr atasız, qadınlar dul qaldılar. Bu savaşın səbəbkarı xəlifəlik iddiasında olan Əli və Müaviyə olmuşdur. Məsələ hakimlərin ixtiyarına verilməsəydi, hələ də qardaş qırğını davam edirdi. Müsəlmanların asayişdə yaşaması üçün Əmr Asla razılaşmışıq ki, bu iki nəfəri xilafətdən uzaqlaşdıraq və müsəlmanların şurasını təşkil edib ləyaqətli bir adamı xəlifə seçək. Mən İraq və Hicaz müsəlmanları tərəfindən səlahiyyətimdən .«istifadə edib, Əlini xəlifəlikdən kənarlaşdırıram

Əbu-Musanın bu sözlərindən sonra ətrafda tərəfdarların hay-küyü qalxdı. Amma Əmr As fürsəti əldən vermədi, Əbu-Musadan sonra sözə başlayıb, qardaş qırğınını pislədi və belə əlavə etdi: «Bu fitnə Əli və Müaviyə arasındakı ixtilafdan yarandığı üçün mən də Əbu-Musanın fikri ilə razılaşıb Əlinin xəlifəlikdən uzaqlaşdırılmasına səs verirəm. Əvəzində isə daha layiqli olduğu üçün Müaviyəni xəlifə seçirəm. Müaviyə bu məqama layiqdir və Osmanın qatillərini cəzalandırmaq onun öhdəsinə düşür». Əmr As sözünü başa çatdırdıqdan sonra ətrafdakı həyəcan daha da şiddətləndi. Əmrin hərəkəti ən çox Əbu-Musanı qəzəbləndirmişdi. O, Əmr Asa dedi: «Ey günahkar hiyləgər, sən Qur’anda haqqında danışılan it kimisən. O iti qamçılasan da, azad buraxsan da hürür». Əmr As gülümsündü və dedi: «Sən isə bir qucaq kitab yüklənmiş uzunqulağın tayısan». Əslində Əmr Asın dediyi sözlər həqiqət idi. Bu hadisədən sonra Əbu-Musanı «Himar (uzunqulaq) Əş’əri» çağırmağa başladılar. Bu şəxs sonradan anladı ki, həzrət Əlinin (ə) .onun haqqındakı rə’yi düzgün imiş

Əbu-Musa həzrət Əli və onun tərəfdarlarının qorxusundan Məkkəyə qaçdı. Əmr As isə Müaviyə ilə görüşə tələsib, üz-üzə gəldikdə onu xəlifə kimi salamladı. Hakəmiyyət Müaviyənin bildirdiyi kimi, Əmr Asın oyunlarından

biri idi. Döyüşün taleyinin mühakiməyə tapşırılması həzrət Əliyə (ə) zorla qəbul etdirilmişdi. Amma hakimlər onlara tapşırılmış öhdəçilikləri yerinə yetirmədiyindən onun səhabələri yenidən ayağa qalxdılar. Əvvəla, Qur’an ayələrində bu savaşın taleyini həll edəcək göstərişlər yox idi. İkincisi, Təlhə ilə Zübeyrdən başqa kimsə həzrət Əli (ə) ilə bey’ətini sındırmamışdı. Üçüncüsü, Əmr As və Əbu-Musa mövcud ixtilafı Qur’an əsasında həll etməli idilər. Həzrət Əli (ə) mühakimədən qabaq Müaviyəyə yazmışdı ki, mən sənin sözlərini qəbul etməsəm də, Qur’an hökmünü qəbul edirəm. Hansı ki, hakimlər Qur’ana müraciət etməmiş, yalnız Əmr Asın fikirləri Əbu-Musaya təlqin olunmuşdu. Dördüncüsü, bu iki şəxs öz səlahiyyətlərini aşmışdılar. .Onlara xəlifələri işdən kənarlaşdırmaq səlahiyyəti verilməmişdi

Bütün bunlardan əlavə, hakimlər hər iki xəlifəni işdən kənarlaşdırıb, xəlifə seçimini şuraya tapşırmağa razılaşmışdılar. Hansı ki, Əmr As bu şərti pozub başqa cür hərəkət etdi. O, Müaviyəni xəlifəlikdən kənarlaşdırmaq əvəzinə, onun xəlifəliyini təsdiqlədi. Onun bu rəftarından aydın görünür ki, Əbu-Musa ilə kəsilmiş şərti pozmuşdu. Bütün bu səbəblərdən həzrət Əli (ə) və onun tərafdarları mühakimənin nəticələrinə e’tiraz .etdilər və iş yenidən əvvəlki vəziyyətinə qayıtdı, son sözü qılınclar deməli oldu

Həkəmiyyət nəticəsində həzrət Əlinin (ə) qoşununda pərakəndəlik gücləndi və on iki min nəfərdən ibarət olan xarici məzhəblər ortaya çıxdı. Onlar nəinki həzrət Əliyə kömək etmədilər, hətta ona mane olmağa başladılar. Həzrət Əli (ə) nəticədə .Nəhrəvanda bu dəstə ilə döyüşməyə məcbur oldu

## NƏHRƏVAN DÖYÜŞÜ

Həzrət Əli (ə) hicri ۳۸-ci il, səfər ayının axırlarında Siffeyndən Kufəyə qayıtdıqdan sonra şəhadət gününədək, yə’ni iki ildən artıq bir müddətdə şərhi mümkünsüz bir pərişanlıq halında oldu. Dörd bir yandan hücum çəkən ardıcıl uğursuzluqlar onun böyük ruhunu .və qəlbini incitmişdi

Həzrəti incidən Müaviyə və Əmr Asın alçaqlıq və hiyləgərliyi yox, öz səh:۱۲۶

:qoşununun və tərəfdarlarının vəfasızlığı və axmaqlığı idi. Həzrət bu barədə buyururdu

,Biganə oxundan axmaz göz yaşım

.Aşinalar yardı bağrımın başın

Kufəlilərin laqeydliyi həzrəti o qədər incitmişdi ki, hətta bir neçə dəfə ölüm arzulamışdı. Həqiqətən də, belə bir e’tibarsız və süst qövmün şərindən yalnız ölüm insanı xilas edə bilərdi. Həzrət öz xütbələrindən birində əshabını məzəmmət edərək buyurur: «And olsun Allaha, əgər sorağıma ölüm gəlsə və əlbəttə ki, gələcək, aramıza ayrılıq saldığı .«vaxt görəcəksiniz ki, sizinlə ünsiyyətdən ikrah duyuram

Siffeyndə Qur’anlar nizələrin başına taxıldığı vaxt Əmr Asın həkəmiyyət barədəki təklifi İraq qoşununda böyük bir ixtilaf yaratdı. Həzrət Əlinin (ə) növbəti .uğursuzluqlarının səbəbi məhz bu mühakimə hadisəsi də sayıla bilər

Xilafət məsələsində həzrət Əli (ə) ilə Müaviyə arasındakı ixtilaf həkəmiyyətə tapşırıldı, həzrət Əlinin (ə) əqidəsinin ziddinə olaraq onun tərəfindən Əbu-Musa Əş’əri nümayəndə seçildi. Amma sülh müqaviləsindən sonra həzrətin qoşunundan olan bə’zi adamlar «Bəs ölənlərin qanı hara getdi» deyə sual verdilər. Onlar həzrətə e’tiraz edərək dedilər: «Biz Allahın hökmünü istədik, Əbu-Musa və Əmr Asın həkəmiyyətini .yox». Hətta hər iki tərəfə qarşı çıxanlar da oldu

Bu adamlar elə düşünürdülər ki, həm Əlinin (ə), həm də Müaviyənin hakimiyyəti batildir və hökm yalnız Allaha məxsusdur. Bu əqidə kök ataraq Siffeyndən Kufəyə ayaq açdı və həzrətin on iki minə yaxın döyüşçüsü bu fikirlə onun qoşunundan ayrıldı. Onlar qoşunun qalan hissəsi ilə mübahisəyə başlayıb, bir-birlərini kafir adlandırdılar. Həzrətin qoşunundan ayrılan bu adamlar Əbdüllah ibn Vəhəbin başçılığı altında bir .yerə toplandılar

Xəvaric (xaricilər) adlandırılan bu güruhun şüarı «Allahın hökmündən savay hökm .yoxdur» buyuruğu idi. Bu adamlar zahirən abid və zahid idilər

Uzun səcdələr nəticəsində alınları qabarlamışdı. Amma onlar küfr həddinə çatmış axmaqlıqları səbəbindən nə edəcəklərini bilmirdilər. Həzrət Əli (ə) bu adamlar haqqında buyurmuşdu: «Bu adamlar həqiqəti batil zülmətində axtarırlar».

Onlara anlatmaq olmurdu ki, onların özlərinə hakim seçdikləri Qur’an kağız və mürəkkəbdən ibarətdir. Bu kitabın hökmlərini yerinə yetirmək üçün hakimə ehtiyac olduğunu bu güruha başa salmaq qeyri-mümkün olmuşdu. İraq müsəlmanlarının əqidəsincə, belə bir adam «Natiqe-Qur’an» adlandırılan Əli ola bilərdi. Amma Müaviyə və tərəfdarları həzrətin hakimiyyəti ilə barışmadılar və nəticədə heç bir hakimlik səlahiyyəti olmayan Əmr As və Əbu-Musaya tale yüklü bir məsələnin həlli tapşırıldı.

Həzrət Əli (ə) onların səhvlərini nəzərlərinə çatdırmaq üçün Abdullah ibn Abbası onların yanına göndərdi. Amma azğın firqə öz yanlış əqidəsindən əl çəkmədi. Onların ən mühüm iradı bu idi ki, həzrət Əli (ə) şamlılarla döyüşdüyü halda, nə üçün onların mülkünün qarət olunmasına icazə vermədi? Onların ikinci iradı həkəmiyyət məsələsinin Əbu-Musa və Əmr Asa tapşırılması idi. Həzrət Əlinin (ə) sülh müqaviləsinin «Əmirəl-mö’minin adı» ilə başlaması onların üçüncü iradı idi. Onlar deyirdilər ki, əgər Əli (ə) Əmirəl-mö’minin adı ilə başlamamışsa, demək özü öz xilafətinə əmin deyil. Onların iddiasına görə bu müharibədə həlak olanların qanı hədər getmişdi. Nəhayət, Həzrət Əli (ə) özü onların görüşünə getdi. Bu azğın firqəni nəsihət edərək buyurdu: «Mən də sizin kimi Qur’an hökmlərinin icrasını istəyirəm. Elə bu məqsədlə də Müaviyə ilə döyüşürdüm. Özünüz gördünüz ki, mən döyüşün dayandırılması və Əbu-Musanın hakim seçilməsi ilə müxalif idim. Amma sizin öz təzyiqlərinizlə döyüş başa çatdı və Əbu-Musa hakim seçildi. Biz yenə də əvvəlki mövqeyimizdə qalırıq və Şama növbəti həmlə qərarındayıq. Gəlin siz də bizə kömək edin».

Xəvaric həzrətin cavabında dedi: «Biz də, sən də kafir olmuşuq. Biz tövbə etdik, sən isə əvvəlki halında qalmısan. Əgər sən də tövbə etsən, yenidən sənə qoşularıq».

Azğın güruh hər şeyi pisləyirdi və bir Qur’an ayəsini şüar etmişdi:

Allahın nazil etdiyi ilə hökm etməyənlər, əlbəttə, kafirdirlər».(۱) Amma bu adamlar heç» vəchlə qəbul etmək istəmirdilər ki, Allahdan nazil olan hökmləri həyata keçirəcək rəhbərə ehtiyac var və bu rəhbər Əlidir. Bu adamların islahından ümidini üzən Həzrət Əli (ə) onların köməyi olmadan Şama həmlə üçün hazırlaşmağa başladı. Bu arada bir sıra başqa hadisələr də baş verdi və bu hadisələr iraqlıların uğursuzluğu və həzrət .Əlinin (ə) pərişanlığı ilə nəticələndi

Hakimlərin (həkəmiyyətin) rə’yindən razı qalan Müaviyə günbəgün öz mövqelərini möhkəmləndirirdi. O öz hakimiyyət dairəsini genişləndirir və iraqlılar arasındakı .ixtilaflardan istifadə edərək həzrət Əlinin (ə) üstünə hücuma hazırlaşırdı

Müaviyə Zöhhak ibn Qeysə demişdi ki, dörd min döyüşçü ilə birlikdə İraq əyalətlərinə basqınlar edib, xalqı çalıb-çapsın, qarşısına keçəni qılıncdan keçirsin. Müaviyə bu basqınlarla iraqlıları daim qorxuda saxlamaq və onları hücum fikrindən daşındırmaq .istəyirdi

Alçaq və qaniçən bir şəxs olan Zöhhak Müaviyənin tapşırıqlarını lazımınca yerinə yetirdi. O, İraq sərhəddinə çatıb, qətl-qarətə məşğul oldu. O, Əmr ibn Uməysi öldürüb, onun yoldaşlarının boynunu vurdu. Abdullah ibn Məs’udun qardaşı Əmrin öldürülməsi xəbəri həzrət Əliyə çatanda həzrət qəzəbindən titrədi, minbərə çıxıb, süstləşmiş Kufə əhlinə xitabən buyurdu: «Ey Kufə əhli, əgər Allah yolunda çalışırsınızsa, Əmr ibn Uməysə doğru tələsin. Sizin həmdinlərinizin bir dəstəsini öldürüb, bir dəstəsini yaralayıblar. Düşmənlə savaşa qalxın, biganələri öz torpaqlarınızdan çıxarın. (Xalqdan bir səs çıxmadığını görüb buyurdu). Ey süst, vəfasız qövm, kaş sizin səkkizinizin yerinə Müaviyənin bir əsgəri olaydı. And olsun Allaha, sizdən yaxamı qurtarmaq üçün Allahla görüşə hazıram. Mənə xəbər çatıb ki, Müaviyə Zöhhak ibn Qeysi bizim torpaqlara qətl-qarət üçün göndərib. O alçaq, qaniçən də sizin qardaşlarınızdan bir dəstəsini öldürüb, mal-mülkünü tarac edib. Hansı ki, siz evlərinizdə oturub, özünüzü müdafiə etmək üçün .«yerinizdən tərpənmirsiniz



---

.Маидə» сурəси, ajə ۴۴» [۸۶] -۱

Həzrət Əli (ə) Hucr ibn Ədini Zəhhakın üstünə göndərdi. Zəhhak kufəlilərin qabağında dayana bilməyib, on doqquz döyüşçüsünü itirdikdən sonra baş götürüb Şama .qaçmağa başladı

Zəhhakdan sonra Bosr ibn Ərtat (Siffeyn döyüşündə Əmr Asın yolunu gedərək ayıb yerini açmaqla həzrət Əlinin (ə) qılıncından qurtaran alçaq) Müaviyənin göstərişi ilə Hicaz və Yəmənə yürüş edib, bir çox Əli şiələrini qətlə yetirdikdən sonra Şama qayıtdı. Həmin vaxt Übeydullah ibn Abbas həzrət Əli tərəfindən Yəmən valisi tə’yin olunmuşdu. Bosrun qarşısında tab gətirməyəcəyini görən Übeydullah Əmr ibn Ərakəni öz yerində qoyub Kufəyə gəldi. Yəmənə daxil olan Bosr qətl-qarətə başladı. O Əmr ibn Ərakəni, Übeydullahın iki körpə övladını qətlə yetirdi. Övladları gözü qarşısında qətlə yetirilən .ana dəli oldu

Bosrun qətl-qarətindən xəbər tutan Əli kufəliləri məzəmmət edərək Harisə ibn Quddaməni on iki min döyüşçü ilə Bosrun üzərinə göndərdi. Harisənin gəlişindən xəbər (tutan Bosr baş götürüb qaçdı.(۱

Müaviyə növbəti dəfə Süfyan ibn Ovf adlı sərkərdəsini altı min şamlı ilə qarət üçün İraqa göndərdi. Süfyan Ənbar şəhərinə daxil oldu, şəhər hakimi Həssan ibn Həssanı qətlə yetirdi və xalqı çalıb-çapmağa başladı. Onun döyüşçüləri hətta qadınların zinət əşyalarını da qarət etməkdən çəkinmirdilər. Amma bütün bu qətl-qarətlərin, soyğunçuluqların səbəb kufəlilərin həzrət Əlinin göstərişlərinə laqeyd yanaşması idi. Uyğun hadisələrlə bağlı həzrət minbərə çıxıb buyurdu: «Mənə xəbər çatdı ki, Müaviyənin göstərişi ilə Ənbar şəhərində qətliam törədilmişdir. Şəhər hakimi öldürülmüş, süvarilər şəhərdən çıxarılmışdır. Onların döyüşçülərindən biri bir müsəlman və bir zimmə qadının evinə daxil olub onların zinət əşyalarını götürmüşdür. Düşmənlər Şama böyük qənimətlə qayıtmışlar. Əgər bir müsəlman kişi bunları eşitdikdə qəmdən ölərsə, məzəmmət edilməməlidir. Sizi yayda düşmənlərlə döyüşə çağırdığım vaxt dediniz ki, hava istidir, bizə möhlət ver. Sizi qışda döyüşə çağırdıqda dediniz ki, havalar soyuqdur bizə möhlət ver. Siz ki, bəhanələrlə istidən və

soyuqdan qaçırsınız, and olsun Allaha, döyüş meydanında qılıncdan daha tez qaçacaqsınız. Ey namərd insanlar, ey uşaq ağlında olanlar. Kaş sizi görməyəydim və tanımayaydım. Sizi tanımağın nəticəsi peşimanlıq, qəm-qüssədir. Allah sizi öldürsün ki, qəzəbdən bağrımı yardınız, hər nəfəsdə qəm-qüssəni damla-damla boğazıma (tökdünüz, öz itaətsizliyinizlə tədbirimi puça çıxardınız». (١)

Amma yuxarıda sadalanmış hadisələrlə iş başa çatmırdı. Aramsız üzücü hadisələr :həzrəti bir an olsun belə rahat buraxmırdı. Bu hadisələrdən bə’zilərinə nəzər salaq

Həzrət Əlinin xilafətinin ilkin dövründə Qeys ibn Sə’d Misir hakimi tə’yin olundu. Siffeyn döyüşü zamanı Qeys qoşun bölmələrindən birinə komandan seçildiyi üçün onun yerinə .Məhəmməd ibn Əbu-Bəkr göndərildi

Məhəmməd Misirdə valilik işlərinə məşğul olduğu vaxt Müaviyə həkəmiyyət məsələsini başa vurub Əmr Asa və’d etdiyi Misir haqqında götür-qoy etməyə başladı. Bu məqsədlə Misir üzərinə qoşun göndərildi, eyni zamanda Əmr As öz hiylələri ilə Misir .xalqını Məhəmmədə qarşı qaldırmağa başladı

Müaviyə qarşısında uğursuzluğa düçar olan Məhəmməd vəziyyət barədə həzrət Əliyə (ə) mə’lumat verib, kömək istədi. Həzrət Əli (ə) Cəzirə əyalətində olan Malik Əştəri Misirə göndərib, Məhəmmədi geri çağırdı. Çünki Misirdə Müaviyə və Əmr Asın .hiylələrinə qılıncla cavab verəcək adam lazım idi

Malik Əştər hicri ٣٨-ci il zil-qə’də ayında Kufədən çıxdı və Misirə üz tutdu. Əli (ə) sayaq qərib və fəqirlərə dərin məhəbbət göstərən Malik Əştər yolda rastlaşdığı bir adamdan kimliyini və haraya getdiyini soruşdu. Həmin şəxs dedi: «Adım Nafedir. Mədinədə Ömər ibn Xəttabın qulamı idim. İndi azadam. Mədinədə vəziyyətim yaxşı olmadığından Misirə getmək qərarına gəlmişəm. Olsun ki, Misirdə bir iş tapam». (Əslində Nafe Ömərin yox, .(Osmanın qulamı olmuşdu

Malik dedi: «Əgər istəsən, mənimlə qala bilərsən. Mən sənin geyimini və

yeməyini tə’min edərəm». Nafe dedi: «Necə də böyük səadət! Əlbəttə ki, mən sizinlə qalıram». Malik bu şəxsi özü ilə götürdü.

Bir qədər getdikdən sonra Misirdən üç günlük məsafədə yerləşmiş Qəlzəm şəhərinə çatdılar. Gecəni orada qalıb səhəri gün yola düşdükləri vaxt Nafe baldan düzəldilmiş şərbətə bir qədər zəhər qatıb Malikə verdi. Ötən bir neçə gün ərzində bu qulamın canıyananlığını görən Malik şərbəti ondan alıb içdi. Bir neçə saat yol getdikdən sonra Malikin əhvalı dəyişməyə başladı. Nəhayət, onun vəziyyəti ağırlaşdı və yerə yıxıldı. Döyüşçülər Maliki əhatəyə alıb ona kömək etməyə çalışsalar da, artıq zəhər öz tə’sirini göstərmişdi. Malikin yoldaşları onun Nafe tərəfindən zəhərləndiyini bilsələr də, alçaq qulamı tapa bilmədilər. Az sonra Malik gözlərini dünyaya əbədi qapadı. Malikin dəstəsi onun cənazəsi ilə birlikdə geriyə döndü.

Nafe zəhərli şərbəti Malikə içirdikdən sonra Müaviyənin yanına gəldi. Onun gətirdiyi xəbər Müaviyəni çox sevindirdi. Şamlılara müjdə verdi ki, artıq Əlinin hücumları həyata keçməyəcək. Həzrət Əli (ə) çox möhkəm bir arxasını itirmişdi. Müaviyə Nafeyə nəvaziş göstərdi və Malikin qılıncından yaralar görmüş şamlılara şadlanmaq icazəsi verdi. Malikin ölüm xəbər həzrət Əlini ağır üzüntüyə saldı. Həzrət ağlayaraq buyurdu: «Malikin ölümü böyük faciədir. Onun oxşarını bir daha tapmayacağıq. Malik nə’rəsi düşmənlərin qəlbini titrədən bir şir idi. Malik kim idi? Əgər o dağ idisə, elə bir dağ idi ki, ona dırmanan zirvəsinə ayaq qoya bilməz, nə də bir quş yüksəkliyinə pərvaz edə bilməz. And olsun Allaha, Malikin şəhadəti Şam əhlini ucaltdı və İraq əhlini xar etdi. Bundan sonra Malik kimisini görməyəcəyik».(١)

Həzrət Əli (ə) Misir hökumətini yenidən Məhəmməd ibn Əbu-Bəkrə tapşırdı. Onu Malikin şəhadətindən xəbərdar etdi. Amma Müaviyə və Əmr As öz hiylələrindən əl çəkməmişdilər. Onlar öz məktubları ilə Məhəmmədi hədələyir, həm də onu yalan və’dlərlə şirnikdirirdilər. Məhəmməd hər dəfə onlara mənfi cavab verirdi. Məhəmməd ibn Əbu-



---

١- [٨٩] «Насихут-Тəварих», сəh. ٥٢١.

Bəkrin fədakarlığı və sədaqətinə heç bir şübhə ola bilməzdi. Məhəmmədi yoldan çıxara bilməyəcəyini anlayan Müaviyə başqa tədbirlər görməyə başladı. Əmr Asın hiylələri nəticəsində Misir xalqı Məhəmmədə qarşı qiyam qaldırdı.

Məhəmməd Misirdə yaranmış vəziyyət haqqında həzrət Əliyə mə'lumat verdi. Həzrət Əli (ə) Məhəmmədə yazdığı məktubu Kufə məscidində camaata oxuyub, növbəti dəfə onları süstlükdə və laqeydlikdə məzəmmət etdi. Həzrət baş vermiş bütün uğursuzluqların səbəbi kimi Kufə xalqının süstlüyünü göstərirdi. Bu çıxışından sonra həzrət on iki min döyüşçünü Malik ibn Kə'bin komandanlığı altında Məhəmmədə köməyə göndərdi. Amma Kufədən gedən kömək Misirə çatanadək Məhəmməd öz azsaylı tərəfdarları ilə Şamdan gəlmiş Müaviyə ibn Xədic və onun dəstəsi ilə vuruşdu və nəhayətdə məğlub olub şəhadət dərəcəsinə çatdı.

Həzrət Əli (ə) hələ də Malik Əştərin şəhadəti üçün əza saxlayırdı. Bu vaxt Misirin süqutu və Məhəmmədin şəhadəti haqqında xəbər gəldi. Bu xəbər həzrəti daha da üzdü və o ağlayaraq buyurdu: «Malik və Məhəmmədin şəhadətindən yaranmış üzüntümüz Şam əhlinin bu hadisələrə sevincindən çoxdur».

Bəli, üzüntülü hadisələr bir-birini əvəz edirdi. Növbəti acı xəbər Bəsrə hakiminin Müaviyənin təhriki ilə Əlinin (ə) itaətindən çıxıb, Məkkə üzərinə qoşun çəkməsi oldu.

Zaman ötdükcə azsaylı həqiqi müsəlmanların vəziyyəti ağırlaşırdı. Həzrət Əlinin (ə) xalqa nəsihətləri heç bir fayda vermir, əhali öz torpaqlarını düşməndən qorumaq üçün ayağa qalxmırdı.

Siffeyndən qayıtdıqdan sonra bu uğursuzluqlar iki il davam etdi. Yalnız hicrətin ۴۰-cı ilində həzrət Əlinin (ə) uzun-uzadı çalışmaları və nəsihətlərindən sonra onun öz rəhbərliyi ilə qəti bir hücum üçün qoşun toplandı. Könüllülərin sayı iyirmi minə çatırdı. Qoşun Nuxəylə adlanan yerdə düşərgə qurub həzrətin əmrini gözlədi. Həzrət ona tabe olan hakimlərə qoşun təchizatı haqqında yazılı göstəriş verdi. Amma bu vaxt həzrəti qarşıya qoyulmuş qəti məqsəddən daşındıran bir hadisə baş verdi. Haqqında əvvəlcə danışdığımız xəvaric firqəsi Əbdüllah ibn Vəhəbin başçılığı ilə

.fitnə yaradıb, əvvəlki əqidələrini yenidən ortaya qoydular

Həzrət Əlinin (ə) komandanlarının iştirakı ilə təşkil olunmuş hərbi şurada xəvaric fitnəsi müzakirə olundu. Belə görünürdü ki, əgər həzrətin qoşunu Şama hücum üçün Kufədən çıxsa, xəvaric Kufəni işğal edəcək. Belə bir məqamda iki cəbhədə müharibə aparmaq lazım gələcəkdi. Ona görə də Şama hücumdan qabaq xəvariclə qarşıdurma həll .edilməli idi

Bütün vaxtlarda sülhü müharibədən üstün tutan həzrət xəvaricə məktubla müraciət edib, onları tutduqları yoldan çəkinməyə çağırdı. Həzrət xəvarici haqqın müdafiəsinə .və Müaviyə ilə mübarizəyə də'vət etdi

Abdullah həzrət Əlinin (ə) məktubunu oxuyub, onu gətirən şəxsə dedi: «Bizim adımızdan Əliyə de ki, o kafirdir. Əvvəlcə tövbə etsin, sonra bizi köməyə çağırsın». .Sonra Abdullah göstəriş verdi ki, bütün xəvaric Nəhrəvana doğru hərəkət etsin

Xəvaric Nəhrəvanda düşərgə qurduqdan sonra ətrafdan tərəfdarları onlara doğru hərəkət etməyə başladılar. Onların sayı artıb on iki min nəfərə çatdı. Nuxəylədə düşərgə qurmuş həzrət Əli (ə) Şam fikrindən daşınıb, Nəhrəvana üz tutdu. Həzrət Əli (ə) Nəhrəvana çatanda xəvaric ağız-ağıza verib ucadan qışqırırdı: «Hökm yalnız Allahındır». Həzrət Əli (ə) nə qədər qəzəblənsə də, bu adamların halına acıyırdı. Çünki .bu insanlar əqidə baxımından yanılmışdılar və öz səhvlərini dərk etmirdilər

Həzrət, xəvaric cərgələri ilə üzbəüz dayandı və höccəti tamamlamaq üçün onların komandanı Abdullahla söhbətə başladı. Sonra həzrət bütün xəvaricə üz tutub dərin məntiq və yetərli kəlamlarla onların səhvləri haqqında danışdı. Amma bu nadan insanlar yenə də əvvəlki kimi həzrətin tövbə etməsini istəyirdilər. Həzrət Əli (ə) buyurdu: «Ağ bayrağı Nəhrəvanın kənarında yerə taxın. Xəvaricin tövbə edənləri onun .«ətrafında toplansın

Azğın qövmün təqribən üçdə ikisi zahirən tövbə edib, ağ bayrağın ətrafında toplandı. Amma dörd min xəvaric və onların başçısı Abdullah ibn Vəhəb əvvəlki mövqedə qalıb, .həzrəti kafir adlandırırdılar. Həzrət Əli (ə) çarəsiz qalaraq onlarla döyüşə başladı

zəifləmiş müsəlmanların qəlbini gücləndirmək üçün buyurdu: «Bütün bu xəvaricdən on nəfərdən də azı sağ qalacaq. Siz isə ondan da az şəhid verəcəksiniz. Həzrətin uyğun .buyuruğu onun mö’cüzələrindən sayıla bilər. Həzrət necə demişdisə, elə də oldu

Savaş başladı və çox keçmədi ki, bütün xəvaric qılıncdan keçirildi. Yalnız on nəfər qaça bildi. Həzrət Əlinin (ə) qoşunundan isə yeddi nəfər şəhadətə çatdı. Həzrətin öncədən görməsi özünü doğrutdu. Döyüş başa çatdıqdan sonra həzrət Kufəyə qayıtdı. Aradan çıxmış on nəfərdən biri olan Əbdürrəhman ibn Mülcəm Məkkəyə qaçdı. Bu şəxs Murad .qəbiləsindən idi

## HƏZRƏT ƏLİNİN (Ə) ŞƏHADƏTİ

Həzrət Əli (ə) Nəhrəvan döyüşünü başa vurduqdan sonra Kufəyə qayıtdı və Şama hücum haqqında düşünməyə başladı. Əyalət hakimləri həzrətin fərmanına uyğun olaraq imkan həddində könüllü toplayır və təchiz olunmuş dəstələri imamın xidmətinə .göndərirdilər

Nəhayət, hicri ۴۰-cı il şə’banın axırlarında əyalətlərdən göndərilən qüvvələr Kufəyə daxil olub, Nuxəylə düşərgəsinə qatıldılar. Həzrət Əli (ə) səfərbər olmuş qüvvələri hərbi nizama saldı. Həzrət gecə-gündüz çalışmaqla döyüşçülərin zəruri ehtiyaclarını ödəyirdi. Qəlbləri Müaviyə, xüsusi ilə də Əmr Asın hiylələri səbəbindən kinlə dolmuş sərkərdələr həzrətə kömək edirdilər. Nəhayət, hicri ۴۰-cı il, mübarək ramazan ayının ikinci yarısında həzrət Əli (ə) bir xütbə ilə döyüşçülərin qəlbini riqqətə gətirib, onları Şama doğru hərəkət üçün hazırladı. Amma təqdir onun üçün başqa bir tale .müəyyənləşdirmişdi

Xəvaric fərariləri Məkkəni özləri üçün əməliyyat mərkəzi seçmişdilər. Əbdürrəhman ibn Mülcəm, Bərk ibn Abdullah və Əmr ibn Bəkr adlı üç xəvaric bir gecə əyləşib müsəlmanların keçmişi haqqında söhbət edirdilər. Söhbətin sonunda onlar belə bir qərara gəldilər ki, tökülən qanlarda Müaviyə, Əmr As və Əli (ə) günahkardır. Onların fikrinə görə əgər bu üç şəxs aradan götürülərdisə, müsəlmanlar rahatlığa çıxardılar. Nəhayət, həmin üç xəvaric belə bir razılığa gəlib and içdilər ki, hərəsi

həmin üç şəxsdən birini öldürsün. İbn Mülcəm həzrət Əlini (ə), Əmr ibn Bəkr Əmr Ası, Bərk ibn Abdullah isə Müaviyəni öldürməyi öhdəyə götürdü. Onlar qılınclarına öldürücü zəhər çəkib qərarlarını həyata keçirmək üçün ramazan ayının on doqquzuncu gecəsini seçdilər. Hərə öz vəzifəsini icra etmək üçün yola düşdü. Əmr ibn Bəkr Misirə, Bərk ibn .Abdullah Şama, İbn Mülcəm isə Kufəyə getdi

Bərk ibn Abdullah qədr gecəsi Şam məscidində səcdəyə getmiş Müaviyəni yalnız yaralaya bildi. Ağır yaralanmış Müaviyə yatağa düşdü. İbn Abdullahı onun yanına gətirdilər. Müaviyə dedi: «Sən hansı cür'ətlə bu işi gördün?» İbn-Abdullah dedi: «Əmr məni bağışlasa, ona müjdə verərəm». Müaviyə soruşdu: «Məqsədin nədir?» Bərk dedi: «İndicə Əlini də öldürdülər». Müaviyə bu xəbərin düzgünlüyünü yoxlayanadək, onu zindana saldı. Verilən xəbərin düzgün olduğu sübuta yetdikdən sonra Müaviyə ibn .(Abdullahı azad etdi». (bə'zi rəvayətlərə görə Müaviyə onun boynunu vurdurdu

Müaviyəni müayinə edən həkim dedi: «Əgər əmir övlad istəmirsə, onun yarasını dərmanla müalicə etmək olar. Yox əgər övlad istəyirsə, yara yeri qızdırılmış dəmirlə dağlanmalıdır». Müaviyə dedi: «Qızdırılmış dəmirə dözümüm yoxdur. İki oğul mənə bəs .«edər

Əmr ibn Bəkr də öz növbəsində gecə yarı Misirdə məscidə gedib, öz məqsədini həyata keçirmək istədi. Amma Əmr As şiddətli qızdırma içində olduğundan məscidə gələ .bilmədi və oğlunun məsləhəti ilə şəhər qazisini camaat namazına göndərdi

Namaz başladıqdan sonra birinci rəkətdə qazi səcdəyə gedərkən Əmr ibn Bəkr bir zərbə ilə onu qətlə yetirdi. Məsciddə hay-küy qopdu. Namaz yarıda qaldı, qatil misirlilərin əlinə keçdi. Camaat onu Əmr Asın ağır əzabları ilə qorxutduqları vaxt Əmr ibn Bəkr təəccüblə soruşdu: «Məgər Əmr As ölməyib?» Camaat ona bildirdi ki, onun .öldürdüyü şəhər qazisi olub

Əmr qazini nahaqdan öldürdüyü və məqsədini həyata keçirə bilmədiyi üçün ağlamağa başladı. Əmr As ondan ağlamasının səbəbini soruşduqda dedi: «Mən öz həyatım üçün ağlamıram. Təəssüf edirəm ki, qazini öldürmüşəm, sən isə sağ qalmısan. Heyf ki, ,dostlarım öz işini yerinə yetirdi

mən isə yox». Əmr As bu əhvalatı ondan soruşdu. Əmr dostları ilə birlikdə hazırladığı plandan danışdı. Əmr As göstəriş verdi ki, onun boynunu vursunlar. Bəli, Əmr Asın və .Müaviyənin qətli planı baş tutmadı

Əbdürrəhman ibn Mülcəmin taleyi başqa oldu. Bu şəxs hicri qırxıncı il şə’ban ayının axırlarında Kufəyə çatdı. Kimsə onun məqsədindən xəbərdar deyildi. İbn-Mülcəm tanışlarından birinin evində qalıb, mübarək ramazan ayının on doqquzuncu gecəsini gözləməyə başladı. Bir gün dostlarından birinin görüşünə gedərkən orada Qutam adlı gözəl bir qadınla rastlaşdı. Bu qadının atası və qardaşı Nəhrəvan döyüşündə öldürülmüşdü. İbn-Mülcəm bu qadınla ilk görüşdə onun gözəlliyinə aldandı və eşqini e’lan etdi. Qutam dedi: «Mənə mehriyyə nə verəcəksən?» İbn-Mülcəm dedi: «Hər nə istəsən». Qutam dedi: «Mənim mehriyyəm üç min dirhəm pul, bir kəniz, bir qulam və Əli :ibn Əbu-Talibin qanıdır». Necə də ağır bir mehriyyə! Şair bu barədə deyir

-Qutamın mehrinə tarix məəttəl

.Tələb etdi: Əli qanın götür gəl

Bəli, İbn-Mülcəmin cinayəti tarixdə görünməmiş bir cinayət oldu. Məqsədini daim gizli saxlamış İbn-Mülcəm Qutamı yoxlamaq üçün dedi: «Nə istəsən verərəm, Əlini qətlə yetirmək necə mümkündür?» Qutam dedi: «Bəli, adi halda kimsə bu işi görə bilməz. Onu yalnız qəfildən hücum edib öldürmək mümkündür. Onu öldürüb, mənim könül dərdimə şəfa ver, həm də öz kamına çat. Əgər bu işi görərkən ölsən, axirət mükafatın dünya mükafatından da üstün olacaq». İbn-Mülcəm başa düşdü ki, Qutam da xəvaricdəndir və onun əqidə yoldaşıdır. Dedi: «And olsun Allaha, mən Kufəyə yalnız bu işi görmək üçün gəlmişəm». Qutam dedi: «Mən də bu işi görməkdə sənə yardım edərəm. Sənə yardım üçün bir neçə nəfər ayıraram». Qutam İbn-Mülcəmi öz qəbiləsindən olan xəvaric əqidəli Vərdan ibn Məcalidin yanına göndərdi. Vərdan Qutamın istəyini yerinə .yetirəcəyinə söz verdi

İbn-Mülcəm özü də Əşcəə qəbiləsindən olan Şəbib adlı xəvarici köməkçi götürdü. Onlar öz məqsədlərindən Siffeyn döyüşündə həzrət Əlini sülhə məcbur

etmiş Əş’əs ibn Qeysi də xəbərdar etdilər. Əş’əs söz verdi ki, nəzərdə tutlmuş vaxt o da məsciddə olacaq. Nəhayət mübarək ramazan ayının on doqquzuncu gecəsi çatdı. .İbn-Mülcəm öz yoldaşları ilə məscidə gəlib həzrət Əlini (ə) gözləməyə başladı

həzrət Əli (ə) öz şəhadətindən xəbərdar idi. O, mübarək ramazan günlərindən birində minbərdə ikən əlini saqqalına çəkərək buyurdu: «İnsanların ən zalımı bu tükləri başımın qanına boyayacaq». Buna görə də həzrət ömrünün son günlərini övladlarından birinin .yanında keçirirdi. Şəhadət gecəsi isə qızı Ümmü-Gülsümün qonağı idi

İftar zamanı üç tikə yemək yedi. Sonra ibadətə durdu. Həzrət gecədən sübhədək təşviş içində oldu. Bə’zən səmaya baxıb ulduzları seyr edirdi. Sübh çağı yaxınlaşdıqca həzrətin narahatlığı da artırdı. Belə ki, Ümmü-Gülsüm ondan soruşdu: «Atacan, nə üçün bu gecə bir belə narahatsan?» Həzrət buyurdu: «Qızım, mən bütün ömrümü döyüş səhnəsində keçirmiş, adlı-sanlı pəhləvanlarla mübarizə aparmışam. Belə şeylərdən .«qorxmuram. Amma hiss edirəm ki, haqla görüş məqamı yaxındadır

Nəhayət, hövlnak gecə başa çatdı. Evdə yuva qurmuş quşlar evdən çıxmaq istəyən həzrətin qədəmləri önündə qanad çalaraq, sanki onu getməkdən çəkindirmək istəyirdilər. Həzrət buyurdu: «Bu quşların səs-küyünün ardınca növhə avazları ucalacaq». Həzrətin sözləri Ümmü-Gülsümü pərişan etdi. O, atasına belə dedi: «Yaxşı olar ki, tək getməyəsən». Həzrət buyurdu: «Əgər bəla yer bəlası olsa, mən təklikdə onu dəf etməyə qadirəm. Əgər bu səmanın qəzavü-qədəridirsə, hökmən yerinə .«yetməlidir

Həzrət məscidə üz tutdu. Dama çıxıb sübh azanını e’lan etdi. Sonra məscidə daxil oldu. Yatanları oyatdı. Sonra mehraba yaxınlaşdı. Sübh nafilə namazına durdu. Səcdəyə getdiyi vaxt Əbdürrəhman ibn Mülcəm zəhərli qılıncı ilə həzrətin mübarək başına bir zərbə vurdu. İbn-Mülcəmin zərbəsi bir vaxt Əmr ibn Əbdüvədin vurduğu zərbənin yerinə düşdü. Həzrətin başı alnınadək yarıldı. İbn-Mülcəm və yoldaşları dərhal .qaçdılar

Həzrət Əlinin (ə) mübarək başından qan axmağa başladı. Onun şərif saqqalı başının qanına boyandı. Həzrət buyurdu: «And olsun Kə’bənin Allahına, qurtuldum». Sonra həzrət bu ayəni tilavət etdi: «Sizi torpaqdan

yaratdım və torpağa qaytararam. Sonra yenidən torpaqdan qaldıraram». Bu vaxt həzrət Cəbrailin yer ilə göy arasından nida çəkdiyini eşitdi: «And olsun Allaha, hidayət sütunları uçuldu, təqva nişanələri məhv oldu, xaliqlə məxluq arasındakı ən möhkəm bağ qırıldı. Peyğəmbərin əmisi oğlu öldürüldü. Həzrət Əli (ə) şəhadətə çatdı. Ən .«zalımların ən bədbəxti onu şəhid etdi

Məsciddə hay-küy qopdu. Həsən və Hüseyn evdən məscidə qaçdılar. Bir qrup adam da İbn-Mülcəmin ardınca gedib onu tutdu. Həsən və Hüseyn haşimilərin köməyi ilə həzrəti kilimin üstünə qoyub evə gətirdilər. Dərhal həkim ardınca adam getdi. Həkim gəldikdən sonra yaranı müayinə edib yaranın sağalmaz olduğunu bildirdi. Çünki .həzrətin vurulduğu qılınca zəhər çəkilmişdi

Həzrət Əli (ə) başqalarından fərqli olaraq ölümünün labüd olduğunu eşitdikdə narahat olmadı. O, Həsən və Hüseynə vəsiyyət edirdi. Bəli, həzrət ölümdən qorxmurdu. O dəfələrlə buyurmuşdu ki, uşaq anasının döşünə müştaq olduğu tək o da ölümə .müştaqdır

Həzrət Əli (ə) ömür boyu ölümlə çarpışmışdı. Düşmənlər həzrət Peyğəmbərin (s) yatağını qılınclamaq istədikləri vaxt həzrətin (s) yerində yatan Əli (ə) idi. Həzrət daim İslam qəzavatlarında olmuş, ölümün gözünə dik baxmışdı. Həzrət buyurdu ki, mənim üçün fərqi yoxdur ki, ölüm mənim sorağıma gələ, ya mən ölümün sorağına gedəm». Həzrət (ə) Həsən və Hüseynə belə vəsiyyət etdi: «Sizə təqvalı olmağı və Allahdan qorxmağı tövsiyə edirəm. Dünya sizin ardınızca gəlsə də, siz onun ardınca getməyin. Əlinizdən dünya malı çıxdıqda təəssüflənməyin. Doğru və haqq söz danışın. Axirət .mükafatı üçün iş görün. Zalıma düşmən, məzluma yardımçı olun

Sizə, bütün övladlarıma və Əhli-beytimə məktubum yetişən hər bir adama təqvanı, Allahdan qorxmağı, həyat işlərini tənzimləməyi, öz aralarında sazişi vəsiyyət edirəm. Çünki babanız Peyğəmbərin belə dediyini eşitmişəm: «İki nəfər arasında sülh yaratmaq namaz və orucdan üstündür». Yetimlərə münasibətdə Allahdan

qorxun. Onların ağzı üçün növbə qərarlaşdırmayın (bə’zən tox, bə’zən isə ac olalar). Sizin diqqətsizliyiniz səbəbindən onlar zaya çıxmasınlar. Qonşulara münasibətdə Allahdan qorxun. Onları Peyğəmbər tapşırmışdır. Həzrət qonşuları elə tapşırardı ki, güman edərdik qonşu qonşudan irs aparacaq. Qur’ana münasibətdə Allahdan qorxun. Ona əməl etməkdə sizi ötüb keçməsinlər. Namaza münasibətdə Allahdan qorxun. Namaz dinin sütunudur. Kə’bəyə münasibətdə Allahdan qorxun. Nə qədər ki, dirisiz, Allah evini boş qoymayın. Əgər o boş qalsa, cəzada möhlət almayacaqsınız. Cihada münasibətdə Allahdan qorxun. Malınız, canınız, dilinizlə Allah yolunda cihad edin. Əlaqələrinizi qoruyun və bir-birinizə bağışlayın. Bir-birinizə arxa çevirməkdən, bir-birinizdən ayrılmaqdan çəkinin. Əmr be mə’ruf və nəhy əz münkəri (yaxşıya əmr, pisə qadağa) tərk etməyin. Yoxsa şər adamlar sizə hakim olar. Bu halda siz Allahı .çağırsanız da, O sizin dualarınıza cavab verməz

Ey Əbdül Müttəlib övladları, məbada «Əmirəl-mö’minin öldürülüb» deyə, xalqın qanını tökəsiniz. Bilməlisiniz ki, mənə görə yalnız məni öldürən qətlə yetirilə bilər. Elə ki, mən onun zərbəsindən öldüm, siz də əvəzində ona bir zərbə vurun. Onun meyitini təhqir .«etməyin. Həzrət Peyğəmbər (s) buyurub ki, muslə (meyiti təhqir) etməkdən çəkinin

Həzrət Əli (ə) zərbə aldıqdan sonra üç gün yataqda qaldı. Bu müddət ərzində təkcə ailəsi yox, həm də səhabələri onun yanında olurdu. Ətrafındakılar ömrünün son saatlarında həzrətin dəyərli buyuruqlarından faydalanırdılar. Həmin vaxt həzrətin buyurduğu dürlü öyüdlərdən biri də budur: «Mən dünən sizin müsahibiniz idim. .«Bugünkü vəziyyətim isə sizin üçün bir ibrətdir. Sabah isə sizdən ayrılaram

Həzrətə bir qədər süd gətirdilər. Azca içdi və sonra buyurdu: «Zindana saldığınız adama da bu süddən bir qədər verin. Onu incitməyin. Əgər sağ qalsam, özüm bilərəm, əgər ölsəm, ona yalnız bir zərbə vurun. Çünki o mənə bircə zərbə vurub». Sonra üzünü Həsənə tutub buyurdu: «Oğulcan, məndən sonra sən vəliyye-əmr, mənim qanımın sahibisən. Onu bağışlamaq istəsən, özün bilərsən. Əgər öldürsən, mənə bircə zərbə vurduğu üçün ona birdən artıq zərbə vurma». Qılınca çəkilmiş zəhər həzrətin bədəninə sirayət etdiyindən o hərəkətdən düşmüşdü. Ona görə də namazını oturaq halda qılır, daim zikr edirdi. Ramazanın iyirmi birinci gecəsi ölümü yaxınlaşan məqamlarda

buyurdu: «Son görüş üçün ailə üzvlərimi çağırın. Hamının hüzurunda vəsiyyət etmək istəyirəm».

Həzrətin övladları onun ətrafında cəmləşdi. Onların gözləri ağlamaqdan qızarmışdı. Həzrətin vəsiyyətlərini dinləyirdilər. Amma həzrətin vəsiyyətləri təkcə onun övladlarına aid deyildi. Bu vəsiyyətlər dünyanın sonunadək bütün bəşərə aid idi. Əxlaqi və əməli fəlsəfəyə aid göstərişlər silsiləsindən bə’zilərinə nəzər salırıq:

Sözümün əvvəli Allahın yeganəliyinə şəhadətdir. Sonra Məhəmməd ibn Abdullahın (s) Peyğəmbərliyinə şəhadət verirəm. O, mənim əmimoğlum, Allahın bəndəsi və seçilmişidir. Onun be’səti Allah tərəfindəndir, göstərişləri Allahın göstərişləridir. Xalq cəhalət və nadanlıq içində olduğu vaxt həzrət onları doğru yola, qurtuluş yoluna hidayət buyurdu: «Onların əməllərinin qiyamət günündəki cəzaları ilə qorxutdu.

Ey mənim övladlarım, sizi təqva və pəhrizkarlığa də’vət edirəm. Tövsiyə edirəm ki, çətinliklər qarşısında səbirli və dözümlü olasız. Dünyaya bağlanmayın. Əlinizdən çıxan şey üçün üzülməyin. Sizi birliyə çağırıram. Nifaq və pərakəndəlikdən həzər qılın. Haqq və həqiqəti me’yar götürün. İstər qəzəbləndikdə, istər qəmli vaxtınızda, istərsə də şadlandığınız vaxt sabit ədalət qanunlarına tabe olun.

Ey mənim övladlarım, heç vaxt Allahı unutmayın. Daim onun razılığı haqqında düşünün. Məzlumlarla ədalətli rəftarınızla, yetimlərə və çarəsizlərə isar və ətanızla Allahı razı salın. Həzrət Peyğəmbərdən belə buyurduğunu eşitdim: «Behişt yetimlərə öz övladları kimi himayədarlıq edənlərin iştiyaqındadır. Cəhənnəm odu yetimlərin malını yeyənlərin intizarındadır».

Qohum-əqrəbanızla münasibətdə sileye-rəhm və yaxşılıq edin. Dərvişlərə və möhtaclara əl tutub, xəstələri yoxlayın. Çünki dünya hadisələr məhəllidir. Ona görə də arzu-istəklərə giriftar olmayın. Daim ölüm və axirət aləmi haqqında düşünün. Lütfünüzü qonşulardan əsirgəməyin. Çünki qonşunun haqqının qorunması Peyğəmbərin (s) vəsiyyətlərindəndir. Dini göstərişləri möhtərəm sayın. Onlara həvəslə əməl edin. Namaz və

zəkatı, əmr be mə’ruf və nəhy əz münkəri yerinə yetirin. Allahın əmrlərinə itaət etməklə Allahın razılığını qazanın.

Ey mənim övladlarım, alçaq insanlarla ünsiyyətdən çəkinin. Saleh və təqvalı insanlarla yoldaş olun. Əgər həyatınızda elə bir işlə rastlaşsanız ki, dünya və ya axirəti seçməli olasınız, dünyadan keçin və axirəti qəbul edin. Dövrün çətinlikləri zamanı Allaha pənah aparın. Hər bir işdə Ondan kömək istəyin. Xalqla mehribanlıqla, xoş üzlə rəftar edin. Təqva və insana xidməti özünüzə şüar qərar verin. Körpələrə nəvaziş, yaxşılara ehtiram göstərin».

Həzrətin övladları sakitcə oturmuşdular. Boğazlarını qəhər tutmuşdu. Həzrətin ürəyəyatan, könül oxşayan sözlərini dinləyirdilər. Həzrətin vəsiyyətinin bu hissəsi bir əxlaq dərsi idi. Bu dərslərə əməl edən hər bir kəs kamal həddinə çatar. Həzrət vəsiyyətinin bu hissəsini «La hövlə və la quvvətə illa-billahil-əliyyil-əzim» cümləsi ilə başa çatdırdı. Sonra huşunu itirdi. Bir an sonra gözlərini açıb buyurdu: «Ey Həsən, sənə də bir neçə sözüm var. Bu mənim ömrümün son gecəsidir. Canımı tapşırdıqdan sonra mənə öz əlinlə qüsl ver, kəfənə bük, dəfn işlərimə özün bax. Cənazə namazımı qıl və məni gecənin qaranlığında Kufə şəhərindən kənarda, adsız bir yerdə torpağa tapşır və kimsə bundan xəbər tutmasın».

Bütün haşimilər, eləcə də ələvi ailəsi səsini çıxarmadan ağlayırdı. Onların göz yaşları yanaqlarına süzülürdü. Həsən atasına hamıdan yaxında oturmuşdu. O qədər qəmli idi ki, imamın diqqətini özünə cəlb etdi və imam buyurdu: «Ey oğlum, səbirli və dözümlü ol. Bu həssas məqamda sənə və qardaşına səbirli və dözümlü olmağı tövsiyə edirəm».

Sonra buyurdu: «Məhəmməddən də muğayət olun. O da sizin qardaşınızdır, atanızın oğludur. Mən onu sevirəm».

Həzrət yenidən huşunu itirdi. Bir an sonra azca tərpəndi və Hüseynə buyurdu: «Oğlum, sənin də həyatının bir macərası olacaq. Səbirli və dözümlü ol. Həqiqətən də, Allah səbir edənləri dost tutur».

Bu məqamda həzrət canvermə vəziyyətinə gəldi. Azca sonra mübarək gözlərini yavaşca yumdu və son nəfəsində buyurdu: «Əşhədu ənla ilahə illəllah, vəhdəhu la

.«əbduhu və rəsuluh

Şəhadət kəlmələrini dedikdən sonra həzrətin aralı və nazənin dodaqları qapandı. Onun ruhu fələklərə pərvaz etdi. Beləcə, bütün ömrü boyu haqq və həqiqətdən savay (məqsədi olmamış bir insanın həyatı başa çatdı.(١)

Həzrət Əli (ə) şəhadətə çatdığı vaxt onun altmış üç yaşı vardı. Artıq o otuz il idi ki, imamət məqamında idi. Həzrət beş ilə yaxın xilafət kürsüsündə oturdu. İmam vəfat etdikdə həzrət Həsən həzrət Hüseynlə birlikdə atasının cənazəsini dəfnə hazırlayıb Kufə yaxınlığındakı Qəriy adlanan məhəldə (bugünkü Nəcəf) dəfn etdi. Belə bir qorxu vardı ki, həzrətin qatı düşməni olan bəni-Üməyyə və xəvaric onun cəsədini qəbirdən çıxardıb təhqir edə. Ona görə də həzrət özü vəsiyyət etmişdi ki, diqqəti çəkməmək üçün onun qəbrini yerlə bərabər səviyyədə etsinlər. Həzrətin qəbri imam Sadiqin (ə) dövrünədək məxfi qaldı. Yalnız ikinci abbasi xəlifəsi imam Sadiqi Mədinədən İraqa çağırarkən həzrət Kufəyə gəlib atasının qəbrini ziyarət etdikdə bu qəbrin yeri mə’lum .oldu

Həzrət Əlinin (ə) qəbrinin müəyyənləşməsi haqqında Şeyx Müfid də bir rəvayət nəql etmişdir. Onun dediyinə görə, Abdullah ibn Hazim belə nəql etmişdir: «Bir gün Harun ər-Rəşidlə birlikdə ov üçün Kufədən çıxmışdıq. Kufə ətrafında rastlaşdığımız ahuları ovlamaq üçün ov itlərini buraxdıq. İtlər bir saata yaxın ahuların ardınca qaçdılar. Amma heç bir nəticə hasil olmadı. Ahular həmin ərazidəki təpəyə çıxıb orada dayandılar. İtlər təpəyə çıxmış ahuları tə’qib etməyib geri döndülər. Harun bu məsələyə təəccüb etdi. Ahular təpədən düşən kimi itlər onların üstünə cumur, ahular təpəyə qalxanda itlər geri qayıdırdılar. Bu hadisə üç dəfə təkrarlandı. Harun dedi: «Gedin bu ərazidə kimi tapsanız yanıma gətirin». Biz getdik və bəni-Əsəd qəbiləsindən olan qoca bir kişi tapdıq. Onu Harunun yanına gətirdik. Harun dedi: «Ey Şeyx, bizə bu təpə haqqında danış». Kişi dedi: «Əgər aman versəniz sizə bu barədə danışaram». Harun dedi: «Mən Allah qarşısında əhd edirəm ki, sənə heç bir əziyyət verməyəcəyəm». Şeyx

dedi: «Atam öz babalarının dilindən belə nəql edirdi ki, Əli ibn Əbu-Talibin qəbri bu təpədə yerləşir. Allah-təala bu təpəni əmin-amanlıqda qərar vermişdir. Kim o təpəyə sığınarsa, amanda qalar».

Harun bunu eşidib atdan düşdü. Su istədi. Ona su gətirdilər. Harun dəstəmaz aldı. Təpənin yanında namaz qıldı. Üzünü torpağa sürtüb ağladı və Kufəyə qayıtdı.(۱)

Həzrət Əlinin (ə) qəbri haqqında başqa bir maraqlı əhvalat da nəql olunmuşdur: «Osmanlı sultanı olan Süleyman Kərbəlaya gəldiyi vaxt həzrət Əlini (ə) ziyarət edirdi. O Nəcəfdə həzrətin qəbri yaxınlığında atdan düşdü və niyyət etdi ki, həzrətə ehtiram əlaməti olaraq onun qəbrinədək piyada gedəcək.

Həmin vaxt müfti olan qazi Əsgər sultanı müşayiət edirdi. Sultanın ziyarətindən xəbər tutub qəzəbli halda onun yanına gəldi və dedi: «Sən diri sultansan, Əli (ə) isə ölü sultan. Sən nə üçün onun ziyarətinə piyada gedirsən?» Bu qazi həzrətə qarşı düşmən mövqedə duran nasibi idi. Qazi öz fikrini sübuta yetirmək üçün sultana dedi: «Əgər bu işin sənin sultanlıq şə’ninə əskiklik gətirəcəyinə şübhən varsa, Qur’anı aç həqiqətdən xəbər tut». Sultan onunla razılaşıb, Qur’anı əlinə götürdü və doğru yolda olub-olmadığını bilmək üçün ilahi kitaba müraciət etdi. Sultanın açdığı səhifə bu ayə ilə başlayırdı: «Mən, həqiqətən, sənin Rəbbinəm, nə’ləynini (ayaqqabını) çıxar ki, müqəddəs Tuva vadisindəsən». (۲) Sultan üzünü qaziyə tutub dedi: «Sənin məsləhətinlə ayaqqabılarımı da çıxarmalı olacağam». Sonra sultan ayaqqabılarını çıxarıb, ayaqyalın həzrətin qəbrinə üz tutdu. Onun ayaqları yaralanmışdı. Ziyarətini başa vurduqdan sonra inadkar qazi onun yanına gəlib dedi: «Bu şəhərdə rafizilik əqidəsini yayanlardan birinin qəbri var. Yaxşı olar ki, o qəbiri açıb oradakı cəsədin sümüklərini yandırmağı əmr edəsən». Sultan dedi: «O alimin adı nədir?» Qazi dedi: «Onun adı Məhəmməd ibn Həsən Tusidir». Sultan dedi: «Bu şəxs ölmüşdür. Allah onun layiq olduğu savabı və cəzanı özü verər». Qazi isə inadından əl çəkməyib mərhum



---

۱- [۹۱] «Иршад» ۱-чи чилд, ۱-чи баб, ۶-чы фәсл, ۴-чү һәдис.

۲- [۹۲] «Taha» сурәси, ajә ۱۲.

Şeyx Tusinin qəbrinin açılmasını tələb edirdi. Nəhayət, sultan göstəriş verdi ki, Nəcəf kənarında böyük bir tonqal qalasınlar. Amma onun məqsədi qəbirdəki cəsədi yox, qazinin özünü yandırmaq idi. Beləcə, həmin məl'un cəhənnəm odundan qabaq dünya .odunda yandı

Muntəxəbut-Təvarix» kitabının müəllifi nəql edir ki, Nadir şah həzrət Əlinin (ə) qəbrinin» üzərindəki günbəzi zinətləndirərkən ondan qübbəyə nə yazılması barədə soruşurlar. Nadir dərhal deyir: «Allahın əli bütün əllərin fövqündədir». Səhəri gün Nadir şahın vəziri Mirza Mehdi xan deyir: «Nadir savadsızdır, bu kəlam ona ilham olunub. Əgər inanmırsınızsa, yanına gedib, yenidən bu barədə soruşun». Bu məqsədlə yenidən «!Nadirə müraciət edirlər. O belə cavab verir: «Dünən dediyim sözü

Həsən və Hüseyn, eləcə də yaxın adamları həzrət Əlini (ə) dəfn etdikdən sonra Kufəyə qayıtdılar. Həzrətin qatili İbn-Mülcəm də həmin gün, yə'ni ramazan ayının iyirmi birinci günü imam Həsənin qılıncı ilə cəhənnəmə vasil oldu. Uyğun mövzuda dövrün ustad şairləri bir çox əsərlər yaratmışlar. Əsvəq Nəxəinin qızı Ümmü-Heysəmin yazdığı :şe'rdən bir neçə misranı nəzərdən keçirək

,Ey gözlər, vay olsun bu halınıza

.Bu qəmli gecədə dönmüsüz buza

,Ən üstün insanı vermişik əldən

. . .Üzür könülləri ağrılı dərd qəm

Həzrət Əlinin (ə) vəsiyyət etdiyi kimi, ondan sonra imamət və xilafət məqamı oğlu Həsənə çatdı. Abdullah ibn Abbas məscidə gəldi və xalqa müraciət edərək dedi: «Əlbəttə, bilirsiniz ki, Həzrət Əli (ə) öz oğlu Həsəni sizin üçün xəlifə tə'yin etmişdir. Amma o sizdən bey'ət almaq üçün israrlı deyil. Əgər bey'ət etmək fikriniz olsa, mən .«ona deyərəm, məscidə gələr. Yox əgər bey'ət etmək istəmirsinizsə, özünüz bilərsiniz

Xalq ümumi şəkildə müsbət cavab verdi. İbn-Abbas həzrəti məscidə gətirdi. İmam Həsən (ə) minbərə çıxdı, Allaha həmd-səna etdikdən sonra Peyğəmbərə (s) salam göndərdi və belə buyurdu: «Bu gecə dünyadan elə bir

insan köçüb ki, xeyir işdə kimsə onu qabaqlamayıb. Gələcəkdəkilər də əməl baxımından ona çatası deyillər. Bu şəxs həzrət Peyğəmbərlə (s) çiyin-çiyinə döyüşlərdə vuruşmuş, öz canını həzrətə (s) sipər etmişdir. Həzrət Peyğəmbər (s) bayrağı onun əlinə vermiş və din düşmənləri ilə savaş üçün Cəbrəil və Mikail sağında və solunda olmaqla onu göndərmişdir. O, döyüşlərdən yalnız qələbə ilə dönmüşdür. Allah ona daim fatehlik nəsib etmişdir. O, İsa ibn Məryəmin səmaya qalxdığı gecədə şəhadətə çatmışdır. Həzrət Musanın canişini Yuşə ibn Nun da həmin gecə dünyasını dəyişmişdir. Bu şəxs dünyasını dəyişərkən dünya malından cəmi yeddi yüz dirhəmi olmuşdur. O bu pulla öz ailəsinə xidmətçi tutmaq istyirdi. (İmam bu sözləri deyərkən boğazını qəhər tutdu, ağlamağa başladı)». İmam Həsən (ə) atasının xatirəsinə söylədiyi bu xütbədə həzrət Əlinin (ə) məqamını cəmiyyətə anlatdı. Onun dediyi sözlər bir oğulun atası haqqında öz söylədiyi tə’rif deyildi. İmam Həsən (ə) hamıdan yaxşı .tanıdığı imamı vəsf edirdi

İmam Həsən (ə) xalqdan bey’ət aldıqdan sonra Müaviyəyə məktub yazıb onu da bey’ətə də’vət etdi. Aydın məsələdir ki, Müaviyə imamın də’vətini qəbul etmədi. Müaviyə hələ də zəif mövqeyə malik olduğu bir zamanda həzrət Əliyə (ə) bey’ət etməkdən çəkindi. İndi isə onun hakimiyyəti möhkəmlənmişdi. Zəif vaxtında bey’ət etməyən bir şəxs güclü vaxtında bey’ət edərdimi?! Bir sözlə imam Həsənin məktubunu alan Müaviyə məktubun cavabında ona bildirdi ki, özünü xəlifəliyə daha layiqli sayır və .imam ona bey’ət etməlidir

Digər bir tərəfdən, həzrət Əlinin (ə) öz şəhadətindən qabaq Nuxəylə düşərgəsində təchiz etdiyi qoşunun böyük bir hissəsi dağılmışdı. İmam Həsən (ə) atasının dövründə Kufə əhlinin vəfasızlıq və laqeydliyini görsə də və belə bir şəraitdə Müaviyə ilə döyüşün səmərə verməyəcəyini bilsə də, azsaylı (İbn Əbil-Hədidin nəqlinə görə on altı min nəfərlik) qoşunu ilə Şam yoluna üz tutdu. İmam qoşunun on iki min nəfərini Übeydullah ibn Abbasın komandanlığı altında Müaviyənin üstünə göndərib, özü Mədaində mövqe tutdu ki, ətrafdan qoşun toplasın. Amma Müaviyə bir milyon dirhəm verib Übeydullah .ibn Abbası özünə tərəf çəkdi

Übeydullah qızıl sikkələrin çingiltisinə uyaraq imam Həsəndən (ə) üz döndərdi və gecə yarı kiçik bir qrupla məxfi şəkildə qaçıb Müaviyəyə qoşuldu. Mədaində isə başqa bir hadisə baş verdi. Bu hadisə nəticəsində qoşunda təfriqə və ixtilaf yarandı və döyüş üçün heç bir münasib şərait qalmadı. İmam Həsən (ə) mövcud vəziyyəti, İslamın və müsəlmanların məsləhətini nəzərə alaraq qoşunu buraxmağa məcbur oldu. Mövcud .şəraitdə başqa bir yol görmədiyindən həzrət imam (ə) Müaviyə ilə sülh bağladı

## DÖRDÜNCÜ hİSSƏ.ƏLİNİN (Ə) ŞƏXSİYYƏTİ VƏ ƏXLAQİ FƏZİLƏTLƏRİ

### ŞƏXSİYYƏT MƏFHUMU

Fəlsəfi baxımdan hər bir insanın şəxsiyyətini onun ruhani xüsusiyyətlər məcmusu təşkil edir. Xalq arasında isə insanın şəxsiyyəti onun hansısa səciyyəvi xüsusiyyətləri ilə tə'yin olunur. Məsələn, siyasi bacarığa malik olan adama siyasi şəxsiyyət, həyatını elmə sərf edən insana elmi şəxsiyyət deyirlər. Psixologiyada sübut olunmuşdur ki, insanın ruhani və fiziki keyfiyyətləri arasında əlaqə mövcuddur. Hər hansı bir fərdin şəxsiyyətini kamil şəkildə tanımaq üçün onun ruhani və cismani xüsusiyyətlərini .araşdırmaq zəruridir

İnsanın fiziki və ruhani keyfiyyətləri ilə tanış olmaq üçün təbiət elmlərindəki müşahidə və təcrübə üsulundan istifadə edilir. Çünki insanın ruhunun və ruhani keyfiyyətlərinin mahiyyətini tanımaq qeyri-mümkündür. Bu həqiqətlər haqqında yalnız onların əsərləri .vasitəsi ilə mə'lumat əldə etmək olur

Digər maraqlı nöqtə odur ki, insan özündə olan xüsusiyyətləri başqalarında da asanlıqla müəyyənləşdirir. Dişi ağrıyan adam başqalarının dişağrısını daha dəqiq .qiymətləndirə bilir

Digər bir tərəfdən hər bir insanın ruhunun keyfiyyətləri onun varlıq tamında bir hissədir. Psixologiyada bu tamlıq vəhdət adlandırılır. İnsan şəxsiyyətini göstərən bu .anlayış bəşər tarixi boyu hifz olunmuşdur

Deyilənləri nəzərə alsaq, həzrət Əlinin (ə) cismani və ruhani keyfiyyətləri ilə tanışlıqda mühüm bir çətinliklə rastlaşırıq. Çünki həzrətin böyük ruhunda olan bir çox .xüsusiyyətlər bizim üçün məchuldur

Həzrət Əli (ə) insan idi. Amma onun xüsusiyyətləri kimsədə görünməmişdi. Həzrət başqalarına oxşamadığından ətrafdakıların onu düzgün dəyərləndirməsi də problemə çevrilir. Həzrətin e'cazla dolu varlığı bütün keçmişdəkiləri heyran qoymuş və .gələcəkdəkiləri də heyran qoyasıdır

Onun bütün əməlləri qeyri-adi olmuşdur. Güclü adam, adətən başqalarının müxalifətinə dözmür. Çünki səbir qüdrətlilikdən çox, acizliyə yaxın olan haldır. Amma həzrət Əli (ə) qeyri-adi gücə malik olmaqla yanaşı, qeyri-adi səbrə də malik idi. Bunu .mö'cüzədən başqa bir şey adlandırmaq olmaz

Adətən, xoş rəftarlı insanlar savaş meydanında kara gəlmirlər. Amma həzrət Əli (ə) istisna təşkil edirdi. Ərəb qəhrəmanlarına diz çökdürən bu cəngavər həm də bir uşaq .kimi həlim idi

Seyyid Rəzi «Nəhcül-bəlağə»nin müqəddiməsində deyir: «Həzrəti tanımadan onun kəlamlarını oxuyub düşünən insan elə təsəvvür edər ki, bu sözləri xanənişin bir adam demişdir. Axı mə'nəviyyat dolu bu kəlamların sahibinin qılıncından qan damdığını kim .təsəvvür edə bilər?! Bəli, həzrət təzadlı xüsusiyyətlərin toplandığı e'cazkar bir insan idi

İbn Əbil-Hədid Nəhcül-bəlağənin şərhində yazır: «Biz şücaətli, eyni zamanda bağışlayan insan görməmişik. Təlhə və Zübeyr, Abdullah ibn Zübeyr və Əbdül-Məlik ibn Mərvan şücaətli insanlar idilər. Amma onların şücaəti paxıllıqlarının və .«hərisliklərinin kölgəsində qalırdı

Hamıya mə'lumdur ki, təvazökar insanlar heybətli olmur. Həzrət Əli (ə) misilsiz təvazöyə malik idi. O yalın torpaq üstündə oturduğundan Əbu-Turab (torpaq atası) ləqəbini almışdı. Amma bu sadə insanın savaş meydanındakı heybəti ərəb qəhrəmanlarının bədəninə titrətmə salırdı. Bir gün Müaviyə Qeys ibn Sə'də dedi: «Allah Əbül-Həsənə (Əliyə) rəhmət etsin, çox zarafatcıl adam idi». Qeys ona belə cavab verdi: «And olsun Allaha, o nə qədər xoşrəftar idisə də, heybəti hamıdan artıq idi. Onun .«heybəti təqvadan doğurdu və sənin Şam əhli qarşısındakı heybətindən deyildi

Bu da aydındır ki, müəyyən ixtisas sahibi həmin ixtisasda ümumi mə'lumata malik olan adamdan üstündür. Məsələn, ürək həkimi ürəklə bağlı xəstəliklərdə can həkimindən daha çox mə'lumatlıdır. Bir sözlə, peşəkar şəxs mütəxəssisdən üstündür. Bir şe'rdə :deyildiyi kimi

İxtisas sahibi olsan da bil sən

Həzrət Əli (ə) bütün kamal sifətlərinə malik olmaqla yanaşı, istənilən bir kamal sifətinin ən üstün dərəcəsinə sahib idi. Hər hansı bir fəzilətdə onunla müqayisəyə gələcək insan .yox idi

Adətən, insan kolorili qidalar yedikdə güclü olur. Əgər insanın qidadan aldığı enerji onun işə sərf etdiyi enerjidən az olarsa, orqanizm zəifləməyə başlayar. Həzrət Əlinin (ə) yediyi arpa çörəyi idi və hər süfrəyə oturanda üç tikədən artıq yeməzdi. Amma həzrətin güclü bilәkləri Xeybər qapısını yerindən oynatdı. Mərhəb onun bir zərbəsi ilə canını tapşırdı. Bu barədə həzrət özü belə buyurur: «Kim mənim süfrəmdə arpa çörəyini gördüsə, təəccüb etdi ki, bu qida ilə düşmən qoşununa necə hücum edib onun .«sıralarını yarıram

Savaş adamları, adətən, bir o qədər də mərhəmətli olmurlar. Onların qəlbi qan tökdükcə bərkiyir. Amma ərəb cəngavərlərini diz üstə çökürən həzrət Əli (ə) yoxsulları və ehtiyaclıları gördükdə mum tək yumşalır, yetim körpələrlə rastlaşdıqda ağlayırdı. :Bir şe’rdə həzrətin bu halı belə vəsf olunur

,Savaşa girəndə aslandı, şirdi

.Bir yetim görəndə ona əsirdi

Ona görə də həzrəti, «təəccüblər təəccübü» adlandır-mışdılar. Həzrətin vücudu təzadlı xüsusiyyətlər məcmusu idi. Çünki məntiq baxımından ziddiyyətlərin ictiması qeyri-.mümkündür

Təbiətşünaslar, psixoloqlar və alimlər sübut etmişlər ki, insan beyni fikir və düşüncələr mərkəzidir. Onun bir nöqtəsi zədələnərsə, insanın düşüncəsində və yaddaşında problemlər yaranar. Hansı ki, İbn-Mülcəm öz zəhərli qılıncı ilə həzrəti başından yaraladıqdan sonra o çox dəyərli vəsiyyətlərini buyurur. Həzrətin başıyarılı vəziyyətdə söylədiyi sözlər onun adi vaxtlardakı danışığından fərqlənmir. Həzrət yaranın ağırlığından bə’zən huşunu itirsə də, ayılan tək sözünün ardını buyurmağa başlayır. Onun danışığında zərrəcə rabitəsizlik, dolaşaqlıq sezilmir. Söhbətimizin

müqəddiməsində qeyd etdiyimiz kimi həzrət Əlinin (ə) şəxsiyyətinin vəsfi kimsənin gücündə deyil. Onun əməl və rəftarlarını bizim ölçümüzlə dəyərləndirmək mümkünsüzdür. Bəli, Mövləvinin tə'birincə, pakların işini özümüzlə müqayisə etməli deyilik. Sadəcə, həzrətin böyük şəxsiyyətinin fəzilətlərini dərk etməkdə aciz .olduğumuzu e'tiraf etməliyik

Əmirəl-mö'minin Əlinin (ə) şəxsiyyətini vəsf etməkdə dil və qələm acizdir. Növbəti söhbətlərimizdə bu şəxsiyyət haqqında danışmaqda məqsədimiz həzrətin şəxsiyyətinin mahiyyətini açıqlamaq yox, zehinlərimizi cilalamaqdır. Çünki həzrət bütün keyfiyyətlərinə görə Peyğəmbərin varisi idi. Xəyal quşu onun fəzilət səmasında qanad çalmaqda acizdir, bu nəhayətsiz okeanda üzmək iste'dadından məhrumuq. Həzrət Peyğəmbər (s) Əliyə (ə) belə buyurur: «Məndən və səndən başqa kimsə Allahı layiq olduğu kimi tanımadı. Səni də məndən və Allahdan savay lazımınca tanıyan (olmadı».(١)

Nizam adlı məşhur filosof uyğun mövzu ilə bağlı deyir: «Əmirəl-mö'minin haqqında danışmaq çətindir. Əgər onun haqq və məqamına uyğun tə'rif demək istəsək, həddi aşarıq. Əgər naqis danışsaq, kafir olarıq. Amma lətif və dəqiq bir orta hal var. Bu halın .«idrakı Allahın tövfiqindən asılıdır

## ƏLİNİN (Ə) İMAN VƏ İBADƏTİ

İbadət Allaha tə'zim və Ondan qeyrilərinə göz yummaqdır. Ruh üçün ən böyük fəzilət Allaha sitayiş və Onunla yaxınlığa sə'ydir. İbadət zəruri şərtlər ödənməklə yerinə yetirilərsə, olduqca böyük məqam və iftixar əldə edilər. Həzrət Peyğəmbər (s) bir bəndə olaraq vəsf edilir və onun peyğəmbərliyindən qabaq bəndəliyi nəzərə çatdırılır: .««Əşhədu ənnə Muhəmmədən əbduhu və rəsuluh

Kamal mərtəbələrinə səfər üçün ən üstün vasitə nəfsin paklanması və tərbiyəsidir. Bu isə yalnız həqiqi ibadətlə gerçəkləşir. İbadət təkcə ilahi məs'uliyyətdən qurtarmaq deyil. İbadət vasitəsi ilə ağıl yetkinləşir, insan vücudundakı qüvvələr tarazlanır. İbadət insan ruhunu maddi bulaşıqlıqlardan

təmizləyir. Riyasız yerinə yetirilən ibadət ən üstün ibadət sayılır. İbadət sırf Allaha görə olduqda insanda təqva sifəti yaranır. Bu şərtlər yerinə yetirilmədən icra olunan ibadət .qəbul dərəcəsinə çatmır

Təqva maddi və fani dünyadan uzaqlaşmaq, ruhani və əbədi aləmə üz tutmaqdır. Təqva ilə zinətlənmiş iman həqiqi imandır. Xaliscəsinə, riyasız yerinə yetirilən ibadət .insanı yəqin mərtəbəsinə çatdırır

Yuxarıda deyilənləri nəzərə alsaq, əmin olarıq ki, həzrət Əli (ə) iman, təqva, zöhd, ibadət və yəqin baxımından misilsiz olmuşdur. Həzrət Peyğəmbər buyurur: «Əgər tərəzinin bir gözünə səmalar və yer, o biri gözünə Əlinin (ə) imanı qoyularsa, şübhəsiz .«ki, onun imanı ağır gələr

Həzrət Əli (ə) Allaha eşq və məhəbbətlə ibadət edirdi. O, vəzifəni öhdəsindən götürmək üçün yox, həqiqi məhbubunu layiq bildiyi üçün ibadət edirdi. Həzrət ibadət .edərkən öz mə’budunun dilrüba camalından başqa bir şey haqqında düşünmürdü

Həzrət Əli (ə) təqva və ibadətdə o qədər çalışqan idi ki, həzrət Peyğəmbər onun tündlüyündən gileylənənlərə belə buyurmuşdu: «Əlini (ə) məzəmmət etməyin. Çünki o, .«Allah aşiqidir

Həzrət Əli (ə) münacat edərkən qulağı eşitməz, gözü görməzdi. O, dünyanı unudar, bütün diqqətini həqiqi mə’buda yönəldərdi. Məşhur bir rəvayətə görə döyüşlərdən birində həzrətin ayağına batmış oxu namaz qıldığı vaxt ayağından çıxarırlar və həzrət .bundan xəbər tutmur

Həzrət Əli (ə) dəstəmaz alarkən təpədən dırnağadək əsərdi. Mehrabda namaza durduğu vaxt bədənini titrətmə bürüyər, Allahın əzəməti qorxusundan gözlərindən yaş süzülərdi. Həzrətin səcdələri uzun idi. Onun səcdəgahı daim göz yaşlarında nəm :olardı. Şair bu barədə deyib

,Namazda gözündən axırdısa yaş

.Çöhrəsi gülərdi qopanda savaş

Həzrət Peyğəmbərin (s) səhabələrindən olan Əbu-Dərda belə deyir: «Qaranlıq bir gecədə xurma bağından keçirdim. Allahla münacat edən bir şəxsin səsini eşitdim. Yaxınlaşdıqda gördüm ki, bu Əlidir (ə). Ağacın səh:١٥٢

arxasında gizləndim. O qorxu və həyəcan içində həzin bir səslə minacat edirdi. Cəhənnəm odundan Allaha pənah aparıb, bağışlanma diləyirdi. Həzrət o qədər ağladı ki, hiss və hərəkətdən düşdü. Düşündüm ki, bəlkə yatıb. Yaxına getdim, onu quru ağac kimi gördüm. Tərpətmək istədim, amma tərpənmədi. Düşündüm ki, yəqin dünyasını dəyişib. Tələsik onun evinə qaçıb, ölüm xəbərini verdim. Həzrət Zəhra (s) soruşdu ki, onu nə vəziyyətdə görmüşəm? Mən gördüyümü danışdım. Həzrət Fatimə (s) buyurdu: «O ölməyib, Allah qorxusundan qəşş edib».(١)

Həzrət Əli (ə) vacib namazlardan əlavə nafilə namazları da qılırdı. Heç vaxt gecə namazını tərk etmirdi. Hətta savaş zamanı da bu ibadəti yerinə yetirirdi. Ləylətul-həriridə sübhə yaxın həzrət üfüqə baxarkən İbn-Abbas soruşdu: «Məgər o tərəfdən nigarançılığın var? Yoxsa orada düşmənlərin pusqu qurub?» Həzrət buyurdu: «Yox, bilmək istəyirəm ki, namazın vaxtı çatıb, yoxsa yox».

Çoxlu ibadət etdiyinə və uzun səcdələr yerinə yetirdiyinə görə «Səccad» ləqəbi almış imam Zeynalabidin (ə) həzrət Əlinin (ə) haqqında belə buyurur: «Babam Əli (ə) kimi ibadət edə bilən kimdir?!»

İbn-Əbil Hədid bu məsələni başqa bir şəkildə bəyan etmiş və yazmışdır: «İbadətə olduqca ciddi yanaşan Zeynəl-Abidindən soruşdular ki, babanın ibadəti ilə müqayisədə öz ibadətini necə görürsən?» Həzrət buyurdu: «Babamın ibadətinə nisbətdə mənim ibadətim Peyğəmbərin ibadətinə münasibətdə babamın ibadəti kimidir».(٢)

Həzrətin kənizi Ümmü-Səiddən soruşurlar ki, həzrət Əli (ə) Ramazan ayında çox ibadət edir, yoxsa başqa aylarda? Kəniz deyir: «Həzrət Əli (ə) hər gecə öz Allahı ilə raz-niyazdadır. Onun üçün ramazan ayı ilə başqa aylarda fərq yoxdur».

Həzrət (ə) zərbə aldıqdan sonra məsciddən evə gətirilərkən qızarmaqda olan üfüqə baxıb buyurur: «Ey sübh, şahid ol ki, Əlini (ə) yalnız indi uzanmış vəziyyətdə görürsən».



---

١- [٩٤] «Əмали» ١٨-чи мәчлис, ٩-чу һәдис.

٢- [٩٥] «Насехут-Тәварих» ٧-чи чилд, сәһ. ٩٨.

İbn Əbil-Hədid deyir: «Həzrət Əli (ə) hamıdan çox ibadət edirdi. Əksər günlər oruc idi, bütün gecələri namaza məşğul olurdu. Savaş zamanı da namazı tərk etməzdi. O bildiyinə əməl edən alim idi. Xalqa nafilə namazları, dualar, gecə ibadətləri öyrədirdi».

Həzrət Əli (ə) namaz zamanı Allah qarşısında pak qəlb, tam diqqətlə dayanırdı. Onun ibadət-itaəti başqalarınınkı kimi deyildi. Əgər başqaları hansısa bir xüsusi məqsədlə ibadət edirsə, həzrətin məqsədi bambaşqa idi. O özü bu barədə belə buyurur: «Bə’ziləri Allaha rəğbətlə (behişt ne’mətləri üçün) bəndəlik edirlər. Bu növ ibadət tacirlərin ibadətidir. Başqa bir dəstə isə Allaha (cəhənnəm odundan) qorxudan ibadət edirlər. Bu qulların ibadətidir. Üçüncü qrup isə Allaha təşəkkür üçün ibadət edir. Bu azadələrin ibadətidir». Həzrət (ə) Allah dərgahına belə ərz edir: «Pərvərdigara, mən sənə nə behişt tamahından, nə də cəhənnəm qorxusundan ibadət edirəm. Əksinə, səni pərəstişə layiq bildiyim üçün ibadət edirəm».

Hər bir fərd fitri olaraq zərərləri özündən uzaqlaşdırmaq, xeyir əldə etmək məqsədində olur. Yalnız həzrət Əli (ə) behişt təmənnası və cəhənnəm qorxusu olmadan, sırf Allah üçün ibadət edirdi. Belə bir xalislik həzrətin yəqinliyindən qaynaqlanırdı. Hər şeydən uca bir yəqin! Çünki həzrət yəqinliyin ən son mərhələsinə çatmışdı. O özü belə buyurur: «Əgər pərdələr qaldırılsa, mənim yəqinliyimə bir şey əlavə olunmaz».

Həzrət Əli (ə) bir dalğa tək həqiqət okeanında qərq olmuşdu. Onun bütün düşüncələri, hərəkətləri həqiqətə bağlılığından danışırdı. Həzrət nəfsin paklanması və tərbiyəsi baxımından misilsiz idi. O nəyə baxırdısa, Allahı görürdü. Həzrət buyurur: «Nəyi gördümsə, ondan qabaq, onunla bir vaxtda və ondan sonra Allahı gördüm». Başqa bir rəvayətdə isə belə nəql olunur: «Görmədiyim Allaha ibadət etmədim». Həzrətdən soruşurlar ki, o, Allahı necə görür? Həzrət buyurur: «Zahiri gözlə yox, bəsirət gözü ilə».

Zahir gözlər ilə görünməyən şey

Könül gözləri ilə ediləsi seyr.

Həzrət Əli (ə) Allahın əzəməti qarşısında təvazönü özünə borc bilirdi. Onun dua və .minacatlarında təvazö səviyyəsi aşkar görünür

Həzrətin öz səhabəsi Kumeyl ibn Ziyada öyrətdiyi dua (Kumeyl duası) onun uca ruhunun şah əsərlərindəndir. Həzrətin güclü imanı və sabit yəqinliyi bu duanın cümlələrinə hopmuşdur. Bə'zən o duanın gedişində Allahın mərhəmətindən ümid tapır, bə'zən isə onun qüdrəti qarşısında qorxuya düşür. Belə ki, onda xüşu halı ixtiyarsız olaraq hasil olur. Həzrətin ümid və qorxusundan, xalisliyindən danışan başqa dualar da .vardır

Bir gün Müaviyə Zərar ibn Zəmirə dedi: «Mənim üçün Əlini (ə) vəsf et». Zərar həzrət Əlinin (ə) xüsusiyyətlərini sadaladıqdan sonra dedi: «Gecələr daha çox oyaq qalırdı və az yatırdı. Gecə və gündüz vaxtları Qur'an tilavət edirdi. Canını Allah yolunda fəda edib, ilahi hüzurda göz yaşları axıdırdı. Özünü bizlərdən gizləmir, qızıl kisələri toplamır, yaxınlarına lütf göstərir, zalımlarla tünd rəftar edirdi. Gecə qaranlıq pərdəsinə büründüyü vaxt həzrət ibadət mehrabında Allahın əzəmət qorxusundan göz yaşları axıdır və deyirdi: «Ey dünya! Mənim üçün cilvələnib, məni özünə müştaqmı edirsən? Heç vaxt? Mənim sənə ehtiyacım yoxdur. Sənə üç dəfə təlaq vermişəm və bir daha üz tutmaram!» Bə'zi dualarında isə həzrət belə deyirdi: «Aman azuqənin azlığından, səfərin uzaqlığından və yolun çətinliyindən!» Zərarın bu sözlərindən sonra Müaviyə ağladı və dedi: «Ey Zərar, kifayətdir. And olsun Allaha ki, Əli (ə) dediyin kimi idi. Allah «!Əbül-Həsənə rəhmət etsin

Həzrət Əlinin (ə) ibadəti namaz, oruc, sair dini əməlləri yerinə yetirməklə başa çatmırdı. Onun bütün hərəkətləri və rəftarları ibadət idi. Ona görə də hədisdə buyurulmuşdur: «Həqiqətən də, əməllər niyyətlərdən asılıdır». Həzrət (ə) bütün hərəkətlərində Allahın razılığını düşündüyündən onun hər bir hərəkəti ibadət sayılırdı. .Bu da onun fəzilətlərinin əsas səbəblərindən idi

## ƏLİNİN ELM VƏ HİKMƏTİ

İnsanlar Peyğəmbər və imamların elminə müxtəlif cür münasibət bəsləyirlər. Bə'ziləri elə düşünürlər ki, Peyğəmbər və imamların elmi məhdud olmuşdur, onlar yalnız dini məsələlərdən mə'lumatlı olmuşlar və

qeybdən xəbərdarlıq yalnız Allaha aiddir. Onlar bu fikirlərinin təsdiqi üçün Qur’an ayəsi (də göstərirlər.(١

Bə’ziləri isə belə güman edirlər ki, onlar bütün qeybi və təbii elmlərdən xəbərdar olmuşlar. Sünnə əhlinin fikrincə, imamlar da sair rəhbərlər kimi olmuşlar və onların bilmədiyi şeylər var. Onların nəzərincə, rəhbər xalqın bildiyi bir şeyi bilməyə də bilər. Məsələn, Ömərin bir qadına verdiyi cavab misal göstərilir: «Sizin hamınız Ömərdən .«daha elmlisiniz, hətta pərdə arxasındakı qadınlar da

Bu mövzunun fəlsəfi baxımdan araşdırılması zehnin tanınması və insan mə’rifətinin dəyəri ilə bağlıdır. Elmin hansı predmetdən olması müəyyənləşməlidir. Elm gerçək bir inkişafdır və o iki qismə bölünür: zati və kəsbi (hüzuri və hüsuli). Zatı elm Allaha aiddir. Bu elmin mahiyyətini təsəvvür etmək bizim üçün əlçatmazdır. Kəsbi elm isə insanlara aiddir. Hər bir insan elmi başqalarından öyrənə bilər. Amma Peyğəmbər (s) və onun vəsilərinə aid olan bir elm də var. Bu elm «lədunni», ilham olunmuş elm adlanır. Bu elm kəsbi elm kimi təhsil yolu ilə əldə edilmir. O həm də Allahın elmi kimi zatı deyil. Bu elm Allah tərəfindən Peyğəmbərlərə və onların canişinlərinə ilham olunur. Bu adamlar Allahın izni ilə keçmişdə baş vermiş və gələcəkdə baş verəcək hadisələrdən xəbər tuturlar. Peyğəmbərlər və onların vəsiləri həmin lədunni elm vasitəsi ilə başqalarının suallarına cavab verirlər. Allah-təala həzrət Xızır haqqında buyurur: «Biz ona öz tərəfimizdən lədunni, qeybi bir elm öyrətdik». Həmin elmə sahib olan həzrət İsa öz qövmünə dedi: «Sizə yediyiniz və evlərinizdə ehtiyata saxladıqlarınız haqqında xəbər .«verərəm

Qur’anda yalnız Allaha aid edilən qeyb elmi zati elmdir. Amma peyğəmbərlərə əta olunmuş qeyblə bağlı biliklər lədunni elm sayılmalıdır. Bu elm vəhy və ilah yol ilə çatdırılır. Onlar da öz növbəsində Allahın iradəsi ilə qeybi işlərdən xəbər tuturlar. Allah-təala buyurur: «Allah qeybi bilənidr. O, peyğəmbərliyə seçdiyi kəsdən başqa bir nəfərə də qeybi



---

.Əн’ам» сурəси, аjə ۵۹» [۹۶] -١

aşkarlamaz».(۱) Ötən ayələrə nəzər saldıqda mə’lum olur ki, İslam Peyğəmbəri (s) Allah dərgahına hamıdan yaxın olmuşdur. Təbii ki, ona daha artıq elm əta edilmişdir. Həzrət (s) varlıq aləminin sirlərindən hamıdan çox xəbərdar edilmişdir. Söhbətimizin mövzusu Peyğəmbərin (s) həmin lədunni biliklərindən əxz etmiş həzrət Əli (ə) haqqındadır. Həzrət Peyğəmbər buyurmuşdur: «Mən elmin şəhəri, Əli (ə) isə onun qapısıdır».(۲) Bu barədə həzrət Əli (ə) özü belə buyurmuşdur: «Həzrət Peyğəmbər məni elmin min qapısı kimi yad etmişdir. Bu qapıların hər birindən min qapı açılır». Şeyx Süleyman Bəlxi «Yənabiul-Məvəddət» kitabında yazır ki, həzrət Əli (ə) belə buyurmuşdur: «Məndən qeybin sirləri haqqında soruşun. Mən peyğəmbərlərin və mürsəllərin varisiyəm». Eyni mənbədən nəql olunmuş başqa bir hədisdə həzrət Peyğəmbərin belə buyurduğu bildirilir: «Elm və hikmət on hissəyə bölünmüşdür. Onun doqquzu Əliyə (ə), biri isə qalan xalqa əta olunmuşdur. Həzrət Əli (ə) həmin bir hissə elmdə də başqalarından alimdir».

İbn-Abbasdan rəvayət olunmuşdur ki, həzrət Peyğəmbər buyurmuşdur: «Əli ibn Əbu-Talib (ə) mənim ümmətimin ən alim şəxsidir. Məndən sonra mübahisəli məsələlərdə mühakimədə ən biliklisi odur».

Sünnə əhlinin böyük alimi İbn Əbil-Hədid «Nəhcül-bəlağə»ni şərh edərkən deyir: «İslam elmləri külli şəkildə Əlidən qaynaqlanmışdır. O, İslam maarifini öz nitqlərində aşkar və dəqiq şəkildə bəyan etmişdir».

Həzrət özü belə buyurur: «Nə qədər ki, aranızdan getməmişəm, məndən soruşun». Bu qısa cümlədə həzrətin elminin dərinliyi aydın olur. Çünki o öz buyuruğunda hansısa mövzuları qeyd etmir və suallar dairəsini məhdudlaşdırmır. O, xalqı istənilən bir elm sahəsində suallar verməyə çağırır. Həzrət Əlidən (ə) başqa kimsə bu iddiada olmamışdır. İbn Əbil-Hədid deyir ki, yalnız Əlinin (ə) belə bir söz söyləməsi hamı tərəfindən yekdil şəkildə qəbul olunmuşdur.

Alimlər və tarixçilər yazırlar ki, Həzrət Əli (ə) buyurmuşdur: «Nə qədər ki,



---

۱- [۹۷] «۲۶ ajə, surəsi «Чинн.

aranızdayam, məndən soruşun. And olsun Allaha, əgər fitva kürsüsündə otursam, tövrat əhli ilə tövratla, incil əhli ilə incillə, zəbur əhli ilə zəburla və Qur’an əhli ilə Qur’anla mühakimə apararam. Əgər Allah-təala o kitabları dilə gətirsə, onlar deyərlər ki, Əli (ə) düz deyir, o bizə əsaslanaraq fitva verdi. Nə qədər ki, aranızdayam məndən soruşun. And olsun toxumu cücərdənə və insanı yaradana, əgər məndən Qur’anın ayələrini bir-bir soruşsanız onların nazil olma vaxtı, nazil olma səbəbləri haqqında .«danışar, nəsx olmuş, möhkəm və mütəşabeh ayələri haqqında mə’lumat verərm

Həzrət Əli (ə) belə misilsiz elmə sahib olmasına baxmayaraq, cahil və nadan insanlar arasında tənha qalmışdı. Onun elmindən yalnız xüsusi səhabələr istifadə edirdilər. :Sə’di öz şe’rində bu məsələyə belə toxunur

,Cahillər içində həqiqi alim

.Korlar arasında şahiddir bilin

Həzrət Əli (ə) yaranış sirləri haqqında danışmaq, çətin elmi məsələləri açıqlamaq üçün elm əhli axtarardı. O öz köksünə işarə ilə buyurardı: «Mənim sinəmdə elmin coşqun «!dəryası təlatümdədir. Əfsus ki, kimsədə bunu dərk etmək iste’dadı yoxdur

Bu gün avropa alimlərinin adına yazılmış bir çox təbiət qanunları əsrlərcə qabaq həzrət Əlinin (ə) xütbələrində açıqlanmışdır. Həzrətin xütbələrindəki fəlsəfi həqiqətlər və İslami maarifdən Sədrul-Mutəəllihin kimi bir çox böyük alimlər yetərincə istifadə .etmişlər

İyirmi beş il müddətində xilafət kürsüsünü işğal etmiş üç xəlifə öz elmi və hüquqi .problemlərinin həllində həzrətdən kömək istəyərdilər

Həzrətin xilafət dövründə bir yunan və bir yəhudi filosofu onun hüzuruna gəlib elmi məsələlər barədə söhbətlər apardılar. Yunan filosofu dedi: «Bu şəxs fəlsəfəni Sokrat və Ərəstundan yaxşı bilir. Yəhudi isə belə dedi: «O, fəlsəfənin bütün incəliklərindən xəbərdardır». Əlbəttə ki, hər hansı filosofu həzrət Əli (ə) ilə müqayisə etmək olmaz. Çünki imamın biliyi

.əvvəldə qeyd olunduğu kimi, lədunni, qeybi bilik idi

Elmlərin ən şərafətlisi məad, ölümdən sonrakı həyat haqqında elmdir. Bu elm həzrət Əlinin (ə) kəlamlarında ən gözəl şəkildə bəyan olunmuşdur. Bu mövzunun incəliklərini .həzrət kimi açıqlayan ikinci şəxs olmamışdır

Səhabəsi Kumeylin sualına cavab olaraq həzrətin buyurduğu nəfs və həqiqət hədisləri hikmət və irfan alimləri tərəfindən təfsir olunmuşdur. Həzrət Əlinin (ə) buyuruqlarını anlamaqda bəşəriyyət hələ də çətinlik çəkir. Həzrət müxtəlif elm sahələrinə aid on bir min qısa kəlamın müəllifidir. Bu kəlamlarda əqli, dini, ictimai və əxlaqi məsələlər bəyan olunmuşdur. Həzrət Əli (ə) İslamda ilahi fəlsəfə məsələlərini açıqlayan ilk şəxsdir. O, aydın və dərin dəlillərlə müxtəlif mövzuları sübuta yetirmişdir. Həzrət həmin dövr filosoflarının xəbərsiz olduğu bir çox məsələləri izah etmişdir. O bir çox din alimləri tərbiyə etmişdir. Həzrətin tələbələri arasında Üveys Qərəni, Kumeyl ibn Ziyad, Meysəm Təmmar kimi zahid və arif insanlar olmuşdur. Bu insanlar İslam irfanında (nümunə sayılan şəxsiyyətlərdir.(١

Həzrət Əlinin (ə) ərəb ədəbiyyatında xüsusi bir məharəti vardı. İlkin ərəb qrammatikası onun tərəfindən işlənilmişdir. Həzrət ən çətin məsələlərin cavabını dərhal verər, ali hikmətləri sadə sözlərlə bəyan edərdi. Həzrət ən çətin riyazi sualları dərhal cavablandırardı. Bir dəfə həzrətdən birdən onadək ədədlərin ən kiçik ortaq bölünəni haqqında soruşurlar. Həzrət belə cavab: «Həftə günlərinin sayını (٧) ilin günlərinin sayına (٣۶٠) vur və istədiyin rəqəmi (٢۵٢٠) əldə et». ٢۵٢٠ rəqəmi birdən .onadək bütün ədədlərə bölünən ən kiçik rəqəmdir

Həzrətin iti ağlı elm sahiblərini heyran edərdi. Ömər deyərdi: «Ya Əli (ə), sənin bütün elmi, hüquqi, fiqhi məsələləri bilməyin məni təəccübə gətirir. Sənin bütün məsələlərlə bağlı suallara dərhal cavab verməyin heyranedicidir». Həzrət onun cavabında buyurmuşdur: «Ey Ömər, əlində neçə barmağın var?» Ömər ərz edir: «Beş barmağım». Həzrət buyurur: «Sən nə üçün bu sualın cavabında düşünmədin?» Ömər ərz edir: «Bu aşkar bir

məsələdir və düşünməyə ehtiyac yoxdur». Həzrət Əli (ə) buyurur: «Sənin üçün beş .«barmaq necə aydındırsa, mənim üçün də bütün elmi məsələlər eləcə aydındır

Həzrət Əli (ə) varlıq aləminin sirlərinə həkimanə baxardı. Onun tövhid, metafizik aləm .haqqındakı buyuruqları «Nəhcül-bəlağə» və sair əsərlərdə əks olunmuşdur

## ƏLİNİN (Ə) ŞÜCAƏTİ VƏ HEYBƏTİ

İnsan üçün ruhani fəzilətlərdən biri də şücaət sifətidir. Şücaət təhlükəli işlər qarşısında .insanın mətin dayanmasıdır. Həzrət (ə) əsil şücaət simvolu olmuşdur

Biz əvvəlki söhbətlərimizdə həzrətin (ə) hərbi xidmətləri, qəzavatlardakı fədakarlıqları haqqında danışdıq. Amma bu barədə nə qədər danışsaq da, həzrətin şücaətini olduğu .kimi göstərməkdə acizik

Tarixçilərin yazdığına görə həzrət Əlinin (ə) rəngi buğdayı, mübarək gözləri iri və cazibəli, qaşları bitişik və sıx, dişləri möhkəm və mirvari tək ağ olmuşdur. Onun biləkləri sanki sümükdən, ətdən və dəridən yox, vahid və möhkəm bir tökmədən ibarət .olmuşdur

.Həzrət orta boylu, möhkəm bədənli və nəhayət həddə güclü olmuşdur

Tarixçilər bu fikirdədirlər ki, ərəblər arasında Həzrət Əli (ə) kimi şücaətli və güclü bir insan olmamışdır. Atası Əbu-Talib onu ərəb cavanları ilə güləşdirərdi. Yaşca öz rəqiblərindən kiçik olan həzrət Əli (ə) onları bir göz qırpımında yerə vurardı. Zübeyr ibn Əvvam and içir ki, döyüş meydanında Əlidən (ə) başqa kimsədən çəkinmədim. Həzrətin qarşısında titrətməyə düşən təkcə Zübeyr olmamışdır. Heç bir ərəb .qəhrəmanı onunla üzbəüz gəlməyə cür'ət etməmişdir

Həzrət o qədər heybətli olmuşdur ki, rəqibi onun gözünə baxdıqda vücudu lərzəyə gəlmişdir. İmamın heybəti rəqibin bütün müqavimət və hücum qüdrətini qırmışdır. Həzrətdən soruşurlar ki, öz rəqiblərinə necə qalib gəlirsən? O buyurur: «Mən kiminlə üz-üzə gəlmişəmsə, həmin şəxs özü özünə qarşı mənə yardımçı olub». Seyyid Rəzi bildirir ki, imam bu kəlamında rəqibin qəlbində yaranmış qorxunu nəzərdə tutur. Həzrətin qəzavatlardakı misilsiz

rəşadətləri, Peyğəmbərə sui-qəsd təşkil olunarkən onun yatağında yatması onun misilsiz şücaətindən danışır. Heç bir cəngavər düşmən qoşununu təkbaşına yarmağa .müvəffəq olmamışdır

Müaviyə həzrət Əlinin (ə) gözündə öz hərbi qüdrətini böyük göstərmək üçün ona yazdığı məktubda qoşununun əzəmətindən və döyüş hazırlığından ağız dolusu danışırdı. Tirmah Müaviyəyə dedi: «Sənin öz qoşununun çoxluğu ilə Əlini (ə) .«qorxutmağın ördəyi suyun çoxluğu ilə qorxutmaq kimidir

İmam Səccad (ə) Yezidin məclisində özünü tanıtdırmaq üçün oxuduğu xütbədə həzrət Əlinin (ə) bə’zi fəzilətlərini sadalamış və demişdir: «Mən bir kəsin övladıyam ki, hamıdan güclü, şücaətli, əzmli və iradəli olmuş, cəsarətli şir tək döyüş vaxtı atılmış oxları, ona yaxınlaşan süvariləri dəyirman kimi üyütmüşdür. Qara yel otların üstündən əsdiyi kimi, (o da düşmən üstünə şığıyıb onları pərakəndə salmışdır».(١

İmam Səccadın (ə) öz babasını bu sayaq vəsf etməsi ailə bağlılığından doğmur. Əlinin (ə) şücaəti inkarolunmaz bir həqiqətdir. İmam Səccad (ə) babasının məqamından .xəbərdar bir adam kimi onun fəzilətlərini bəyan edir

Həzrətin şücaətini e’cazkar bilən Şeyx Müfid yazır: «Ondan savay bütün döyüşlərdə qalib gələn cəngavər olmamışdır. Əksər cəngavərlərin həm qələbəsi olmuşdur, həm də məğlubiyyəti. Eləcə də, heç bir döyüşçünün bir zərbəsi ilə rəqib dünyasını dəyişməmişdir. Bə’zən zərbələr ölümcül olmuş, bə’zən isə zərbə alan rəqib sağalmışdır. Yalnız Əmirəl-mö’minin Əli (ə) bütün mübarizələrdə qalib olmuş və vurduğu zərbədən sonra ayağa qalxan olmamışdır. Bu özü də həzrətin e’cazlarından biridir. Həzrətin ən ali sayılası işlərində də qəribəliklər müşahidə olunmuşdur. Bütün (bunlar Allahın aşkar dəlillərindəndir».(٢

Əlinin (ə) iman və yəqindən qaynaqlanan qəlb gücü kimsədə görünməmişdir. Bir dəfə Siffeyn döyüşündə üzünə niqab salıb adi bir döyüşçü tək şamlıların önünə çıxmışdı. O qarşısına çıxan bütün döyüşçüləri qanına qəltan etdiyi

۱- [۱۰۰] «Биһарул-әнвар» ۴۵-чи чилд, сәһ. ۱۳۸.

۲- [۱۰۱] «Иршад» ۱-чи чилд, ۳-чү баб, ۵۶-чы фәсил.

vaxt Müaviyə Əmr Asa dedi: «Bu şücaətli, ürəkli qəhrəman kimdir?» Əmr dedi: «Ya Abdullah ibn Abbasdır, ya da Əlinin (ə) özüdür». Müaviyə dedi: «Bəs necə tanımaq olar?» Əmr dedi: «İbn Abbas şücaətli kişidir, amma qoşunun ümumi həmləsi qarşısında tab gətirə bilməz. Bütün qoşuna əmr et hücuma keçsin. Onda mə'lum olar ki, bu şəxs kimdir. Əgər geri dönsə, İbn-Abbasdır, yox yerində qalıb döyüşsə, Əlidir (ə). Çünki .«Əlinin (ə) üstünə bütün ərəblər də yerisə, yerindən tərpənən deyil

Müaviyə Əmr Asın sözlərini yoxlamaq üçün ümumi hücum əmri verdi. Bütün qoşun meydandakı cəngavərin üstünə yeridi. Amma fədakar döyüşçü əzəmətli dağ tək meydanda dayanıb, sağa-sola qılınc çalırdı. Onlar anladılar ki, bu Əlinin (ə) özüdür. Ona .görə də geri çəkilmək qərarına gəldilər

Döyüş meydanında Əlinin (ə) səsi eşidiləndə düşmən cəngavərləri tir-tir əsərdi. Cəməl və Siffeyn döyüşlərində Həzrət Əli (ə) tək-tənha düşmən qoşununun üzərinə yeriyər .və qoşunun bağrını yarıb, pərən-pərən salardı

Həzrət Əlinin (ə) heç zaman döyüş meydanından qaçmadığını onun ən qatı düşmənləri də təsdiq edir. Həzrət Əli (ə) zirehi yalnız döyüş libası olaraq geyərdi. Onun zirehinin sinə hissəsində yalnız bir neçə halqa vardı. Zirehin arxa hissəsi isə tamamilə açıq idi. Ondan zirehi haqqında soruşulduqda həzrət belə buyurmuşdur: «Mən heç vaxt düşmənə arxa çevirmirəm, ona görə də arxadan zirehə ehtiyacım yoxdur». Sə'di bu :barədə yazır

Düşməninə arxa çevirməyən kəs

.Arxasında zireh gəzdirməz əbəs

Döyüşlərdən birində komandanlar həzrət Əliyə (ə) dedilər: «Əgər qarşıdakı döyüşdə məğlub olsaq, hansı nöqtədə görüşəcəyik? Yaxşı olar ki, əvvəlcədən belə bir nöqtə müəyyənləşdirək». Həzrət buyurdu: «Məni harada itirsəniz, orada da axtarın. Harada .«döyüşə başlasam, oradan tərpənən deyiləm

Səhabələrdən biri həzrətə belə ərz etdi: «Döyüş üçün iti qaçan bir at səh:۱۶۲

seçin ki, çətin vəziyyətlərdə sizi qaçırıb qurtara bilsin». Həzrət buyurdu: «Mən düşmən qabağından qaçan deyiləm ki, iti qaçan ata ehtiyacım olsun. Qaçan düşməni də tə’qib edən deyiləm ki, belə bir ehtiyac yaransın. Buna görə də mənim üçün atın necə qaçmasının əhəmiyyəti yoxdur».(۱)

İbn Əbil-Hədid deyir: «Həzrət Əli (ə) keçmişdəki qəhrəmanların adını tarixdən silmiş və gələcəkdəki qəhrəmanlara tarixdə yer qoymayan şücaətli bir cəngavər idi. Onun qolunun gücü kimsədə yox idi. Ən şücaətli döyüşçünü həlak etmək üçün bircə zərbəsi yetərdi. Onunla üzbəüz gələn heç bir döyüşçü canını sağ qurtarmamışdı. Onunla döyüşənin qılınca ehtiyacı yoxdu. Həzrət öz rəqibini həlak edəndə təkbir deyərdi. Ləylətül-həriridə onun təkbirlərinin sayı ۵۲۳-ə çatmışdı. Bu onu göstərirdi ki, ۵۲۳ düşmən həzrətin (ə) əli ilə dünyasını dəyişmişdi. Ühüd döyüşündə qəbilə üzvlərini itirmiş Savab adlı həbəş qulam Peyğəmbəri öldürəcəyinə and içmişdi. Bu qulam böyük cüssəyə malik olduğundan rəqibləri ondan çəkinərdi. Həzrət Əli (ə) bir zərbəsi ilə onu kəmərindən ikiyə böldü. Onun qurşaqdan yuxarısı yerə aşmış, qurşaqdan aşağısı isə ayaq üstə qalmışdı. Bu səhnə ətrafdakıları heyrətə gətirmişdi.

Həzrət Əli (ə) yalnız Allah yolunda döyüşürdü. Müsəlmanlar onun ruhiyyəsindən güc alırdılar. Əlini Zülfüqara aparanda bütün ətrafdakılar əmin olurdu ki, qələbə yaxındadır. Müşriklərin rəftarları səbəbindən həzrət Peyğəmbər (s) qəm-qüssəyə düşdüyü vaxt müxaliflər həzrət Peyğəmbəri (s) qətlə yetirmək istədikləri zaman həzrət Əli (ə) Allah rəsulunun qəm-qüssəsini aradan qaldırdı.

Həzrətin qollarının gücü hətta düşmənlərin də e’tiraf etdiyi bir səviyyədə idi. O iki barmağı ilə Xalid ibn Vəlidin boğazını sıxdığı vaxt Xalid zarıyıb boğulmağa qalır. Peyğəmbərin (s) iştirak etdiyi bir çox qəzavatlarda müharibənin taleyini həzrət Əlinin (ə) qılıncı həll edir.

Əlinin (ə) həyat tarixində qorxu sözünə yer olmamışdır. O bütün ömrünü ölümlə üzbəüz dayanmış və şəhadət şərbətini içmək eşqi ilə yaşamışdır. O özü belə buyurur: «And olsun Allaha, Əbu-Talibin oğlu ölümü

.«südəmər körpə anasının döşünü sevdiyi tək sevir

Həzrət Siffeyn döyüşündə meydana zirehsiz çıxır. İmam Həsən (ə) öz atasına belə ərz edir: «Döyüş vaxtı bu ehtiyatsızlıq deyilmi?» Həzrət buyurur: «Oğul can, atan ölümə .«doğru getməkdən, ölümün ona doğru gəlməsindən qorxmur

Həzrətin bir çox yaxınları onun şücaətindən ehtiyat edərdilər. Onlar həzrətə ərz edirdilər ki, həzrət döyüş gedişində ehtiyatsızlıq göstərir. Həzrət (ə) onların cavabında belə buyurmuşdur: «Ölümdən iki dəfə həzər qılmağa dəyməz. Qəzavü-qədər olan gün çalışmaq səmərəsizdir, qəzavü-qədər olmayan gün isə ölüm barədə düşünməyə .«dəyməz

Qəbilələr öz döyüşçülərinin həzrət (ə) tərəfindən öldürülməsini özləri üçün fəxr sayardılar. Xəndək döyüşündə Əlinin (ə) öldürdüyü Əmr ibn Əbdəvədin bacısı deyir: «Əgər qardaşımı Həzrət Əli (ə) yox, başqa biri öldürsəydi, ömür boyu ağlayardım. .«Amma Əlinin (ə) bütün dünyada oxşarı yoxdur. Onun əlində ölmək özü də iftixardır

İbn Əbil-Hədid «Nəhcül-bəlağə»nin şərhində yazır: «Bir gün Müaviyə yuxudan oyananda Abdullah ibn Zübeyri ayaqları tərəfdə oturmuş görür. Abdullah zarafatla Müaviyəyə deyir: «Əgər istəsəydim səni öldürərdim». Müaviyə deyir: «Bizdən sonra şücaətindən danışarsan». Abdullah deyir: «Nə üçün mənim şücaətimi inkar edirsən? Mən müharibədə Həzrət Əli (ə) ilə üzbəüz dayanan adamam». Müaviyə deyir: «Əgər belə bir cür'ətin olsaydı, yəqin ki, Əli (ə) səni və sənin atanı sol əli ilə öldürər, sağ əli ilə (isə bir başqasını gəzərdi».(١)

### ƏLİNİN (Ə) SƏBR VƏ HELMİ

Ruhun müsbət səciyyələri sırasında səbr və helm əsas yerlərdən birini tutur. Bu iki səciyyə psixoloji baxımdan insanın öz meyllərinə qalib gəlməsində mühüm əhəmiyyətə malikdir. Ruhani böhranlar, müxtəlif həyat çətinlikləri səbr və dözüm .vasitəsi ilə aradan qaldırılır



---

.Бинарул-энвар», ۴١-чи чилд, сəh. ١۴٣» [١٠٣] -١

vasitəsi ilə vacib dini vəzifələrin yerinə yetirilməsində dözümlü olur və günahdan .çəkinir. Bir sözlə, səbr insanın zinətidir. Hər bir insan özünü səbrlə zinətləndirməlidir

Həzrət Əli (ə) bütün baxımlardan səbirli və həlim idi. Bu səciyyələr onun rəftarında aydın müşahidə olunurdu. O hətta döyüşün ən qızğın məqamlarında da səbrini və .helmini əlindən vermirdi

Həzrət (ə) kamal həddində elmə malik olmuşdur. O bütün çətinliklərə dözmüş, yalnız dinin taleyi təhlükə altında olduqda ayağa qalxmışdır. Həzrət (ə) səbirli olmaqla yanaşı, .həqiqətin müdafiəsində heç nədən çəkinməmişdir

Müaviyənin də helmi haqqında danışanlar var. Amma bu helm sün’i və saxta helm olmuşdur. O öz maddi mənafelərini qorumaq xatirinə helmdən hiyləgərliklə istifadə etmişdir. Hansı ki, həzrət Əlinin (ə) helmi əxlaqi bir fəzilət olmuşdur. Həzrət öz helmi ilə .haqqın qələbəsi, dinin inkişafı, azğınların doğru yola gəlməsi üçün faydalanmışdır

Həzrət Əli (ə) həzrət Peyğəmbərin (s) bütün qəzavatlarında döyüş çətinliklərinə dözmüş, Allahın rəsulunu (s) himayə etmişdir. O din uğrunda bütün çətinlikləri gülər .üzlə qəbul etmişdir

Həzrət Peyğəmbər (s) Əlini (ə) xəbərdar etmişdi ki, onun vəfatından sonra xilafət məsələsində ixtilaflar yaranasıdır. Həzrət bu məqamlarda Əlini (ə) səbr etməyə çağırmışdır. Həzrət Əli (ə) İslamın zahiri nizamını qorumaq xatirinə iyirmi beş il çətinliklərə səbr etmişdir. O özü bu barədə buyurur: «Mən gözünə tikan batmış, .«boğazında sümük qalmış bir adam kimi səbr etdim

Həzrət Əli (ə) öz haqqını müdafiə etmək üçün hər zaman qüdrətə malik olmuşdur. Amma dinin qorunması üçün səbr etmişdir. Bu çox böyük bir məzlumiyyətdir. Əlidən (ə) başqa kimsə bu müsibətlərə dözə bilməzdi. Həzrət (s) bu barədə buyurur: «Dəfələrlə bu zalım qövmlə təkbaşına vuruşmaq və haqqımı geri qaytarmaq istədim. Amma Peyğəmbərin vəsiyyətinə və dinin qorunmasına xatir öz haqqımdan keçdim». Bundan da böyük bir zülm ola bilərdimi ki, Muğəyrə ibn Şö’bə, Xalid ibn Vəlid kimi rəzil şəxslər həzrəti zorla məscidə aparıb, Əbu-Bəkrə bey’ətə vadar etsinlər. Belə bir

müsibətə səbr etmək yalnız Əlinin (ə) işi idi. Hansı ki, o həmin məqamlarda qılınca əl aparsaydı, qarşısında bütün ərəb qövmü dayana bilməzdi. Nəql edirlər ki, həzrət Əlini (ə) Əbu-Bəkrə bey’ət üçün zorla aparanda Əlinin (ə) şücaətinə yaxından bələd olan bir yəhudi onun bu səbrini görüb İslamı qəbul etdi. Səbəbini soruşduqda dedi: «Mən bu şəxsi tanıyıram. Bu həmin şəxsdir ki, döyüş meydanına çıxanda adlı-sanlı cəngavərlərin qəlbinə titrətmə düşüb. Bu həmin şəxsdir ki, əzəmətli Xeybər qalalarını fəth etdi və onun dəmir qapılarını yerindən oynatdı. İndi isə o bir ovuc fitnəkarın qarşısında susur. Bu hikmətsiz iş deyil. O yalnız dini qorumaq üçün susur. Əgər bu dində həqiqət olmasaydı, o bu zülmə dözməz, qılınca əl apardı. Onun bu rəftarı .«mənə sübut edir ki, İslam haqq dindir. Ona görə də müsəlman oldum

Həzrət Əli (ə) kimi bir şəxsiyyətin öz qoşununun vəfasızlığı ilə barışmasından böyük məzlumiyyət ola bilərmi?! O bu qoşunu nə qədər nəsihət etdisə də faydası olmadı. Nəhayətdə, həzrət Əli (ə) Allahdan ölüm istədi. O təpərsiz kufəlilərlə bir yerdə .qalmaqdansa, ölümü üstün tutdu

Həzrət Əli (ə) Peyğəmbərin (s) vəfatından sonra daim ruhi iztirablar içində oldu. Onun səbr və dözümdən başqa çarəsi yoxdu. İbn Əbil-Hədidin dediyinə görə, bir dəfə həzrət (ə) nalə çəkib məzlumiyyətindən gileylənən birinin səsini eşidir və buyurur: «Gəl bir .«yerdə nalə çəkək. Mən həmişə məzlum olmuşam

Biz həzrətin (ə) məzlumiyyətini, eyni zamanda misilsiz dözümünü əziz oxuculara :yetərincə çatdırmaq üçün onun Şiqşiqiyyə xütbəsini tərcümə edirik

Həzrət (ə) bu xütbədə buyurur: «Bilin ki, «filankəs» xilafət libasını əyninə geyindi. Amma yaxşı bilirdi ki, dəyirmanın oxu onun daşı üçün necədirsə, mən də xilafət üçün eləyəm. Elm və hikmət seli mənim ağuşumdan axmaqdadır. Ucadan uçan düşüncə quşu kamal .fəzasında nə qədər yüksəyə qalxsa da, mənim qülləmə çatmaq gücündə deyil

Bununla belə xilafət yükünü çiynimdən yerə qoyub, bu yükdən uzaqlaşdım. Qarşımda iki yol vardı. Düşünürdüm ki, tək-tənha hücuma keçim, yoxsa qocaları üzmüş, cavanları qocaltmış, mö’minləri Allahla görüşə sövq edən

əziyyətə salmış korluq zülmətinə dözüm? Gördüm ki, bu zülm-sitəmə dözmək daha ağıllı işdir. Belə ki, gözünə tikan batmış, boğazında sümük qalmış, mirası qarət olunmuş kimi səbr etdim. Axır ki, «birinci» öz yolunu başa vurub, xilafət gəlinini Xəttab oğlunun ağuşuna atdı. Təəccüblüdür ki, həyatı boyu öz ləyaqətsizliyini və mənim ləyaqətli olduğumu e’tiraf edən bu adam ömründən bir neçə gün qalmış xilafət məqamını bir başqasına ötürdü. Bu iki şəxs xilafət dəvəsinin südünü sağdılar. Xilafət .sərt təbiətli, acı dilli, dini işlərdə xətası çox, üzrü az olan birinə verildi

O isə cilovu burnunun pərəsindən çıxmış harın dəvə kimi idi. O öz süvarisini heyrətə gətirmişdi. Onun cilovunu bərk çəkdikdə burnu paralanır, cilovunu boş buraxdıqda süvarisini uçuruma yuvarladırdı. And olsun Allaha, xalq onun dövründə səhvə düçar oldu, doğru yoldan çıxdı. Mən də bu müddət ərzində qəm-qüssə çətinliyinə dözdüm. O da öz yolu ilə getdi və bir cəmiyyət arasında xilafət qurdu ki, məni də o .cəmiyyətdəkilərdən biri kimi güman etdi

Pərvərdigara, yardım buyur. Bu şuraya nəzər sal, gör bu xalq məni «birinci» ilə necə bir tutdu və haqqımda şəkkə düşdü. Nəticədə, həmin adamlar sırasında qərar tutmuşam. Amma yenə də dinin məsləhətinə görə səbr etdim, eniş-yoxuşlarda onlarla həmahəng oldum. Bir kişi (Sə’d Vəqqas) keçmiş kininə görə haqq yoldan azdı və batil yola qədəm qoydu. O biri kişi (Əbdürrəhman ibn Ovf) Osmanın yeznəsi olduğu üçün məndən üz döndərib ona meyl etdi. Başqa iki nəfərin (Təlhə və Zübeyr) adını çəkməyim də pisdir. Bu yolla iki çiyni şişmiş «üçüncü» işin cilovunu əlinə aldı və atasının övladları da (bəni-Üməyyə) onunla əl-ələ verib hərisliklə yaşıl yaz otlarını yeyən dəvə kimi Allahın malını .yeməyə başladılar. Nəhayət, bağlanmış ip açıldı və əməlləri onu qətlə düçar etdi

Məni qorxuya salan yalnız xalqın mənə hücum edib dörd tərəfimi tutması oldu. Belə ki, .izdihamdan Həsən və Hüseyn əl-ayaq altda qaldı, libasımın iki tərəfi paralandı

Xalq yerində fırlanan qoyun sürüsü kimi ətrafımda toplandı. Elə ki, onların bey’ətini qəbul etdim, bir dəstəsi bey’əti sındırdı, o biri dəstəsi bey’ətdən çıxdı, bə’ziləri də batilə doğru hərəkət etdi. Sanki bu adamlar Allahın belə bir kəlamını eşitməmişdilər: «Biz axirət evini o kəslər üçün qərar vermişik ki, yer

.«üzündə fitnə-fəsad törətməsinlər

Bəli, and olsun Allaha, bu ayəni şübhəsiz eşitmiş və əzbərləmişlər. Amma dünya .onların nəzərində cilvələnmiş, onun zinətləri bu adamları aldatmışdır

And olsun toxumu cücərdən, bəşəri xəlq edən Allaha, əgər izdihamın hüzuru və onların yardımı ilə höccətin qiyamı olmasaydı, Allah alimlərdən zalımların hakimiyyəti altına düşməmək haqqında və’d almasaydı, hər an xilafət dəvəsinin cilovunu onların üstünə atardım. Siz dərk edirsiniz ki, sizin bu dünya mənim nəzərimdə keçi burnunun (suyundan da dəyərsizdir».(۱

Həzrət Əli (ə) bu xütbədə gizli və dərin həyəcanın tə’sirindən öz məzlumiyyətini izhar edib, hamıya aydınlaşdırır ki, belə bir məzlumiyyətə dözmək necə çətindir. Həzrətin öz misilsiz səciyyələri ilə Sə’d Vəqqas, Müaviyə və bu kimi başqa rəzillərlə üzbəüz dayanması əslində məntiqi baxımdan təzadlı idi. Həzrət buyurur ki, dövran məni elə bir yerə endirdi ki, Müaviyə də özünü mənim kimi bildi. Həzrət (ə) bütün bu çətinliklərə din .xatirinə dözürdü. Ona görə də öz ölümünü gülər üzlə qarşıladı

## ƏLİNİN (Ə) SƏXAVƏT VƏ İSARI

Səxavət kərəm səciyyəsindən doğur və cəmiyyətdə fərdlər arasında məhəbbəti .bərqərar edir. Səxavətli şəxsin hər hansı eybi olsa da, xalq onu sevməkdə davam edir

Həzrət Əli (ə) səxavətdə məşhur idi və çarəsizlərin istək kə’bəsi sayılırdı. Ehtiyacı olanlar ona müraciət edər, o da öz növbəsində fitri nəcabəti ilə onlara cavab verərdi. Haris Həmədani ona öz ehtiyacını bildirdiyi vaxt həzrət buyurur: «Məni istəyini bildirməyə layiq sayırsanmı?» Haris ərz edir: «Bəli, ya Əmirəl-mö’minin». Həzrət dərhal .çırağı söndürdü. O istəmirdi ki, ehtiyaclı şəxs öz istəyini bildirərkən xəcalət çəksin

Bir gün bir yoxsul həzrət Əlinin (ə) yanına gəlib öz ehtiyacını bildirdi. Həzrət xidmətçisinə buyurdu ki, bu şəxsə min dinar versin. Xidmətçi soruşdu: «Qızıl verim, ,yoxsa gümüş?» Həzrət buyurdu: «Yoxsulun ehtiyacı hansınadırsa

ondan da ver». Həzrətin qatı düşməni olan Müaviyə bir şəxsdən soruşdu: «Haradan gəlirsən?» Həmin şəxs Müaviyəyə yaltaqlanaraq dedi: «Ən xəsis adam olan Əlinin (ə) yanından». Müaviyə dedi: «Vay olsun sənə, Əlidən səxavətlisi dünyaya gəlməyib. Əgər onun ixtiyarında bir anbar saman, bir anbar qızıl olsa, qızılı samandan qabaq bağışlayar».

Bir gün həzrətin (ə) xidmətçilərindən biri həzrətin mülk qazancını ona təqdim edir. Həzrət (ə) bu qazancı dərhal fəqirlər arasında bölüşdürür. Xidmətçi səhəri gün görür ki, Həzrət Əli (ə) ailəsinə çörək almaq üçün bazarda qılıncını satır.

Həzrət Əli (ə) heç vaxt ona ağız açanı rədd etmədi. Özü belə buyurur: «Əgər hiss etsəm ki, biri məndən nə isə istəmək fikrindədir, o mənə ağız açmamış, istəyini yerinə yetirərəm. Çünki əsl səxavət istənilmədən verməkdir».

Həzrət (ə) buyurmuşdu: «İstəyi olanlar istəklərini kağıza yazsınlar ki, ağız açmağın xəcaləti çöhrələrində görünməsin». Bir dəfə həzrət əlindəki dörd dirhəmin birini gecə, birini gündüz, birini aşkar, birini isə gizlində infaq etdi. Həmin vaxt nazil olmuş bir ayəni təfsirçilər həzrətin nəfəqəsinə aid edirlər.(١)

Osmanın qətlindən sonra həzrət xilafət kürsüsünə oturduğu vaxt bir ərəb onun hüzuruna gəlib ərz etdi: «Mənim üç növ xəstəliyim var: bədən xəstəliyi, cəhalət xəstəliyi və yoxsulluq xəstəliyi». Həzrət buyurdu: «Xəstəliyi təbibə, cəhaləti alimə, fəqirliyi varlıya bildirmək lazımdır». Ərəb dedi: «Siz həm təbibsiniz, həm alimsiniz, həm də varlı». Həzrət göstəriş verdi ki, beytül-maldan üç min dirhəm ona versinlər. Sonra kişiyə buyurdu: «Min dirhəmi xəstəliyinin müalicəsinə, min dirhəmi pərişanlığı aradan qaldırmağa, min dirhəmi isə nadanlığı aradan götürməyə sərf et».(٢)

Əksər alimlər və təfsirçilər nəql etmişlər ki, həzrət Əli (ə) məsciddə namaz qıldığı vaxt rüku vəziyyətində olarkən, məscidə daxil olmuş yoxsula öz üzüyünü bağışlamışdır. Onların bildirdiyinə əsasən, vilayət ayəsi



---

١- [١٠۵] «Бəгəрə» сурəси, ajə ٢٧۴.

.də məhz həmin məqamda nazil olmuşdur

Həzrət təkcə maddi yardımlarla kifayətlənmirdi. O haqq yolda öz canını da isar etmişdi. .Hicrət gecəsi Peyğəmbərə (s) xatir ölümlə üzbəüz dayanaraq, onun yerində yatmışdı

İsar insanın başqalarını özündən üstün tutmasıdır. Nəfsinə tam hakim olmayan insan belə bir səciyyəyə sahib ola bilməz. İsar sifəti ən üstün əxlaqi və ilahi sifətlərdəndir. Həzrət böyük əziyyətlə qazandığı çörəyi evinə apararkən yolda rastlaşdığı yoxsulun əl açdığını görüb həmin çörəyi ona verir. Bir dəfə həzrət (ə) qulamı Qəmbərlə bazara .gedir və iki köynək alır. Nimdaş köynəyi özü geyir, təzəni isə Qəmbərə verir

Əksər mühəddislər və tarixçilər «Dəhr» surəsinin «Həl-əta» ayəsinin həzrət Əlinin (ə) isarı haqqında nazil olduğunu bildirirlər. Yazırlar ki, Həsən və Hüseyn xəstələndiyi vaxt ata-anaları, həm də özləri nəzr edirlər ki, sağaldıqdan sonra üç gün oruc tutsunlar. .Evin xadiməsi də bu işdə onlara qoşulur

Allah-təala Həsən və Hüseynə şəfa verdikdən sonra onlar öz əhdlərinə vəfa edib oruc tuturlar. Həzrət qonşudakı yəhudidən arpa borc alır. Həzrət Fatimə birinci gün həmin arpadan beş çörək bişirir. Axşam iftar zamanı bir yoxsul qapını döyür. Həzrət beş .çörəyin beşini də yoxsula verir. Ailə yalnız su ilə iftar edir

İkinci gün Fatimə arpanın digər hissəsindən yenə də beş çörək bişirir. Yenə də şam vaxtı qapı döyülür və bir yetim ac olduğunu bildirir. Peyğəmbər ailəsi yenə də beş çörəyi yetimə verib su ilə iftar edir. Üçüncü gün isə şam vaxtı bir əsir onlara müraciət edir və ailə iftar üçün hazırladığı çörəyi ona verib, su ilə iftar edir. Dördüncü gün Həsən və Hüseynin aclıqdan əsdiyini görən Peyğəmbər (s) buyurur: «Allaha pənah aparıram ki, siz üç gündür bu vəziyyətdəsiniz. Cəbrail dərhal nazil olur və «Həl-əta» sursinin on .səkkizinci ayəsini gətirir

## ƏLİNİN (Ə) FƏSAHƏT VƏ BƏLAĞƏTİ

İnsanın nitqi məntiq elmi baxımından onu digər canlılardan fərqləndirən mühüm xüsusiyyətdir. Allah-təala öz hikməti ilə insana belə bir imtiyaz

(vermişdir.(1)

İnsanlıq mahiyyətini təşkil edən ruh gövhəri onun danışığı ilə təcəlla edir. Sə'di :demişkən

Nə qədər ağzını açmamış insan

.Eybi və hünəri canında pünhan

İmam özü belə buyurur: «Kişi dilinin altında gizlənmişdir». İnsanın nitqi nə qədər səlis .olarsa, onun dediyi sözlər də bir o qədər tə'sir edər

İslamın zühuruna yaxın cahiliyyət dövründə ərəbistanda İmrəul-Qeys kimi e'cazkar şe'r ustaları vardı. Bununla belə, həzrət Əlinin (ə) fəsahəti bütün ərəb ədiblərini heyrətə gətirirdi. Onlar bu ilahi fəsahət qarşısında diz çöküb, həzrəti «kəlam əmiri» .adlandırmağa məcbur olmuşdular

İbn Əbül-Hədid deyir: «Əli natiqlər ustadı idi. Onun kəlamı şə'nində deyilmişdir ki, bu kəlam Allah sözündən aşağı, bəşər sözündən yuxarıdır. Bütün peşəkar xətiblər natiqliyi ondan öyrənmişlər. Qeyd olunur ki, həzrətin fəsahət və bəlağət dərəcəsinin isbatı üçün onun «Nəhcül-bəlağə» kitabı kifayətdir. Heç bir natiq səhabə bu kitabın (onda birini, hətta iyirmidə birini yaza bilməz».(2)

Həmin müəllif həzrətin fəsahət və bəlağəti haqqında belə deyir: «Təəccüblüdür, Məkkədə doğulmuş həmin şəhərdə boya-başa çatmış, heç bir hikmət sahibi və alimlə görüşməmiş bir kəs natiqlikdə belə bir məharət sahibidir! Sanki öz aləmi onun .«ixtiyarındadır. İstədiyi bir mə'nanı ən fəsih şəkildə bəyan etmişdir

Nəhcül-bəlağə nədir?» kitabında belə yazılır: «Bir şəxs bir məsihi alimdən xahiş etdi ki,» həzrət Əlinin (ə) kəlamlarından seçib bir kitab tərtib etsin. Həmin alim o şəxsə belə cavab verdi: «Məndən istəyirsən ki, ərəblərin ən bəlağətli şəxsindən yüz kəlam seçim və sən onu kitab kimi nəşr edəsən. Məndə sənin istəyini tə'min edəcək bir kitab yoxdur. Bir neçə

١- [١٠٧] «Әррәһман» сурәси, ајә ٣.

٢- [١٠٨] «Шәрһе-Нәһчүл-бәлағә», ١-чи чилд, сәһ. ١٢.

kitabım var və onlardan biri də «Nəhcül-bəlağə»dir. Bu əzəmətli kitabı vərəqlədim. And olsun Allaha, bilmirəm Əlinin (ə) kəlamları arasında yüz kəlamı necə seçim?! Daha doğrusu, hansı sözü hansı sözdən ayıracağımı bilmədim. Bu iş bir yaqutu başqa yaqutlardan ayırmaq kimidir. Nəhayət, bu işi gördüm. Amma bir yaqutu ayıranda o (birilərinin nurundan gözüm qamaşdı».(١

Həmin kitabın müəllifi Şəhristani başqa bir kitabında belə yazır. Ərəb ədəbiyyatı üzrə mütəxəssis olan bir ingilis alimi Qur’anın e’cazı haqqında verilən suala belə cavab verir: «Qur’anın kiçik bir qardaşı var, onun adı «Nəhcül-bəlağə»dir. Məgər bu kiçik qardaşın oxşarını gətirə bilirikmi ki, böyük qardaş haqqında danışmağa macalımız «!?olsun

Həzrət Əli (ə) öz danışığında fəsahət və bəlağət qaydalarını izləməmişdir. Onun danışığı zatən şirin və səlis olmuşdur. Bu danışığı fəsahət qaydaları ilə ölçmək yox, .fəsahət qaydalarını həmin buyuruqlardan öyrənmək lazımdır

Həzrətin kəlamları həqiqəti hərarətli bir özünəməxsusluqla bəyan edir. Onun sözlərinin tərkib hissələri mütənasib və əlaqəlidir. Zahiri gözəllik və batini mə’na bir-.birini tamamlayır. Onun dəlilləri möhkəm, məntiqi isə nüfuzludur

Müaviyə demişdir: «Fəsahət və bəlağət yolunu Qüreyşdə Əlidən (ə) başqa açan olmayıb və danışıq qanunlarını ondan başqası tə’lim etməyib». Adlı-sanlı ərəb ədəbiyyatçıları e’tiraf etmişlər ki, yazı-pozu qaydalarını həzrətin xütbələrindən .öyrənmişlər

Düşüncə gücü bəlağətin şərtidir. Natiq insan iti düşüncə ilə mə’naların dəqiqliyini zehnində hazırlayır. Belə bir düşüncə və zəka həzrət Əlidə (ə) zirvə həddində idi. Ən .qaranlıq mətləbləri belə bir anda öz zəka işığında aydınlaşdırardı

Həzrət Əlinin (ə) kəlamlarında cümlələr arasında məntiqi bir bağlılıq vardır. Həzrətin .düşüncəsindən ötüşən hər bir hikmət dərhal ən üstün şəkildə şirin kəlamlara çevrilirdi

Həzrətin söz düzümü, natiqlik sənəti hamını heyran edirdi. İbn Şəhr Aşub nəql edir ki, bir gün Peyğəmbər (s) səhabələri məsciddə oturub elmi və

ədəb məsələlər barədə söhbət edirdilər. Söhbət ondan gedirdi ki, əlif hərfi əksər sözlərdə var və əlifsiz söz çox azdır. Söhbəti dinləyən həzrət ayağa qalxıb yeddi yüz əlifsiz sözdən ibarət bir xütbə oxuyur. Həzrətin elə xütbəsi də var ki, həmin xütbədə bir .dənə də olsun nöqtəli hərf iştirak etməmişdir

Bir şəxs həzrət Əlidən (ə) soruşur ki, vacib iş və vacibdən də vacib iş nədir? Həzrət buyurdu: «Xalqa vacibdir ki, tövbə etsin. Amma günahdan uzaqlıq ondan da vacibdir». Növbəti sual belə oldu: «Təəccüblü nədir və daha təəccüblü hansı işdir?» Həzrət buyurdu: «Zaman öz gedişində təəccüblüdür. Bu dövranda xalqın qəflət və bixəbərliyi daha təəccüblüdür». Üçüncü sual belə oldu: «Çətin nədir və daha çətin nədir?» Həzrət buyurdu: «Hadisələr qarşısında dözüm çətindir. Amma mükafatı əldən vermək daha çətindir». Həmin şəxsin dördüncü sualı belə oldu: «Nə yaxındır və nə daha yaxındır?» .«Həzrət buyurdu: «Ümid edilən şey yaxındır. Ölüm isə hər şeydən yaxındır

Bədahətən belə bir cavab verilməsi, ardıcıl olaraq yeddi yüz əlifsiz sözdən ibarət xütbə oxunması həmin şəxsin fəsahət və bəlağətinin aşkar sübutudur. Bundan ötrü ərəb .ədəbiyyatına tam sahib olmaq lazımdır

### ƏLİNİN (Ə) YEMƏYİ VƏ GEYİMİ

Bu baxımdan həzrəti kimsə ilə müqayisə etmək mümkünsüzdür. O kəpəyi təmizlənmiş .arpa çörəyi yeyərdi. Həzrət Əlinin (ə) süfrəsi kimi sadə bir süfrə tapmaq çətin idi

Həzrət heç vaxt iki yavanlığı bir vaxtda yeməzdi. Şəhadət gecəsi onun üçün çörək, süd və duz hazırlamış qızı Ümmü-Gülsümə belə buyurdu: «Məgər bilmirsənmi ki, atan bu vaxtadək yalnız bir qəza yeyib? Südü götür, duz kifayət edər». Həzrət Baqir (ə) buyurmuşdur: «And olsun Allaha, cəddim Həzrət Əli (ə) qullar sayaq yeyər, yerdə oturardı. İki köynək alanda qulamına təklif edərdi ki, köynəklərdən birini seçsin. . . Beş illik xilafəti dövründə özü üçün kərpic üstə kərpic qoymadı, qızıl-gümüş toplamadı. Xalqa buğda çörəyi və ət yedirtdi, özü isə arpa çörəyi yedi. İki yaxşı işdən birini seçməli olduqda ən çətinini seçdi. Öz əlinin zəhmət haqqısı ilə minə yaxın qul azad etdi. Bu işdə

(əli torpağa bulaşdı, çöhrəsi tərə. Kimsədə onun işini görmək qüdrəti yoxdur».(١)

İbn Cövzi yazır: «Bir gün Abdullah ibn Rəzin həzrət Əlinin (ə) evinə getdi. Gördü ki, həzrət bir miqdar ətlə arpanı suda qarışdırıb qaynadır. Abdullah ərz edir: «Ya Əmirəl-mö’minin (ə), bu nə qəzadır yeyirsiniz? Siz müsəlmanların xəlifəsisiniz və bütün beytül-mal əlinizdədir. İxtiyarınız var ki, aclığınızı aradan qaldıracaq həddə güclü xörəklər yeyəsiniz». Həzrət buyurdu: «Müsəlmanların valisi üçün bundan artıq yemək caiz deyil».

Abdullah ibn Əbu-Rafe deyir: «Bir bayram günü həzrətin yanına getdim. Ona ağzı möhürlü bir torba gətirdilər. Torbanın içində quru arpa çörəyi gördüm. Həzrət bu çörəkdən yeməyə başladı. Ərz etdim: «Ya Əmirəl-mö’minin (ə), bu torbanı nə üçün möhürləyirsinz?» Həzrət buyurdu: «Qorxuram ki, Həsən və Hüseyn bu çörəkləri yağla yumşaldalar».

Bəli, həzrət olduqca az və sadə yeyərdi. O buyururdu: «Qarnınızı heyvanat qəbristanlığına çevirməyin».(٢)

Zəxirətul-Muluk» kitabında yazılır ki, bir gün həzrət Əli (ə) Kufə məscidində e’tikaf» (oruc halda məsciddə qalmaqla yerinə yetirilən ibadət) etmişdi. İftar vaxtı həzrətin yanına bir ərəb gəldi. Həzrət Əli (ə) torbadan arpa çörəyi çıxardı. Çörəkdən bir qədər ərəbə verdi. Amma ərəb çörəyi yeməyib özü ilə götürdü. Sonra həmin şəxs Həsən və Hüseynin evinə gəlib onlarla birlikdə qəza yedi. O dedi: «Məsciddə bir qərib kişi gördüm. Bu quru çörəkdən başqa bir şeyi yoxdu. Onun halına acıdım. Bu yeməkdən bir qədər aparım ona verim». Həsən və Hüseyn ağladılar və dedilər: «O bizim atamız Əmirəl-mö’minindir (ə). O bu riyazətlə nəfsi ilə cihad edir».(٣)

Bir gün Ədi ibn Hatəm həzrət Əlinin (ə) yanına gedir. Həmin vaxt həzrət qəza yeməyə məşğul imiş. Ədi görür ki, həzrətin süfrəsində bir kasa su, bir parça arpa çörəyi və duz var. Ədi ərz edir: «Ya Əmirəl-mö’minin, gündüzlər bir bu qədər əziyyət çəkir, gecələr ibadətə məşğul olursunuz. Yeməyiniz isə



---

١- [١١٠] Һәдис» ١۴-чү мәчлис, ۴٧-чи Әмали».

budur». Həzrət Əli (ə) buyurur: «Azğın nəfsi riyazətə adət etdirmək lazımdır ki, tüğyan etməsin».

Varlı bir kişi həzrət Əliyə (ə) bir qədər halva pay gətirir. Həzrət halva olan qabın ağzını açdıqda ondan xoş ətir duyur və buyurur: «Rəngindən və ətrindən mə'lumdur ki, yaxşı dadın var. Amma səni dada bilmərəm. Çünki mənim xəlifəliyim altında elə bir kəs tapıla bilər ki, gecəni ac yatmışdır».

Əhnaf ibn Qeys belə bir rəvayət nəql edir: «Bir gün Müaviyənin yanında idim. Yemək vaxtı çatdıqda onun üçün çeşidli bir süfrə açdılar. Süfrədə min bir ne'mət vardı. Müaviyə qarınqulu adam olduğundan yeməklərə özü xüsusi diqqət yetirər, onların qədərinə və keyfiyyətinə nəzarət edərdi. Mən Müaviyənin süfrəsinə baxıb ağladım. Müaviyə ağlamağımın səbəbini soruşdu. Dedim: «Əlinin (ə) halına ağlayıram. Bir gün onunla birlikdə iftar edirdim. Möhürlü torba gətirdilər. O, torbanı açıb, quru arpa çörəyi çıxardı. Sonra yenidən kisənin ağzını möhürləyib Fizzəyə verdi. Soruşdum ki, ya Həzrət Əli (ə) məgər səndən başqası bu çörəkdən yeyə bilirmi ki, onun ağzını möhürləyirsən? Həzrət Əli (ə) buyurdu: «Torbanı möhürləməkdə məqsədim budur ki, mən olmayanda övladlarım bu çörəkləri yağda yumşaltmasınlar». Müaviyə dedi: «Düz deyirsən, ey Əhnəf. Əli kimi olmaq kimsəyə müyəssər deyil. Kimsə onun fəzilətini inkar edə bilməz».

Həzrətin geyimi də yeməyinə uyğun idi. Paltarları cod parçadan olardı. Hansı ki, bu şəxs Şamdan savay bütün İslam məmləkətinin rəhbəri idi.

O, daim yalın torpaq üstə oturardı. Bu səbəbdən də ona Əbu-Turab (torpaq atası) deyərdilər. Evinin döşənəcəyi həsir idi. Ayaqqabısını özü yamayardı. Başqa işlərini də özü görərdi.

Həzrət Bəsrə valisi Osman ibn Hunəyfə yazdığı məktubda belə buyurur: «Mən sizin imamınız olduğum halda iki nimdaş libas, iki parça çörəklə kifayətlənmişəm. Hansı ki, ipəkdən libas geyməyə, ləziz xörəklər yeməyə imkanım var. Belə ki, nəfs istəkləri mənə qalib gələ bilmir». Həzrət buyurur: «Mən elə yeməklər yeyir, elə geyimlər geyirəm ki, bunu görən fəqirlər öz fəqirliyinə dözə bilsin». Başqa bir vaxtda həzrət belə buyurur: «Mən bilirəm ki, kimsə mənim kimi yaşaya bilməz. Amma imamla mə'mun arasında oxşarlıq da ola bilər. Belə ki, bacardığınız qədər mənim yolumu

.«gedin

## ƏLİNİN (Ə) ƏDALƏTİ VƏ HAQPƏRƏSTLİYİ

həzrət Əli (ə) haqq və ədalət kişisi idi. həzrət bu baxımdan o qədər ciddi idi ki, öz sevimli oğlunu həbəş qoşunu ilə bir tuturdu. Imam öz işçilərinə ciddi nəzarət edir, zalımları cəzalandırırdı ki, məzlumların haqqı itməsin. həzrət buyurur: «Mənim nəzərimdə məzlumlar əziz, sitəmkarlar isə zəlildirlər». həzrət Əlinin (ə) hökuməti ədalət, təqva, bərabərlik üzərində qurulmuşdu. O öz mühakimələrində yalnız haqqa əsaslanırdı. heç bir çətinlik onu tutduğu haqq yoldan döndərə bilməzdi. həzrət bəndələrin haqqına riayət olunmasında özünü Allah qarşısında məs'ul sayırdı. həzrət sözün əsil mə'nasında ictimai ədaləti bərpa etməyə çalışırdı. həzrət haqqa münasibətdə ən yaxın adamlarına belə ən kiçik işlərdə güzəştə getməzdi. Onun qardaşı Əqil öz maaşını artırmaq üçün nə qədər çalışdısa da, həzrət müsəlmanların beytül-malına toxunmadı. həzrət bu məsələ ilə bağlı buyurur: «And olsun Allaha, əgər gecəni tikan üstə başa vursam da, məni tikanlar üstə zəncirləsələr də, bu iş bəndələrə zülm etmiş halda qiyamət günü Allah və onun Peyğəmbəri ilə görüşməkdən yaxşıdır . . . And olsun Allaha, Əqil yoxsulluğun son həddində ikən sizin malınızdan bir qədər buğda istədi. Onun körpələrini səliqəsiz və çirkin halda gördüm. Onların çöhrələri torpağa bulaşıb qaralmışdı. Əqil öz xahişini tə'kidlə təkrarladı. O elə güman edirdi ki, dinimi ona satacaq, öz yolumdan dönəcəyəm. Mən bir parça dəmiri qızdırıb, ona yaxınlaşdırdım ki, ibrət götürsün. Onun ağrısından xəstə tək fəryad çəkdi. Az qaldı dəmirin hərarətindən yansın. Dedim ki, ey Əqil, analar əzanda ağlasın. Sən insanların oyun üçün düzəltdiyi bir parça dəmirə görə nalə çəkirsən. Amma məni Allahın öz qəzəbindən şö'ləndirdiyi oda çəkirsən. Sən bu kiçik ağrıdan nalə çəkirsənsə, mən cəhənnəm odundan nalə çəkməyim?! Bundan da maraqlısı bir şəxsin (Əş'əs ibn Qeys) bir payla yanımıza gəlməsi oldu. hədiyyə halva idi. Bu halva məndə ikrah yaratdı. Sanki ağız suyu ilə yoğrulmuşdu. Ona dedim: «Bu hədiyyədir, yoxsa zəkat, sədəqə? Sədəqə .«biz Əhli-beytə haramdır. Dedi: «Yox, nə sədəqədir, nə də zəkat, hədiyyədir

«.?Ona dedim: «Anan əzanda ağlasın, din pərdəsi altda bizi aldatmaqmı istəyirsən

And olsun Allaha, səma altda olanlarla birlikdə yeddi iqlimi mənə versələr ki, arpa qabığı aparan qarışqanın haqqını pozum, bu işi etmərəm. Sizin bu dünyanız mənim nəzərimdə çəyirtkənin ağzında yarpaqdan da dəyərsizdir. Əlinin (ə) ötəri dünya (ne'mətləri, davamsız ləzzətlərlə nə işi?!»(١)

Abdullah ibn Əbu-Rafe həzrətin vaxtında beytül-malın xəzinadarı idi. Həzrət Əlinin (ə) qızı qurban bayramında iştirak etmək üçün müvəqqəti olaraq Abdullahdan bir boyunbağı götürmüşdü. Həzrət qızının boynunda mirvari boyunbağını görüb, fəryad qopardı: «Bu boyunbağı haradandır?» Qız qorxu içində əsərək ərz etdi: «Bu boyunbağını Əbu-Rafedən bir neçə saatlıq götürmüşəm». Həzrət Əli (ə) Abdullahı çağırıb buyurdu: «Ey Əbu-Rafe, müsəlmanların malına xəyanətmi edirsən?» Əbu Rafe dedi: «Allaha pənah aparıram, əgər müsəlmanların malına xəyanət etmişəmsə!» Həzrət buyurdu: «Necə olur ki, beytül-maldakı boyunbağını məndən icazəsiz, müsəlmanların razılığı olmadan mənim qızıma verirsən?» Əbu-Rafe ərz etdi: «Ya Əmirəl-mö'minin, o sizin qızınızdır. Onu məndən əmanət götürüb. Mən özüm həmin boyunbağıya zaminəm». Həzrət buyurdu: «Elə bu gün onu yerinə qaytar. Məbada ikinci dəfə belə bir iş görəsən. Belə etsən, bil ki, səni cəzalandıracağam. Əgər qızım onu əmanət götürməmiş olsaydı, əli kəsilmiş ilk haşimi qadın olacaqdı». Həzrətin qızı bu sözləri eşidib ərz etdi: «Ya Əmirəl-mö'minin (ə), mən sənin qızınam. Bu şeylərdən istifadə etməkdə məndən də ləyaqətlisi varmı?» Həzrət buyurdu: «Ey Əlinin (ə) qızı, nəfs istəyin səni doğru yoldan azdırmasın. De görüm, bütün mühacir qadınlarmı bayramda belə boyunbağı (taxmışdı?» Sonra həzrət boyunbağını ondan aldı və yerinə qaytardı.(٢)

Təlhə və Zübeyr həzrət Əlinin (ə) xilafəti dövründə varlı olsalar da, həzrətdən umacaqları vardı. Həzrət onların bu istəklərini təəccüblə səh:١٧٧

---

.Нəһҹул-бəлағə» ٢١٥-ҹи хүтбə» [١١٣] -١

.Биһарул-əнвар», ۴٠-ҹы ҹилд, сəһ. ٣٧٧» [١١۴] -٢

qarşılayıb, hansı dəlilə əsaslandıqlarını soruşdu. Ərz etdilər: «Ömərin xilafəti dövründə bizim maaşımız daha çox idi». Həzrət buyurdu: «Deyin görüm, Peyğəmbərin dövründə sizin maaşınız nə qədər idi?» Ərz etdilər: «Başqaları kimi». Həzrət buyurdu: «İndi də sizin alacağınız başqaları qədər olacaq. Mən Peyğəmbərin yolunu gedim, yoxsa Ömərin yolunu?» Həzrətin məntiqi qarşısında cavab tapmayan Təlhə və Zübeyr dedi: «Bizim xidmətlərimiz var». Həzrət buyurdu: «Mənim xidmətlərim sizdən də çoxdur. Mən xəlifə olduğum halda ən fəqir adamla mənim aramda nə fərq görürsünüz?» Bir sözlə, Təlhə .və Zübeyr ümidlərini üzüb geri döndülər

Həzrət Əli (ə) bütün sahələrdə ədaləti qoruyurdu. Həqiqət nəyi tələb edirdisə, onu da yerinə yetirirdi. Onun öz əyalət hakimlərinə göndərdiyi məktublar hüquqi və əxalqi nəsihətlərlə zəngin idi. Mütəxəssislər həzrətin bu məktublarından xeyli istifadə etmişlər. Corci Zeydan «İslam mədəniyyəti tarixi» kitabında belə yazır: «Biz ki, nə Əlini (ə), nə də Müaviyəni görmüşük, onların haqqında necə mühakimə edə bilərik?» Xeyir belə deyil! Həzrət Əli (ə) və Müaviyədən qalmış məktublar on dörd əsr sonra onların .haqqında mühakimə yürütməyə ciddi əsas verir

Müaviyənin öz hakimlərinə yazdığı əksər məktublarından belə görünür ki, onun məqsədi xalqı əsarət altına almaq, var-dövlət toplamaq olmuşdur. Hakimlər xalqdan topladıqları məbləğin bir hissəsini özlərinə götürür, bir hissəsini isə Müaviyəyə göndərirdilər. Həzrət Əli (ə) isə bütün məktublarında öz hakimlərini pərhizkar olmağa, Allahdan qorxmağa, namaz və digər vacib əməlləri yerinə yetirməyə, oruc tutmağa, əmr be mə’ruf və nəhy əz münkərə, yoxsullarla mərhəmətli davranmağa, fəqirlərdən muğayət olmağa, imkansızlardan xəbərsiz qalmamağa çağırır. Həzrət tabeliyində olanlara bildirir ki, Allah onların bütün əməllərini görür və həyatın sonu bu dünyadan (köçdür.(١

Dar baxışlı insanlar belə düşünürlər ki, həzrət Əli (ə) siyasətçi olmamışdır. Onlar həzrətin Müaviyəni işdən dərhal kənarlaşdırmamasını, altı nəfərlik şurada Əbdürrəhman ibn Ovfun təklifi

ilə razılaşmamasını, Süffeyn döyüşündə Əmr Ası azad buraxmasını onun siyasətlə tanış olmaması ilə izah edirlər. Amma unutmaq olmaz ki, həzrət Əli (ə) səxavətli, nəcib, mərhəmətli, haqq-ədalət tərəfdarı olan bir insan idi. O, xalqa Müaviyə və onun kimi dünyapərəstlər tək rəhbərlik edə bilməzdi. Çünki həzrətin xilafəti ilahi bir xilafət idi. Bu xilafətdə ilahi əxlaq, haqq-ədalət prinsipləri əsas götürülmüşdü. Hiylə işlətmək, tələ qurmaq həzrət Əliyə (ə) yaraşmayan işlər idi. Onun belə yollara əl atmaması bu işləri bacarmaması demək deyildi. Həzrət özü bu barədə buyurur: «And olsun Allaha, Müaviyə məndən zirək, bacarıqlı deyil. O sadəcə hiylə işlədir, günaha batır». Başqa bir məqamda həzrət buyurur: «Əgər təqva olmasaydı, mən bütün ərəbdən zirək olardım. Amma Əlini (ə) başdan ayağa haqqın təcəllası bürümüşdü. O, haqqı deyirdi, haqqı .görürdü, haqqı axtarırdı, haqqı müdafiə edirdi

Həzrət Əlinin (ə) ədaləti haqqında belə bir əhvalat nəql olunur: «Əmarə Həmdaninin qızı Sudə həzrət Əlinin (ə) şəhadətindən sonra Müaviyəyə onun hakimi Bosr ibn Ərtatdan şikayət etdi. Müaviyə onu Siffeyn döyüşündə Əlini (ə) müdafiə etdiyi üçün qınadı və dedi: «İstəyin nədir ki, bura gəlmisən?» Sudə dedi: «Bosr bizim var-dövlətimizi aldı, kişilərimizi öldürdü. Sən Allah yanında hakimlərinə görə məs'ulsan. Biz nizam-intizamı qorumaq üçün sənə görə ona toxunmadıq. İndi mənim şikayətimə baxsan, sənə təşəkkür edərik, yoxsa səndən üz döndərərik». Müaviyə dedi: «Ey Sudə, məni :hədələyirsən?» Sudə başını aşağı salıb dedi

,Ya Rəbb, salam göndər sən o kəsə ki

.Ədalət dəfn oldu onunla sanki

Müaviyə soruşdu: «Kimi nəzərdə tutursan?» Sudə dedi: «And olsun Allaha, o Əmirəl-mö'minin Əli (ə) idi. Onun xilafəti dövründə bir nümayəndəsi ədalətdən kənar rəftar etdiyi üçün həzrətin yanına şikayətə getdim. Xidmətinə çatdığım vaxt həzrət namaz üçün müsəllada dayanmışdı. Təkbir demək istədiyi vaxt məni görüb dayandı və mehribanlıqla gəlişimin səbəbini soruşdu. Mən onun nümayəndəsinin ədalətsizliyi haqqında danışdım. Bu

sözləri eşitdikdə həzrətin gözləri yaşardı, üzünü göyə tutub dedi: «Ey qahir və qadir Allah, Sən bilirsən ki, mən həmin şəxsi xalqa zülm-sitəm üçün göndərməmişəm». Sonra cibindən bir dəri parçası çıxarıb həmin nümayəndəyə məzəmmətli bir məktub yazdı. Əmr etdi ki, həmin şəxs bir daha xalqın qapısına getməsin və onun yerinə bir başqası .göndəriləcək

Müaviyə bu sözləri eşitdikdən sonra katibinə göstəriş verdi ki, Bosra məktub yazsın. Müaviyə məktubunda Bosra əmr edirdi ki, Sudənin qəbiləsindən aldığı mal-mülki (onlara qaytarsın.(۱)

Bəli, həzrət Əli (ə) öz hakimlərinə yazdığı bütün məktublarda onları ədalətə çağırırdı. Bunu Corci Zeydan da öz kitabında təsdiq edir. Əgər həzrətin hakimiyyəti uzun çəksəydi, onun beş illik hakimiyyəti dövründə daxili müharibələr, hərc-mərclik olmasaydı, müsəlman cəmiyyətinin vəziyyəti başqa cür olardı. Çünki həzrətin hakimiyyət üsulu ədalətin zahiri bir nümunəsi idi. Bu mövzunu daha da aydınlaşdırmaq üçün həzrətin Malik Əştərə yazdığı əhdnaməyə nəzər salaq: «Ey Malik, səni elə bir yerə göndərmişəm ki, orada səndən qabaq zalımlar hakimlik edib. Xalq sənin işinə elə baxır ki, sən əvvəlki hakimlərin işinə elə baxırsan. Sən əvvəlkilərin haqqında nə deyirsənsə, onlar da sənin haqqında onu deyirlər. Sən yaxşıları Allahın onlar haqqında xalqın dilinə gətirdiyi sözlərlə tanıyarsan. Ona görə də sənin üçün ən yaxşı ehtiyat yaxşı əməl olsun. Ey Malik, nəfs istəklərinin cilovunu əlinə al. Nəfsini caiz və halal olmayan şeylərdən qoru. Nəfsin istəyib-istəmədiyi şeylərdə xəsislik etmək ədalət və insafdır. Xalqla qəlbən mehriban ol, onlarla xoş və dostcasına rəftar et. Onları parçalamağı qənimət sayan heyvan kimi rəftar etmə. Çünki onlar iki dəstədirlər: Ya din qardaşlarındır, ya da sənin kimi Allah məxluqlarıdır. Onlardan xətalar baş verir, bilərəkdən və ya bilməyərəkdən günaha yol verirlər. Buna görə də onları bağışla. Necə ki, özünün bağışlanmağını istəyirsən. Çünki sən onların rəisisən. Səni onlara hakim tə'yin edən səndən yuxarıdır. Allah isə səni vali tə'yin edəndən də uca və üstündür. Allah səndən onların istəklərini



---

۱- [۱۱۶] «Кəшфул-ғəммə» сəh. ۵۰.

.yerinə yetirməyini gözləyir və onları sənin üçün imtahan qərar vermişdir

Ey Malik, məbada Allahla döyüşə çıxasan. Çünki nə Onun qəzəbi qarşısında durmaq qüdrətin var, nə də mərhəmətindən ehtiyacsızsan. Başqalarını bağışladığın üçün peşiman olma. Başqalarına verdiyin cəza səni sevindirməsin. Udmaqla ucalacağın qəzəbə tələsmə. Sən deməməlisən ki, mənə əmirlik verilib, mən göstəriş verirəm. Çünki bu üsul qəlbin xarabalığına, dininin zəifləməsinə, hadisələrin yaxınlaşmasına və .ne'mətlərin əvəz olmasına səbəb olar

Ey Malik, hakimlik sənə qürur gətirəndə səndən uca olan Allahın əzəmətinə, özünə münasibətdə onun qüdrətinə, gücün çatmayacaq işlərə nəzər sal. Bil ki, belə bir baxış .«və düşüncə sənin azğınlığını və təkəbbürünü azaldar

Göründüyü kimi, həzrət Əlinin (ə) bütün göstərişləri təqva, ədalət, haqpərəstlik, mehribanlıq haqqındadır. Həzrət (ə) təkcə Malikə belə tövsiyə verməyib. O bütün .hakimlərinə bu sayaq nəsihətlər buyurmuşdur

## ƏLİNİN (Ə) MƏHƏBBƏTİ VƏ CAZİBƏSİ

Hər bir cəmiyyətin möhkəmliyi ondakı fərdlər arasındakı məhəbbət və cazibədən asılıdır. Məhəbbət və cazibə isə pak və sağlam qəlbdə tərbiyə oluna bilər. Bu sifətlərə malik olan insan başqalarına canıyananlıq göstərir, hətta onların asayişini öz rahatlığından üstün tutur. Həzrət Əli (ə) məhəbbət və cazibə məzhəri idi. O əzab-əziyyət çəkir, işləyir, alın təri axıdır, nəhayətdə öz zəhmətinin qazancını yoxsullara və .imkansızlara sərf edirdi

Həzrət Əli (ə) ehtiyaclılar üçün böyük bir sığınacaq idi. O, yetimlərə ata, dul qadınlara yardımçı, zəiflərə arxa idi. Xilafət dövründə gecələr evdən çıxar, qaranlıqda miskinlərə və kimsəsiz qadınlara xurma və çörək aparardı. Həzrət götürdüyü azuqə və pulu .özünü tanıtdırmadan paylayırdı. Bu xeyirxah insanı kimsə tanımazdı

Həzrət harada bir yetim görərdisə, mehriban ata tək nəvazişlə onun başını sığallayar, yemək və geyim alardı. Həzrət bir gün küçə ilə getdiyi vaxt çiynində məşk aparan bir qadın görür. Məşkin ağırlığından qadın ikiqat

əyilmiş vəziyyətdə olur. Həzrət bu səhnəyə dözə bilməyib, məşki qadından alıb onun yanına düşür və bu ağır yükü mənzil başına çatdırır. Həzrət qadından dolanışıq vəziyyəti barədə soruşur. Qadın isə həzrəti tanımdan deyir: «Ərimi Əli (ə) döyüşə göndərdi, o da şəhadətə çatdı. Mən özümü və balalarımı saxlamaq üçün camaatın qapısında işləməyə məcburam». Qadının sözləri həzrət Əlini (ə) silkələyir. Sübh açılan kimi böyük bir zənbili buğda və xurma ilə doldurub qadının evinə aparır və deyir: «Mən dünən sənin məşkini götürən adamam». Qadın azuqəni alıb həzrətə təşəkkür edir və deyir: «Mənim övladlarım, yetim, başsız qaldılar. Əli (ə) ilə mənim aramda Allah özü hesab çəksin!» Həzrət evə daxil olub deyir: «Mən sənə xidmət üçün, savab qazanmaq üçün hazıram. Mən uşaqları saxlayım, sən çörək bişir». Qadın çörək bişirməklə məşğul olur, həzrət Əli (ə) isə dizi üstə oturub yetim uşaqları dalına mindirir və xəfif-xəfif ağlayır. Həzrət onların ağzına xurma qoyaraq deyir: «Ey mənim balalarım, əgər Əli (ə) sizin işinizə yaramasa, onu halal edin. Onun pis məqsədi olmayıb». Təndir hazır olduqdan sonra həzrət özünə deyir: «Ey Əli (ə), atəşin istiliyini hiss et, cəhənnəm odundan qorx. Yetimlərin və kimsəsiz qadınların halına yanmayanların vəziyyətindən xəbərdar ol». Bu vaxt qonşu qadın həyətə daxil olur. O, həzrəti tanıyıb, ev sahibəsinə onun kim olduğunu bildirir. Həzrəti tanıyan ev sahibəsi ona yaxınlaşıb peşimançılığını bildirir və üzr istəyir. Həzrət buyurur: «Sənin bu işdə təqsirin yoxdur. Yetimlərin və kimsəsizlərin halına yanmaq mənim vəzifəmdir».(١)

Həzrət xalqla ünsiyyətdə hədsiz dərəcədə sadə və mehriban idi. Onun böyüklüyü və təvazösü dillər əzbəri idi. Hətta düşmənlər həzrətin bu fəzilətlərini e’tiraf edirlər. Həzrətin qatı düşmənlərindən olan Müaviyə deyir: «Əgər mən məğlub olsam və Əli (ə) qalib gəlsə qorxum yoxdur. Çünki ondan üzr istəmək kifayətdir. O, böyük və mərhəmətli insandır».

Həzrət öz qoşununa daim belə deyərdi: «Heç vaxt qaçan düşmənin ardınca getməyin, yaralılara dərman verin, əsirlərlə xoş rəftar edin». Həzrət Cəməl döyüşündə qalib gəldikdən sonra Ayişəni böyük hörmətlə



---

١- [١١٧] «Биһарул-әнвар» ٤١-чи чилд, сəh. ٥٢.

Mədinəyə göndərdi. Bu fitnəni törətməkdə payı olan Abdullah ibn Zübeyr, Mərvan ibn .Həkəm və bir çox başqaları bağışlandılar

Həzrətin məhəbbətindən pay almayan yoxdu. O, qatili haqqında belə buyurur: «Onunla keçinin, ac və susuz saxlamayın». Əlbəttə ki, bu sayaq hisslər yalnız həzrətin pak qəlbində yer tapa bilərdi. İbn Əbil-Hədid deyir: «Sübhanəllah! Bir insanda bu qədər .«fəzilət?! Əlinin (ə) şəxsiyyətinin bəyanı kimsənin gücü çatası iş deyil

## BEŞİNCİ HİSSƏ

## HƏZRƏTİN İMAMƏTİ HAQQINDA

Həzrət Peyğəmbərin vəfatından sonra onun canişini olaraq İslam ümmətinə rəhbərlik üçün imamın mövcudluğu bütün firqələrin qəbul etdiyi bir həqiqətdir.Çünki heç bir qurum və cəmiyyət rəyasətsiz və rəhbərsiz yaşaya bilməz. Amma belə bir sual yaranır ki, Peyğəmbərin canişini kim ola bilər? Bu şəxsdə hansı xüsusiyyətlər olmalıdır? Sünnə əhli belə qəbul etmişdir ki, Peyğəmbərdən sonra müsəlmanlara rəhbər xalq tərəfindən seçilməlidir. Xalq tərəfindən seçilmiş xəlifənin isə mə’sumluğundan günahsızlığından danışmağa dəyməz. Beləcə sünni əqidəsinə görə İslami xilafət dünyəvi hakimiyyətlə bir sırada dayanır. Sadəcə, xalq tərəfindən seçilmiş rəhbər Quran pirinsiplərinə .əsaslanır

Şiə əqidəsinə görə isə Peyğəmbərdən sonra imamət məqamı ilahi bir məqamdır. Həzrət Peyğəmbər Allah tərəfindən göndərildiyi kimi, imam da Allah tərəfindən tə’yin olunmalıdır. Rəhbər əxlaqi fəzilətlərə malik olmaqla yanaşı, həm də pak olmalıdır. Onun paklığı və günahsızlığı ilkin şərt sayılır. Pak adamı tanımaq isə xalqın işi deyil. Ona görə də xəlifə seçimində müsəlmanların iştirakı şərt sayılmır. Hətta xalqın bir şəxsə .tabe olması da həmin şəxsin imamət dəlili deyil

İmam sözünü lüğət mə’nasında hər bir rəhbərə aid etmək olar. Məsələn, cəmiyyət namazında pişnamaz dayanan şəxs də imam adlanır. Hətta küfür başçılarına da imam .demək olar

Amma kəlam elmi baxımından imamət dedikdə Peyğəmbərin (s) ilahi canişininin rəhbərliyi nəzərdə tutulur. Belə bir rəhbərə itaət etmək hamının vəzifəsidir. Belə ki, Peyğəmbərin (s) canişini Qur’an pirinsipləri əsasında hakimlik etməli, maarif və dini .əhkamı xalqa çatdırmalı, mə’nəvi həyatın dirçəlişinə başçılıq etməlidir

Şiələrin imamət məsələsində başqa bir dəlili Allahın lütfüdür. Allah bəşəriyyətə lütf göstərərək Peyğəmbərini göndərmişdir. Allah heç zaman yaratdığı bəşəri ilahi -rəhbərsiz qoymur. Allah-təala Qur’ani

Kərimdə buyurur: «Allah mö’minlərə lütf və mərhəmət göstərdi. Çünki onların öz içərisindən özlərinə Allahın ayələrini oxuyan, onları təmizləyən, onlara kitabı və hikməti öyrədən bir Peyğəmbər göndərdi. Halbuki, bundan əvvəl onlar açıq-aydın (zəlalət içində idilər».(۱

Lütf dəlilini sünnə əhli Peyğəmbərə (s) münasibətdə qəbul edir. Allahın lütfü kamil olmasına baxmayaraq, onlar imama münasibətdə bu həqiqəti inkar edirlər. Hansı ki, ilahi lütfə əsasən, Peyğəmbərdən sonra imam Allah tərəfindən tə’yin edilməlidir. Peyğəmbər (s) öz həyatı dövründə imamı xalqa tanıtdırmalıdır. Bu məsələ Qədire-Xumda nazil olmuş təbliğ ayəsi vasitəsi ilə də təsdiqlənir. Xacə Nəsirəddin Tusi .«Təcridul-e’tiqad» kitabında imamət məsələsinin bir lütf olduğunu təsdiqləyir

Lütf dəlilindən savay bir çox Qur’an ayələri də ilahi imamət və xilafətin gerçəkliyini təsdiq edir. Məsələn, ayələrdən birində belə buyurulur: «Sənin Rəbbin mələklərə «Mən yer üzündə bir xəlifə yaradacağam» dedi».(۲) Başqa bir ayədə Allah həzrət İbrahimə (belə buyurur: «Səni insanlara imam tə’yin edəcəyəm».(۳

Ayənin davamında isə belə buyurulur: «Zalımlar mənim imamlığıma nail olmazlar». Ayədən göründüyü kimi Allah yalnız mə’sum insanları imamət, rəhbərlik məqamına seçir. Əllamə Təbatəbai «Əl-mizan» təfsirində yazır: «Qur’anın müxtəlif ayələrindən bu mövzu ilə bağlı aydın olur ki, harada imam adı çəkilirsə, təfsir ünvanında onun ardınca hidayət sözü də zikr olunur. Qur’anda buyurulur: «Biz onları əmrimizlə doğru yola (gətirən imamlar etdik».(۴

Başqa diqqət yetiriləsi bir mövzu Allahın imamət məqamı haqqında belə buyurmasıdır: «Beləcə, İbrahimə göylərin və yerin mülkünü, səltənətini göstərdik ki, tam qənaətlə .inananlardan olsun».(۵) Ayədən göründüyü kimi imam yəqin məqamına sahib olmalıdır

Şiə əqidəsinə görə, mə’sum imamlar həzrət Məhəmmədə (s) qədər

səh:۱۸۵

---

.Али-Имран» сурәси, ајә ۱۶۴» [۱۱۸] -۱

.Бәгәрә» сурәси, ајә ۳۰» [۱۱۹] -۲

۳- [۱۲۰] «Бəгəрə» сурəси, ۱۲۴.

۴- [۱۲۱] «Əнбиjа» сурəси, аjə ۷۳.

۵- [۱۲۲] «Əн’ам» сурəси, аjə ۷۵.

olan peyğəmbərlərdən fəzilətlidirlər. Belə bir sual yarana bilər ki, yalnız imamət məqamına malik olan həzrət Əli (ə) İbrahim kimi həm peyğəmbər, həm də imamət məqamına malik olan peyğəmbərdən fəzilətli ola bilərmi? Bu sualın cavabında deyə bilərik ki, imamət məqamının müxtəlif dərəcələri vardır. Peyğəmbərlər də peyğəmbərlikdə eyni dərəcədə olmamışlar. Həzrət Əli (ə) ən kamil imamət məqamına malik olan şəxsdir. Qeyd olunduğu kimi imam yəqin məqamına da sahib olmalıdır. Allah-təala belə insanlara səmaların sirrini açdığını bəyan edir. Həzrət Əlinin (ə) yəqinliyi həzrət İbrahimin yəqinliyindən üstün olmuşdur. Məhz yəqin məqamının üstünlüyü səbəbindən həzrəti İbrahim peyğəmbərdən fəzilətli saya bilərik. Məsələn, İbrahim öz Allahından diləyir ki, ölüləri necə diriltdiyini ona göstərsin. Həzrət Əli (ə) isə belə buyurur: «Əgər bütün hicablar aradan qaldırılsa, mənim yəqinliyimə bir zərrə də əlavə olmaz».

Bu da mə'lumdur ki, İslam Peyğəmbəri (s) bütün ilahi elmlərin tərcümanı olmuşdur. Qur'anda onun haqqında buyurulur: «Ona çox qüvvətli olan öyrətdi».(۱) Şübhəsiz ki, bu sayaq elmə malik olmayan şəxs həzrət Məhəmmədin (s) yerində otura bilməzdi. Bir sözlə, imamın da Peyğəmbər kimi qüdsi ruhu olmalıdır.

Fərz edin ki, çoxlu xəstəsi olan vicdanlı bir həkim bir müddət səfərə çıxmalı olur. Mə'lum məsələdir ki, o səfərə çıxdığı müddətdə bu xəstələrin həkimə ehtiyacı olasıdır. Ona görə də həmin həkim səfərə çıxmazdan qabaq yerində inandığı bir həkimi qoyur. Həzrət Peyğəmbər (s) ruhların həkimi idi. Necə ola bilərdi ki, o rehlət edəcəyini bildiyi halda yerində başqa bir ləyaqətli canişin qoymayaydı?!

İmam dinin mühafizi, müsəlmanlar arasında nizamın əsası, dünyanın islah səbəbi, mö'minlərin izzətidir. İmamət çiçəklənməkdə olan İslamın köküdür. İmam Allahın halalını halal, haramını haram bilir. O, ilahi hədlərin icrası üçün ayağa qalxır və dini müdafiə edir. İmam nuru bütün yer üzünü bürümüş günəş kimidir. Onun olduğu üfüqə əl çatmır. İmam on dörd gecəlik ay tək



---

۱- [۱۲۳] «Нәҹм» сурәси, ајә ۵.

nuranidir. O, qaranlıqlarda yol göstərən hidayət ulduzudur. İmam təşnələr üçün şirin !sudur. İmam xalq arasında Allahın əmini, qalibidir

## HƏZRƏT ƏLİ (Ə) HAQQINDA NAZİL OLMUŞ QUR’AN AYƏLƏRİ

.۱ «Təbliğ» ayəsi: «Ya Peyğəmbər, Rəbbin tərəfindən sənə nazil olanı bəyan et. Əgər etməsən, Allahın risalətini yerinə yetirməmiş olarsan. Allah səni insanlardan qoruyacaq. Allah kafir camaatı düz yola yönəltməz».(۱) Təfsirçi və tarixçilərin həzrət Əliyə (ə) aid etdikləri üç yüz Qur’an ayəsindən biri olan bu ayənin həzrət Əliyə (ə) aid olmasını Əbu-İshaq Sə’ləbi, Təbəri, İbn-Səbbağ Maliki və bir çox başqa alimlər .təsdiqləyirlər

.۲ «Vilayət» ayəsi: «Sizin ixtiyar sahibiniz Allah, Onun rəsulu və iman gətirib namaz qılan, rüku halında zəkat verənlərdir».(۲) Bu ayənin həzrət Əliyə (ə) aid olduğunu Fəxr Razi, .Nişaburi, Zəməxşəri kimi böyük alimlər təsdiqləyirlər

.۳ «Nisa» surəsi, ayə ۵۹: «Ey iman gətirənlər, Allaha, Peyğəmbərə və özünüzdən olan .«ixtiyar sahiblərinə itaət edin

«Mübahilə» ayəsi: «Sənə göndərilən bilikdən sonra buna dair səninlə mübahisə edənlər olsa, onlara de ki, gəlin biz də oğlanlarımızı, siz də oğlanlarınızı, biz də qadınlarımızı, siz də qadınlarınızı, biz də özümüzü, siz də özünüzü çağıraq. Sonra isə Allaha yalvarıb, yalançılara Allahdan lə’nət istəyək».(۳) Tarixçilər və təfsirçilər bildirirlər ki, həzrət Peyğəmbər (s) öz yaxınlarını sadaladıqda Əlini (ə), Fatiməni və Həsənlə Hüseyni .nəzərdə tutmuşdur

.۴ «Təthir» ayəsi: «Evlərinizdə qərar tutun. İlkin cahiliyyət dövründəki kimi açıq-saçıq olmayın. Namaz qılın, zəkat verin, Allaha və Onun rəsuluna itaət edin. Siz ey ev əhli! (Allah sizdən çirkinliyi yox etmək və sizi pak etmək istəyir».(۴



---

۱- [۱۲۴] «Маидә» сурәси, ајә ۶۷.

۲- [۱۲۵] «Маидә» сурәси, ајә ۵۵.

۳- [۱۲۶] «Али-Имран» сурәси, ајә ۶۱.

Təbəri, Fəxr Razi və bu kimi digər böyük sünni alimləri də uyğun ayənin həzrət Əli (ə) .haqqında nazil olduğunu təsdiqləyirlər

Bəraət» surəsi: Müxtəlif firqə alimlərinin bildirdiyinə görə «Bəraət» surəsinin ayələri» .۵ nazil olduqda həzrət Peyğəmbər (s) həmin surəni müşriklərə oxumaq üçün Əbu-Bəkri Məkkəyə göndərdi. Əbu-Bəkr yola düşdükdən sonra Cəbrail nazil oldu və Peyğəmbərə (s) salamdan sonra ərz etdi ki, bu işi sənin özündən olan bir kəs görməlidir. Həzrət Peyğəmbər (s) dərhal Əlini (ə) çağırdı və öz dəvəsini verib Əbu-Bəkrə çatmasını tapşırdı. Həzrət Əli (ə) Peyğəmbərin göstərişi əsasında Əbu-Bəkrə çatıb «Bəraət» .ayəsini ondan aldı və özü müşriklərə oxumaq üçün Məkkəyə yola düşdü

Məvəddət» ayəsi: «Allah iman gətirib yaxşı əməllər edən bəndələrinə bununla müjdə» .۶ verir. Ya Peyğəmbər (s), de ki, mən sizdən risalətim müqabilində Əhli-beytimə məhəbbətdən başqa bir şey istəmirəm».(۱) Zəməxşəri, Gənci Şafei və başqa alimlər nəql edirlər ki, ayə nazil olduğu vaxt Peyğəmbərdən Əhli-beyt haqqında soruşdular. Həzrət Peyğəmbər (s) buyurdu: «Həzrət Əli (ə), Fatimə və onların iki oğlu mənim əhli-.«beytimdir

Rə'd» surəsinin ۴۳-cü ayəsi: «Onlara belə cavab ver: «Mənimlə sizin aranızda Allahın» .۷ və kitabı bilənin şahid olması yetər». Əbu-Səid Xidri deyir: «Həzrət Peyğəmbərdən kitabı bilən kəsin kim olduğu haqqında soruşdum. Həzrət buyurdu: «Həmin şəxs (qardaşım Əli (ə) ibn Əbi-Talibdir».(۲)

.Bəli, həzrət Əli (ə) haqqında nazil olmuş ayələrin sayı üç yüzü keçir

### HƏZRƏT ƏLİ (Ə) HAQQINDA PEYĞƏMBƏR (S) HƏDİSLƏRİ

Qədir» hədisi: «Bütün firqələrdən olan məşhur alimlər təsdiq edirlər ki, vida» .۱ həccindən qayıdan zaman həzrət Peyğəmbər (s) Qədire-Xumda dayanıb buyurdu: .««Mən hər kəsin ixtiyar sahibiyəmsə, Əli (ə) də onun ixtiyar sahibidir

Mənzələt» hədisi: «Əhməd ibn Hənbəl, Şeyx Süleyman Bəlxi, İbn Səbbağ Maliki və bir» .۲ (başqa alimlər nəql edirlər ki, həzrət Peyğəmbər (s

١- [١٢٨] «Шура» сурәси, ајә ٢٣.

٢- [١٢٩] «Шәваһидут-тәнзил», ١-чи чилд, сәһ. ٣٠٧.

.«buyurdu: «Sən (Əli (ə)) mənim üçün Harun Musa üçün olduğu kimisən

Yəvmul-inzar» hədisi: «Əksər mö'təbər kitablarda nəql olunmuşdur ki, həzrət» .٣ Peyğəmbər (s) buyurmuşdur: «Sən (Əli (ə)) mənim qardaşım, vəzirim, varisim və (məndən sonra canişinimsən».(١)

Səqələyn» hədisi: «Əksər firqələrin mö'təbər kitablarında nəql olunmuşdur ki, həzrət» .۴ Peyğəmbər buyurdu: «Mən sizin aranızda iki böyük və ağır əmanət qoyuram: Allahın kitabı və itrətim (Əhli-beyt). Bu iki şey behiştdə mənə çatanadək bir-birindən .«ayrılmaz

Səfinə» hədisi: İbn-Abbas və başqa rəvayətçilər nəql edirlər ki, həzrət Peyğəmbər» .۵ (s) buyurdu: «Mənim ailəmin misalı Nuhun gəmisinin dastanı kimidir. Ona süvar olan .«nicat tapdı, ondan üz çevirən qərq oldu

Haqq» hədisi: «Əksər firqələrdən olan alimlər nəql edirlər ki, həzrət Peyğəmbər (s)» .۶ .«buyurdu: «Əli (ə) həmişə haqla olub, haqda Əli (ə) ilə

Bu sayaq hədislər şiə və sünni mənbələrində kifayət qədərdir. Biz qeyd etdiyimiz .hədislərlə kifayətlənirik

## HƏZRƏT ƏLİ (Ə) HAQQINDA BAŞQALARININ NƏZƏRİ

Böyük mö'təzilə alimi «Nəhcül-bəlağə»nin şərhində deyir: «Fəziləti və üstünlüyü alimlər tərəfindən e'tiraf olunmuş bir şəxs haqqında nə deyim? Kimsə onun fəzilətini pərdələyə bilmədi. Bu ilahi nuru min bir hiylə ilə söndürməyə çalışdılar. Ona görə də həqiqətləri təhrif etdilər, onda eyb axtardılar. Hətta minbərlərdən ona lə'nət oxudular. .«.Onu dustaq edib, şəhadətə yetirdilər

Həzrət Əlinin (ə) fəzilətini düşmənlər də inkar edə bilməmişdir. Hətta hiyləgər Əmr As :da həzrətin tə'rifində qəsidələr yazmışdır

Ona çəkdiyimiz dağlar üzündən

.Cəhənnəmdə yanasıyıq sən və mən

hədisdə Allah-təala buyurur: «Əliyə (ə) itaət edən şəxs mənə itaət etməmiş olsa da, onu behiştə daxil edərəm. Əliyə (ə) itaətsizlik göstərən şəxs mənə itaət etsə də, onu cəhənnəmə ataram». Hənbəli firqəsinin qabaqcılı olan Əhməd ibn Hənbəl deyir: «Həzrət Əliyə (ə) nəsib olan fəzilətlər Peyğəmbər səhabələrindən kimsəyə nəsib olmamışdır».

Məşhur ingilis tədqiqatçısı Karlayl deyir: «Bizim onu dost bilməkdən, hətta sevməkdən başqa çarəmiz yoxdur».

## ƏLİDƏN (Ə) QEYRİLƏRİNİN İMAMƏTİNİN İNKARI

Həzrət Peyğəmbərdən sonrakı üç xəlifənin İslamdan qabaqkı dövrdə kafir olması kimsədə şübhə doğurmur. Həzrət Əli (ə) isə fitrətən müvəhhid olmuş, həzrət Peyğəmbərə (s) birinci iman gətirmişdir. Bu onun fəzilətini o birilərindən qat-qat üstün edir. Abdullah ibn Məs'uddan belə bir rəvayət nəql olunur: «Həzrət Peyğəmbər buyurmuşdur: İbrahimin «Pərvərdigara, məni və övladlarımı bütpərəstlikdən uzaq et» duası mənim və Əlinin (ə) halına şamildir. Heç birimiz heç vaxt bütpərəst olmamış, bütə səcdə etməmişik. Nəticədə Allah-təala məni Peyğəmbərliyə, Əlini (ə) isə canişinliyə seçmişdir».(١)

İkincisi, həmin üç xəlifə İslamı qəbul etdikdən sonra da zülmə yol vermişdir. Xəlifələr xilafət məsələsində Allahın göstərişinə açıq-aşkar müxalif çıxaraq, həmin məqamı qəsb etmişlər. Mö'təbər sünni kitabları sayılan «Səhihe-Müslim»də və «Səhihe-Buxari»də nəql olunur ki, həzrət Peyğəmbər dünyasını dəyəşdikdən sonra onun qızı Fatimə (s) Əbu-Bəkrin yanına gedib atasının irsini tələb etdi. Əbu-Bəkr dedi: «Peyğəmbər buyurub ki, biz peyğəmbərlərdən irs qalmır və hər nə qalırsa, sədəqədir». Bu rəvayətdə Əbu-Bəkrin Fatiməni irsdən məhrum etməsi açıq-aydın görünür. Hansı ki, onun bu hərəkəti Qur'ana zidd idi. Çünki Qur'anda peyğəmbərlərin övladlarına irs qoyması aşkar təsdiq edilən bir həqiqətdir. Qur'ani-Kərimdə



---

١- [١٣١] «Мəнагибе-Ибн Мəғази» сəh. ٢٧٦.

buyurulur: «Süleymana atası Davuddan irs qaldı».(١) Əbu-Bəkr öz mövqeyini sübuta yetirmək üçün yalançı şahidlər tutdu. Hansı ki, həzrət Fatimə (s) «Təthir» ayəsinə əsasən mə’sum idi. Onun iddiasının rədd olunması Allah sözünün rədd olunması .sayılırdı

Başqa bir tərəfdən həzrət Fatimənin (s) şahidi həzrət Əli (ə) idi. Hansı ki, həzrət Əli (ə) Fatimənin əri olduğu üçün Əbu-Bəkr tərəfindən qəbul edilmədi. Əbu-Bəkr zəkatın Qur’anda göstərilmiş tə’yinatına da əl qatdı. Bu məsələ ilə yaxından tanış olmaq üçün .«Əl-Cəvahiratun-nəyyirə» hənəfi kitabına müraciət edin

Ömər də eynən Əbu-Bəkr kimi Allahın qoyduğu hədləri pozurdu. Qur’ani-Kərimdə müvəqqəti nikah halal sayıldığı halda Ömər öz xilafəti dövründə onu haram bildirdi. Peyğəmbər (s) dövründə halal olmuş bir iş Ömərin dövründə haram sayılmağa başladı. Hansı ki, dində dəyişiklik etmək açıq-aşkar bid’ət idi. Ömərin şəriət hökmlərində apardığı dəyişikliklərdən biri də dəstəmazla bağlı idi. Onun göstərişi ilə adamlar məsh .çəkmək əvəzində ayaqlarını yumağa başladılar

Osmanın ilahi göstərişlərlə müxalifətçiliyini isə sübut etməyə ehtiyac yoxdur. Bu insan işi elə bir yerə çatdırdı ki, müsəlmanlar onun evinə hücum edib, qətlə yetirdilər. Hər üç xəlifənin Qur’an və Peyğəmbər sünnəsi ilə müxalifətçiliyi haqqında yetərincə mə’lumat vardır. Amma kimsə həzrət Əlinin (ə) ilahi göstərişlərə əl qatdığını iddia edə bilməz. Xəlifələrin özlərinin də dini mübahisəli məsələlərdə Əliyə (ə) üz tutması, ondan yardım .istəməsi deyilənlərin əyani sübutudur

## SÜNNƏ ƏHLİNİN DƏLİLLƏRİNİN İNKARI

Birinci dəlil: Sünni alimləri iddia edirlər ki, Əbu-Bəkr hicrət zamanı fədakarlıq



---

.Нəмл» сурəси, ajə ١۶» [١٣٢] -١

.göstərdiyi üçün xəlifəliyə daha layiqli idi

Birinci dəlilin inkarı: Hicrət zamanı Əbu-Bəkrin Peyğəmbərlə (s) birlikdə Məkkədən çıxması onların təsadüfi görüşü nəticəsində olmuşdur. Təbəri öz tarix kitabının üçüncü cüz’ündə bu görüşün təsadüfi olduğunu bildirir. Bundan əlavə, ünsiyyət, yoldaşlıq fəzilət əlaməti deyil. Həzrət Yusif zindanda iki kafirlə birlikdə qalmışdı. Göründüyü kimi, .əqidəcə düşmən olan insan da yoldaş ola bilər

İkinci dəlil: Sünni alimləri iddia edirlər ki, Peyğəmbər xəstələndiyi vaxt Əbu-Bəkr .pişnamaz dayandığından onu daha fəzilətli hesab etməliyik

İkinci dəlilin inkarı: Əgər müsəlmanlara pişnamaz dayanmaq xəlifəlik me’yarı sayıla bilərsə, onda xəlifəliyə İtab ibn Üsəyd seçilməli idi. Çünki Məkkənin fəthi zamanı həzrət Peyğəmbər Məkkədə olduğu halda İtab camaat namazında imam dayanmışdı. Bundan əlavə, Peyğəmbər (s) xəstələndiyi vaxt pişnamaz dayanmaq üçün Əbu-Bəkri göndərməmişdi. Əbu-Bəkr özbaşına olaraq Bilalın azan səsindən sonra namazda pişnamaz durmuşdu. Hansı ki, Əbu-Bəkrin pişnamaz dayandığını eşidən Peyğəmbər .(s) yataqdan qalxıb məscidə tələsmişdi

Üçüncü dəlil: Sünni mənbələrində nəql olunur ki, həzrət Peyğəmbər (s) buyurmuşdur: .«Məndən sonra bu iki nəfərə (Əbu-Bəkr və Ömərə) iqtida edin

Üçüncü dəlilin inkarı: Əgər bu hədisi düzgün saysaq, sünni mənbələrində həzrət Əli (ə) haqqında nəql olunmuş hədislərin taleyi necə olmalıdır? Mümkündürmü ki, həzrət Peyğəmbər (s) həm Əbu-Bəkri, həm də Əlini (ə) özü üçün canişin tə’yin etsin? Əgər Peyğəmbər (s) bu iki nəfəri rəhbər tə’yin etmişdisə, nə üçün Səqifədə altı nəfərdən ibarət şura toplandı? Doğrudan da, Peyğəmbərin belə buyurduğu vardısa, nə üçün ?Əbu-Bəkr ətrafdakı adamlar tərəfindən seçilməli idi

Sünni alimlərinin söhbətlərində və yazılarında bu sayaq dəlillər kifayət qədərdir. Bütün .bu yanlış dəlillər şiə alimləri tərəfindən yetərincə cavablandırılmışdır

### HƏZRƏT ƏLİNİN (Ə) İMAMƏTİNİ TƏSDİQ EDƏN ƏQLİ DƏLİLLƏR

,Birinci dəlil: Həzrət Peyğəmbərin (s) vəhy və Qur’an sahibi olması

yaranış sirlərindən xəbərdarlığı, kamal və əxlaq baxımından birinciliyi şiə və sünnilər .tərəfindən yekdil olaraq qəbul edilmişdir

Öncə qeyd etməliyik ki, həzrət Peyğəmbərin (s) canişini kim olursa olsun, düz adam olmalıdır. Bütün zəruri şərtləri kənara qoyub yalnız insanın düzlüyünü me'yar götürək. Çünki düz olmayan adamın xalqın işinə qatışmaq haqqı yoxdur. Belə bir sifət adi insanlar üçün adi bir şey olsa da, müsəlmanların xəlifəsi üçün son dərəcə zəruridir. Düzgünlüyün əlamətlərindən biri budur ki, insan öz haqqına qane olsun. Amma iki şəxs .bir məqama iddialıdırsa, onların hər ikisini düzgün saymaq olmaz

Həzrət Peyğəmbərdən (s) sonra İslam ümməti arasında yaranan ixtilaflı məsələlərdən biri xilafət məsələsi idi. Peyğəmbərdən (s) sonra ilkin xəlifə şiələrin nəzərincə həzrət Əli (ə), sünnülərin nəzərincə isə Əbu-Bəkr olmalı idi. Həzrət Əli (ə) iddia edirdi ki, imamət məqamı ilahi bir məqamdır və həzrət Peyğəmbər (s) Allahın əmri ilə onu öz canişini tə'yin etmişdir. Əbu-Bəkr isə Səqifədəki şuranın qərarına əsasən xəlifəliyi öz .haqqı sayırdı. Biz iki iddiadan birini qəbul etməyə məcburuq

Məsələni riyazi baxımdan şərh etməyə çalışaq. Əgər şiələrin əqidəsini əsas götürsək, Əbu-Bəkri yalançı və xilafət məqamını qəsb etmiş adam kimi tanımalıyıq. Amma sünnilərin əqidəsini əsas götürdükdə, Əbu-Bəkri haqlı saymalı, həzrət Əlini (ə) yalançı kimi qəbul etməliyik. Biz sünnə əhlindən soruşuruq: «Əgər Əli (ə) düz adam deyildisə, nə üçün üç xəlifədən sonra xalq onun ardınca gəldi və xəlifəliyə məcbur etdi? Bə'zi sünni alimləri şiələrin məntiqi qarşısında söz tapmayıb, bəhanə gətirirlər ki, həzrət Əli (ə) özü xilafəti istəməyib və Əbu-Bəkrin xəlifəliyi ilə razılaşıb. Amma onların nəzərinə çatdırmalıyıq ki, Əlini (ə) Əbu-Bəkrin yanına məcburi şəkildə gətirdilər. Fatimə dünyasını dəyişənədək həzrət Əli (ə) Əbu-Bəkrə bey'ət etmədi. İkincisi, məcburi .bey'əti razılıq saymaq olmaz

İkinci dəlil: Tutaq ki, imamət ilahi məqam deyil və həzrət Peyğəmbər İslam ümməti üçün canişin tə'yin etməmişdir. Belə olduğu halda xəlifə seçimində bütün müsəlman qəbilələrinin iştirakı zəruri olur. Hansı ki, Xəzrəc, bəni-Haşim və bir çox məntəqə müsəlmanları şura məsələsindən xəbərsiz olmuşlar. Səhabələrin də bir çoxu Əbu-Bəkrə bey'ət

etməmişdir. Əslində Səqifədəki şuranın qərarı bir fitnə idi. Burada Əbu-Bəkr, Ömər və Əbu-Übeydənin əvvəlcədən hazırladığı plan əsasında hərəkət edilirdi. Onların məqsədi .haşimiləri xilafət məsələsindən kənarlaşdırmaq olmuşdu

Əgər Səqifədə toplanmış şuranı həqiqi şura saysaq da, məsələ həll olunmamış qalır. Əgər xəlifəni xalq seçirsə, elə bir adam seçilməlidir ki, onun ruhani və əxlaqi keyfiyyətləri başqalarından üstün olsun. Sünnə əhlindən soruşuruq: «Ümmətin ən fəzilətlisi və üstünü kim idi? Şücaətdə, səxavətdə, mühakimədə, hikmətdə, elmdə, ədalətdə, təqvada və sair müsbət səciyyələrdə həzrət Əli (ə) üstün idi, yoxsa Əbu-Bəkr? Əgər həzrət Peyğəmbər (s) Əlinin (ə) fəzilətləri barədə dəfələrlə danışmışsa və sünnə əhli bu buyuruqları qəbul edirsə, nə üçün xəlifəliyə başqası seçilməli idi? Məgər Qəzzali, ibn Əbil-Hədid kimi məşhur sünni alimlərinin mövqeyi sünnə əhlinə mə’lum deyilmi? Onlar öz kitablarında yazırlar: «Əbu-Bəkr minbərə çıxıb dedi: «Bir halda ki, Əli .»(ə) sizin aranızdadır, məni azad buraxın. Mən sizin aranızda hamıdan üstünü deyiləm

Bəli, həzrət Əli (ə) xilafətə daha çox layiq olmuşdur. Bütün digər şərtləri kənara qoyub sırf fəzilət baxımından məsələyə yanaşsaq, yenə də xəlifəlik Əlinin (ə) haqqı olur. Bəs ?necə olur ki, Əlinin (ə) üstünlüyünü e’tiraf edən bir şəxs xəlifə seçilir

Müsəlmanların xəlifəsi ən üstün rəhbər və gözəl komandan olmalıdır. Rəhbərin qəlbində acizlikdən, qorxudan əsər tapılmalıdır. Bəs bu baxımdan necə, Əbu-Bəkr və Ömər üstündür, yoxsa Əli (ə)? Ühüd, Xeybər, Hunəyn döyüşlərində Əbu-Bəkrdən və Ömərdən sorağ yox idi. Həzrət Əli (ə) düşmənin sel tək hücum çəkən qoşununun qarşısında tək-tənha dayanıb, qılıncından od yağdırardı. Əgər həzrət Əli (ə) olmasaydı, İslam qoşununun müharibələrdəki qələbəsindən danışmağa dəyməzdi. Xəndək döyüşündə Ömər israr etdi ki, Peyğəmbər (s) müşriklərlə sülh bağlasın. Ömər Əmr ibn Əbdüvədin məğlubedilməz qəhrəman olduğunu səbəb kimi göstərirdi. Əmrin şücaətindən qorxan Ömər müsəlmanların ruhiyyəsini süstləşdirirdi. Amma həzrət Əli (ə) nəinki Əbdüvəddən qorxmadı, hətta onu dünya ilə vidalaşmağa vadar etdi. Məgər Ömər özü Əlinin (ə) şücaətini e’tiraf

?etməmişdirmi

.Bəli, sünnə əhli bütün bu suallar qarşısında acizdir

## SÜNNƏ ƏHLİNƏ BİR NEÇƏ SÖZ

Biz söhbətimizin bu hissəsində möhtərəm sünni qardaşlarımızdan onların xilafətlə bağlı məsələlərdəki incəliklərə tərəfsiz yanaşmalarını istəyirik. Əgər bizim dediyimiz .sözlərdə yalan və iftira yoxdursa, onları təəssübsüz qəbul etmək lazımdır

Ey əziz qardaşlar! Şübhəsiz ki, hər bir insan öz e'tiqadına ehtiramla yanaşmalıdır. Amma bu da aşkar həqiqətdir ki, bütün e'tiqadlar həqiqi sayıla bilməz. Çoxları uşaqlıq dövründən gördüyü tərbiyə nəticəsində ata-babalarının dini ilə gedir və ömür boyu tutduqları yolun doğru olub-olmadığı barədə düşünmürlər. Hansı ki, hər bir insan danışdığı əqidənin həqiqətə uyğun olub-olmadığını şəxsən araşdırmalıdır. Təəssüb .ucbatından tutduğunu buraxmamaq insanın öz ziyanına tamamlanır

Siz deyirsiniz ki, Peyğəmbər (s) xəlifə tə'yin etməyib. Əgər doğrudan da Peyğəmbər (s) xəlifə tə'yin etməmişdisə, bəs nə üçün Əbu-Bəkr özündən sonra xəlifə tə'yin edirdi. Əbu-Bəkr özünü Peyğəmbər (s) xəlifəsi adlandırırdı. Əgər Peyğəmbər xəlifə tə'yin ?etməmişdisə, nə üçün Əbu-Bəkr belə bir məqama iddialı idi

Ömər özü Əbu-Bəkr tərəfindən tə'yin olunduğu halda, özündən sonra yenidən şura məsələsini ortaya atdı. Əgər məsələ şurada həll olunmalı idisə, nə üçün bütün xalq bu şurada təmsil olunmurdu? Ömər hələ şura başlamamışdan qabaq qərar çıxarmışdı ki, müxaliflər, azlıqda qalanlar öldürülsün. Belə bir göstərişə necə haqq qazandırmaq ?olar

Ötən söhbətlərdə sübuta yetirildi ki, imamət ilahi bir məqamdır. İmamı şura yolu ilə seçmək cinayətdir. Əgər doğrudan da bu istiqamətdə xalqa söz verilsəydi, şübhəsiz ki, Əli (ə) seçilərdi. Üçüncü xəlifədən sonra nisbətən azad mühitə düşmüş xalq Əlinin (ə) ?evinə üz tutmadımı

Həzrət Peyğəmbər ölümündən qabaq kağız-qələm istədi. Ömər isə onun bu istəyinə belə cavab verdi: «Vəsiyyətə ehtiyac yoxdur, Allahın kitabı bizə bəsdir». Əgər vəsiyyətə

özləri vəsiyyət etdilər? Əgər imamət məsələsinə, bu məqamın Allah tərəfindən tə'yin olunmasına inanmırsınızsa, heç olmaya ilk üç xəlifənin səhabələrdən fəzilətli .olmadığını e'tiraf edin

Sünni qardaşlarımız unutmasınlar ki, bizim bu kitabda gətirdiyimiz dəlillər əqli və məntiqi dəlillər idi. Bizim müxtəlif mövzularla bağlı söhbətlərimizdə əsas mənbələr sırasında sünni mənbələri də dayanırdı. Biz bütün üzr və bəhanələri kəsmək üçün ən məşhur sünni alimlərindən sitatlar göstərdik. Əlbəttə ki, bütün bu ixtilaflara !baxmayaraq, zahiri birliyi qorumaq zəruridir. Həzrət Əli (ə) də belə etmişdir

## HƏZRƏT ƏLİNİN (Ə) ÖVLADLARI VƏ SƏHABƏLƏRİ

Tarixçilər həzrət Əlinin (ə) övladlarının sayını müxtəlif rəqəmlərlə göstərmişlər. Bə'zi tarixçilərin bildirdiyinə görə həzrətin on səkkiz oğlu və on səkkiz qızı olmuşdur. Şeyx Müfid və Əllamə Təbərsi həzrətin iyirmi səkkiz övladı olduğunu zikr edirlər. Həzrətin övladlarının adı ilə tanış olaq: Həsən, Hüseyn, Zeynəbi-Kubra, Zeynəbi-Suğra (Ümmü-Gülsüm), Məhəmməd Hənəfiyyə (anası Xəvlə), Ömər və Rüqəyyə (Ümmü-Həbibədən olan əkizlər), Abbas, Cə'fər, Osman, Abdullah (Ümmül-bənin), Yəhya (anası Əsma), Ümmül-Həsən və Rəmələ (anaları Ümmü-Səid), Məhəmməd-Əsğər (anası Leyla), Nəfisə, Zeynəbi-Suğra, Rüqəyyeyi-Suğra, Ümmü-Hani, Ümmü-Kiram, Cəmanə, .İmamə, Ümmü-Sələmə, Məymunə, Xədicə, Fatimə

Həzrət Əlinin (ə) yaxın səhabələri ilə tanış olaq: «Malik Əştər Nəxəi, Üvəys Qərəni, Məhəmməd ibn Əbu-Bəkr, Meysəm Təmmar, Kumeyl ibn Ziyad, Abdullah ibn Abbas, Qənbər, Ruşəyd Hicri, Səhl ibn Hunəyf, Sə'səə ibn Suhan, Zeyd ibn Suhan, Əmmar .Yasər, Hucr ibn Ədi, Qeys ibn Sə'd, Ədi ibn Hatəm və başqaları

## ALTINCI HİSSƏ

### HƏZRƏT ƏLİNİN (Ə) BUYURUQLARI

Əziz oxucuların nəzərinə çatdırılan buyuruqlar «Nəhcül-bəlağə», «Qurərul-hikəm» və digər mənbələrdən götürülmüşdür.

۱. «Tövhid (əqidəsi) Allahı təsəvvürə gətirməmək (O təsəvvürə sığmaz), ədalət Onu ittiham etməməkdir (Onu ləyaqətsiz işlərdən pak bilmək)».

۲. «Əlbəttə, hər bir ne’mətdə Allahın haqqı var (hər ne’mətə görə ona şükür etmək lazımdır). Hər kəs onu (şükrü) yerinə yetirsə, Allah ona olan ne’mətini artırar. Bu məsələdə diqqətsizlik göstərənin ne’məti zavala uğradılar».

۳. «Düşmənə qalib gəldiyin vaxt qələbənə şükr olaraq onu bağışla».

۴. «Çarəsizin dadına çatmaq, qəmginin qəmini aradan qaldırmaq böyük günahların kəffarələrindən sayılır».

۵. «Ey Adəm övladı, Allah sənə ardbaard ne’mətlər verdiyi vaxt Ona qarşı itaətsizlik göstərirsənsə, onun əzabından qorx».

۶. «Ən üstün zahidlik onu xalqdan gizləməkdir».

۷. «Aqilin dili qəlbinin arxında, axmağın qəlbi dilinin arxasındadır».

۸. «Allah üçün səni pərişan edən günah səni lovğalandıran yaxşı işdən üstündür».

۹. «Qələbəyə ehtiyat və uzaqgörənliklə çatmaq olar. Ehtiyat düşüncə qüvvəsini işə salmaqla, düşüncə möhkəm sirr saxlamaqla əldə olunur».

۱۰. «Cəzalandırmağa gücü çatan kəsin bağışlaması daha yaxşıdır».

۱۱. «Ağıl kimi var, cəhalət kimi yoxsulluq, ədəb kimi miras, məşvərət kimi arxa yoxdur».

۱۲. «Dünya adamları, yatmış halda aparılan karvan əhlinə bənzəyirlər».

۱۳. «Ağıl artarsa, danışıq qısalar».

۱۴. «İnsan hər nəfəs çəkməklə ölümə doğru bir addım atır».

۱۵. «İki iş arasında necə də böyük fərq var: biri ləzzəti gedib əziyyəti qalan əməl, o biri əziyyəti gedib mükafatı qalan əməl».

səh:۱۹۷

۱۶. «Üç məqamda dostunu himayə etməyən kəs dost deyil: Dostu çətinliyə düşdüyü zaman, dostu yanında olmayan zaman, dostunun ölümündən sonra».

۱۷. «Sədəqə verməklə ruzini (ərşdən) aşağı endirin. Verdiyinin əvəzini alacağına əmin olan kəs bağışlamaqda səxavət göstərir».

۱۸. «İnsana ona üz vermiş müsibət qədər səbr verilir. Çətinliyə düşəndə dizinə döyən insan savabı əldən verir».

۱۹. «Kişi dilinin altında gizlənmişdir».

۲۰. «Günahın tərki tövbədən daha asandır».

۲۱. «Dünyanın acılığı axirətin şirinliyi, dünyanın şirinliyi axirətin acılığıdır».

۲۲. «Öyüd-nəsihət necə də çox, ibrət götürən isə necə də azdır».

۲۳. «Miskin və ehtiyaclı şəxs Allahın elçisidir. Onu rədd edən Allahı rədd etmişdir. Ona bir şey bağışlayan Allaha bağışlamışdır».

۲۴. «Xalqın əlində olana e’tinasızlıq ən böyük var dövlətdir».

۲۵. «Ən böyük günah odur ki, insan onu kiçik saysın».

۲۶. «Batinini islah edən şəxsin zahirini Allah islah edər. Axirət üçün iş görənin dünyasını Allah tə’min edər».

۲۷. «Ləzzətlərin ötüb keçəcəyini, onların cəzasının isə qalacağını yadda saxlayın».

۲۸. «Kiçik müsibəti böyük sayan şəxsi Allah böyük müsibətə düçar edər».

۲۹. «Nadan yalnız ifrata və təfritə varanda gözə çarpar».

۳۰. «Ən böyük dərd dünyaya heyranlıqdır».

۳۱. «Uzun-uzadı arzu ölümü yaxınlaşdırar və insanı öz məqsədindən uzaq salar».

۳۲. «Allahın əzabından qorxmaq pərhizkarların sifətidir».

۳۳. «Mö’min günahlarından qorxur, bəlalardan ehtiyat edir, Allahın mərhəmətinə ümidvar olur».

۳۴. «Zahidlik arzuları məhdudlaşdırmaq, əməlləri xalis etməkdir».

۳۵. «Elm və bilik var-dövlətdən üstündür. Elm səni saxlayır, var-dövləti isə sən saxlayırsan».

۳۶. «Səbr iki növdür: biri bəlalar, o biri isə günahlar qarşısında səbr».

۳۷. «Allah qorxusundan ağlamaq qəlbi münəvvər edir və günaha qayıdış yolunu bağlayır».

səh:۱۹۸

۳۸. «Rahatlıq üç şeydədir: Uyğun qadın, yaxşı rəftarlı övlad və müvafiq dost».

۳۹. «Dünyada Allahdan qorxan şəxs axirətdə Allah qorxusundan azad olar».

۴۰. «Sənə pislik edənə yaxşılıq et, sənə zülm edəndən keç».

۴۱. «Əmanəti onu sənə tapşırana qaytar. Sənə xəyanət edənə isə xəyanət etmə».

۴۲. «Gələcəkdəkilər sizdən ibrət götürməmiş siz keçmişdəkilərdən ibrət götürün».

۴۳. «Bədənləriniz dünyanı tərk etməmiş qəlbləriniz dünyanı tərk etsin. Siz dünyada imtahana çəkilirsiniz və dünya üçün yaradılmamısınız».

۴۴. «Axirəti puça çıxarıb, dünyanı abad edən bütün işlərdən çəkin».

۴۵. «Fasiqlər və günahkarlardan, Allaha itaətsizlik yolunda çalışanlardan həzər qıl».

۴۶. «Dünyadan qorx. O, şeytanın tələsi və imanın qənimidir».

۴۷. «Söz gəzdirməkdən çəkin. O, qəlblərdə kin toxumu səpər. İnsanı Allahdan və xalqdan uzaqlaşdırar».

۴۸. «Sizin üçün ən çox qorxduğum şey nəfs istəklərinə itaətiniz və arzularınızın uzunluğudur».

۴۹. «Adamların ən güclüsü nəfsinə qalib gələn kəsdir».

۵۰. «Ölümü az xatırlayan insanın arzuları başqalarından çox olar».

۵۱. «İnsanların ən axmağı özünü ağıllı sayan kəsdir».

۵۲. «İnsanların ən düşüncəlisi öz eybini görüb, başqalarında eyb axtarmayan kəsdir».

۵۳. «Allah-təala dünyanı həm sevdiyi, həm də sevmədiyi kəsə əta edər. Dini isə yalnız sevdiklərinə verər».

۵۴. «Mö’minin üç zinəti var: «Allahdan qorxu, doğru danışıq və əmanəti sahibinə qaytarmaq».

۵۵. «Yalan danışmaqdan çəkinin. O, imanı puça çıxarır».

۵۶. «Qələbənin şirinliyi səbrin acılığını aradan qaldırar».

۵۷. «Dini tərk etməklə dünya dalınca qaçmayın. Dünyanı tərk etməklə axirət qazanın».

səh:۱۹۹

۵۸. «Sizinlə hesab çəkilməmiş özünüz özünüzlə hesab çəkin».

۵۹. «Allah zikri hər bir pəhrizkarın sevinci, hər bir yəqin sahibinin ləzzətidir».

۶۰. «Nəfsi azğın istəklərdən qorumaq böyük cihaddır».

۶۱. «Alimin büdrəməsi gəminin qırılması kimidir. O, özü qərq olanda başqaları da qərq olur».

۶۲. «Mö’mini Allaha itaət sevindirir, günah isə pərişan edir».

۶۳. «İmanını şəkk-şübhədən qoru. Çünki duz balı çürütdüyü tək, şəkk-şübhə də imanı puça çıxarır».

۶۴. «Səni ucaldan sükut səni alçaldan danışıqdan üstündür».

۶۵. «Allaha xatir əməlini, elmini, sevgisini, nifrətini, alışını, verişini, danışığını, sükutunu paka çıxaranın xoş halına».

۶۶. «Namazda qunut və səcdələri uzatmaq insanı cəhənnəm əzabından xilas edər».

۶۷. «Əbədi axirəti qoyub dünya həyatında razılıq axtaran insan özünə zülm etmişdir».

۶۸. «Gözünün qarşısında insanlar öldüyü halda ölümü yaddan çıxaran kəsə təəccüb edirəm!»

səh:۲۰۰

## HƏZRƏT ƏLİNİN (Ə) NƏZM ƏSƏRLƏRİNDƏN

,Ya Rəbb həmdü-səna layiq bir sənə

Asanda, çətində qaçdım kölgənə

,Əgər çətinliyə, müşkülə düşsən

.Qarşıda açılış olası hökmən

,Ümidini haqdan üzmə heç zaman

!Ümidsizlik küfrə bərabər, insan

,Altmış illik ömrün yarısı yuxu

.Qalan yarısının yarısı qəflət

,Üçdə bir xəyal, ruzi qayğısı

.Demək, ömrə sevgi aşkar cəhalət

?Nəfsi tox insandan ucası harda

.Bir haqqı düşünər qalanda darda

Dünyaya «get» deyib, üz tutan dinə

Rahatlıq libası geymiş əyninə

,Kiçik günahlara çalmasan düyün

.Artıb böyük günah olası bir gün

səh:۲۰۱

## SON SÖZ

Müəllif müttəqilər mövlası Əmirəl-mö’minin Əlidən (ə) min-min üzr diləyib, kitabı başa çatdırır. Həzrəti olduğu kimi təqdim etməkdə acizliyimi bir daha e’tiraf edirəm. .Həzrətin (ə) bu üzrü öz böyüklüyü ilə qəbul edəcəyinə ümidvaram

Fəzlüllah Kompani

**MÜNDƏRİCAT**

